AZƏRBAYCAN ELMLƏR AKADEMİYASI
NƏSİMİ adına DİLÇİLİK İNSTİTUTU

# "KİTABİ-DƏDƏ QORQUD" DİLİNİN İZAHLI LÜĞƏTİ

BAKI - ELM - 1999

*"Azərbaycan xalqının mühüm tarix və mədəniyyət qaynaqlarından biri olan "Kitabi-Dədə Qorqud" dastanının yaranmasından 1300 il keçir. Oğuz türklərinin tarixini əks etdirən "Kitabi-Dədə Qorqud" yüksək bəşəri ideallar tərənnümçüsü kimi dünya xalqlarının mə'nəvi sərvətlər xəzinəsinə daxil olmuşdur."*

**("Kitabi-Dədə Qorqud" dastanının 1300 illiyi haqqında Azərbaycan Respublikası Prezidenti cənab Heydər Əliyevin 20 aprel 1997-ci il tarixli Fərmanından)**

umud oğlu



*Redaktoru:*
**prof. AĞAMUSA AXUNDOV**

**"Kitabi-Dədə Qorqud" dilinin izahlı lüğəti.** - Bakı: Elm, 1999 - 204 s.

ISBN 5-8066 - 1083 - 7

Oxuculara təqdim edilən bu lüğət abidənin söz xəzinəsi barəsində ilk leksikoqrafik əsərdir. Lüğətin yazılmasından məqsəd işlənmə intensivliyindən və mənşəyindən asılı olmayaraq, bütün sözləri qeydə almaq, sözlərin dastanın dilindəki semantik və qrammatik mə'nalarını əyani göstərməkdir. Kitabda sabit söz birləşmələri, sözlərin məcazi mə'naları da verilmişdir. Lüğətdə 2400-ə yaxın sözün izahı verilir.

$K \frac{4602030000-873}{655(07)-99}$ Sifarişlə



# ÖN SÖZ

Oxuculara təqdim olunan "Kitabi-Dədə Qorqud" dilinin izahlı lüğəti qədim türk dastanına həsr olunmuş çeşidli tədqiqatlar içərisində ilk leksikoqrafik əsərdir. Məşhur türk qorqudşünası Orxan Şaiq Gökyayın öz "Dedem Korkudun kitabı"na (İstanbul, 1973) əlavə etdiyi lüğət nə qədər mükəmməl olsa da, leksikoqrafik əsərdən daha çox tarixi-müqayisəli araşdırma səciyyəsi daşıyır. Digər görkəmli qorqudşünas alim Həmid Araslının "Kitabi-Dədə Qorqud"unda (Bakı, 1962) verilmiş lüğət isə daha çox geniş oxucu kütləsinə mə'nası aydın olmayan sözləri əhatə edir və cəmi 370 sözdən ibarətdir.

Lüğətin sözlüyü Azərbaycanda nəşr edilmiş Dədə Qorqud dastanlarının hələlik sonuncusu və məncə, ən mükəmməli olan "Kitabi-Dədə Qorqud" (Bakı, 1988. Tərtib, transkripsiya, sadələşdirilmiş variant və müqəddimə professorlar Fərhad Zeynalov və Samət Əlizadənindir) əsasında hazırlanmış və misallar da həmin kitabdakı mətndən seçilmişdir. Lüğət abidənin söz xəzinəsi barədə elmi-tədqiqat işi olmaqla bərabər, oxuculara əsərin dili ilə bağlı konkret leksik mə'lumat verən mənbə kimi nəzərdə tutulmuşdur.

Lüğətin yazılmasından məqsəd eyni zamanda işlənmə intensivliyindən və mənşəyindən asılı olmayaraq, bütün sözləri qeydə almaq, sözlərin dastanın dilindəki semantik və qrammatik mə'nalarını nümayiş etdirməkdir. Lüğətdə sabit söz birləşmələri, sözlərin məcazi mə'naları da verilmişdir.

Lüğətdə 2400-ə yaxın (2392) sözün izahı verilir.

Lüğəti Azərbaycan Elmlər Akademiyası Nəsimi adına Dilçilik İnstitutunun Azərbaycan dili tarixi şö'bəsinin əməkdaşları: professor Sevil Mehdiyeva (*e,z,l,c,ş.*), professor Rəhilə Məhərrəmova (*t,x,*), filologiya elmləri doktorları Əvəz Sadıqov (*a,v,s,ü*), Afina Əlizadə (*y,u,ç*), filologiya elmləri namizədləri F.L.Parənci (*q,ğ,d,m,p,f*), Vahid Adilov (*b,ə*), Fazil Əhmədov

(*k,g*), Məhərrəm Əhmədov (*n*), Jalə Qəribova (*r,i,h,j*), Reyhan Mədətova (*o, ö* hərfləri) tərtib etmişlər.

Gözə dəyən nöqsanları İnstituta (*H.Cavid prospekti, 31, V mərtəbə, Dilçilik İnstitutu, tel.: 39-35-71*) çatdıranlara təşəkkür və minnətdarlığımızı əvvəlcədən bildiririk.

**REDAKTOR**



# LÜĞƏTİN QURULUŞU

1. Lüğətdə baş sözlər müasir Azərbaycan əlifbası ardıcıllığı ilə verilir.

2. Baş sözlərin əvvəlcə qrammatik, sonra isə mənşəcə mənsubiyyəti göstərilir.

3. Sözün qrammatik mənsubiyyəti müvafiq ixtisarlarla göstərilir: isim-is., sifət-sif., say-s., əvəzlik -əv.,fe'l-f., zərf-z.,köməkçi nitq hissələri: qoşma-qoş., bağlayıcı-bağ.,ədat-əd., toponim-top., antroponim-antr., zoonim-zoon., vokativ-vok.;

4. Sözün mənşəyi ərəb sözləri qarşısında ə., fars sözləri isə fars kimi şərti ixtisarlarla, komponentlərdən biri fars, biri ərəb dilinə mənsub olan mürəkkəb sözlərin mənşəyi ə. fars şəklində işarələnir;

5. Bir neçə yazılış forması olan sözlər arasında paralel (//) işarəsi qoyulur;

6. Söz əvvəlində fonetik variantın abidədə olan variantı verilir və həmin sözün müasir variantına baxılır:

tağ//dax//dağ

7. Baş söz kimi verilmiş ərəb və fars sözünün müasir Azərbaycan dilində sinonim variantı olduqda mə'na həmin sinonimlə verilir;

8. Lüğətdə omonimlər roma rəqəmləri ilə ayrı-ayrı verilir: yüz I is. çöhrə, üz; yüz II s. yüz (100).

9. Baş söz çoxmə'nalıdırsa, onun mə'na çalarları ərəb rəqəmləri ilə baş sözün yuvasında verilir;

10. Baş sözün məcazi mə'nada işlənməsi məc. işarəsi ilə göstərilir;

11. Fars dili izafətləri birinci sözün maddəsində verilir;

12. Lüğətdə *mən, sən, o* şəxs əvəzliklərinin $N_1$ -sağırnun ilə ifadə olunan qədim yönlük hal forması ba- $N_1$a, sa$N_1$a/ /sağa, ona, ana/ baş söz kimi təqdim olunur, qarşısında izahı və müasir yazılış forması verilir;

13. Lüğətdə fe'llər məsdər şəklində verilir;

14. Baş söz sabit söz birləşməsi daxilindədirsə, baş sözdən sonra iki nöqtə qoyulur, sonra sabit birləşmə verilir. Namaz is.ə; namaz qılmaq.

15. Lüğətdə fe'li birləşmələr ◇ romb, ismi birləşmələr □ işarəsi ilə verilir.

# LÜĞƏT

## A

A n. Çıqsun bənim kor gözüm, *a* Dirsə xan, yaman səkrir (38); *A* baba, eşidürəm (71).

ABDƏST is.fars. ◇ Abdəst almaq - namazdan qabaq əl-üzünü yuma, dəstəmaz. Ari sudan *abdəst aldılar* (50); Qalın Oğuz bəgləri arı sudan *abdəst aldılar* (66).

AV is.ov. Oğlan sağdır-əsəndir, *avdadır* (38). ◇ Av avlamaq - ov etmək. Sən var ikən av *avladı*, quş quşladı (37). ava binmək - ova getmək üçün atlara minib yola çıxmaq. Bəglər həb ava bindi (54); "Mərə, sabah şahinləri al, xəlvətcə *ava binəlim!*" - dedi (116); ava çığmaq - ova çıxmaq. Ala tağa ala ləşkər *ava çıqdı* (42). Baybörə bəgin oğlı atlandı, *ava çıqdı* (53).

AVAZ is.fars. Səs, səda. *Avazım* gödəlmədin, ünim boğulmadın bir atdır, əlümə girdi, ilətim, saqlıyayım, - dedi (60); *Avazı* qaba köpəklərə qoğa salan! (45). ◇ avaz vermək - səs vermək. Aydır: "Qanğınuza yapışurlarsa, "Qazan bəgün xatunı qanğınızdır, qırq yerdən *avaz* verəsiz", - dedi (46); avaz gəlmək - səs gəlmək. Qırq yerdən *avaz* gəldi (46).

AVANMAQ f.Sınmaq. Dürtüşərkən ala göndərin *avanmasun*! (51).

AVIC is. Ovuc. *Avcına sığmayan* əlüklü oxdı (100).

AVLAMAQ f. Ovlamaq. Arqubeli Ala tağı *avlıyuban* aşmağım yoq (107).

AVLANMAQ f.qay.n. Ovlanmaq. Sən gedəli, xanım, arqurı yatan Ala tağlarun *avlanmamışdır* (105).

AVSAL sif. ◇ Avsal olmaq - övsəl olmaq, xəstələnmək. *Avsal* olmış tana kibi ağzının suyı aqdı (87).

AVÇI is. Ovçu. Mərə dadı, mən *avçı* degiləm (54); *Avçılardan* ayru dilbəndi boğazına keçdi (105).

AĞ sif. Ağ. Bərü gəlgil, *aq* südin əmdigim, qadınum ana! (39).

AQ-BAN//AĞ-BAN sif. Dik. Babamın *ağ-ban* evindən çıqardım (93); Gögdən ildırım *ağ-ban* evim üzərinə şaqır gördüm (44).

AQAN fe'li sif. Axan. *Ağan* turı sulardan xəbər keçə... (37); Qamən *aqan* görkli suyın qurumasın! (41).

AQ QAYA is. Yer adı. *Aq qayanın* qaplanının erkəgində bir köküm var. Ortac qırda sizin keyiklərinüz turğurmıya (118).

AQIN is. Çapqınçılıq. Basat şimdi *aqından* gəldi (99); □ Aqın çapmaq - çapqınçılığa getmək. Qanturalı aydır: "Baba, yelisi qara Qazlıq atuma əyər salayım, qanlu kafər elinə *aqın* çapayım (86); aqın diləmək - izn istəmək. Bayındır xandan *aqın* dilədi (94); aqın vermək - izn vermək. *Aqın* verdi (100).

AQINDILI sif. Coşub-daşan. *Aqındılı* görklüsuyını keçməgə gəlmişəm (56); *Aqındılı* görklü suyımın taşqunı qardaş! (100).

AQINÇI is. Döyüşçü. *Aqınçılar* kafərin elin-günün urub qızın-gəlinin əsir etdilər (109); *Aqınçı* dərildi. Üç yüz say cidalu yigit bunın yanına cəm' oldı (110).

AQITMAQ f. Axıtmaq. Qamın aqan yügrək sudan bir oğul *aqıtdınsa*, degil mana! (38).

AQLI sif. Ağlı. *Aqlı*, qaralı seçilən cağda (37).

AQMAQ f. Axmaq. Nə Qazlıq tağı *aqar* sənin suların? *Aqar* kibi aqmaz olsun! (39); *Aqub* gedən arı sudan abdəst aldı (76).

AQSƏQA is. Qala adı. Məgər Başı açuq Tatyan qəl'əsindən, *Aqsəqa* qəl'əsindən kafərin casusı vardı (69).

AQ HASAR is. Qala adı. *Ağ hasar* qəl'əsinin bürcin yıqdım (118).

AQÇA is. Pul. Ağır xəzinəsini, bol *aqçasını* yağmaladılar (42); Kafər dəxi düşübən bir yerdə *aqça* ülüşməkdəydi (53).

AĞ sif. 1) Ağ. *Ağ* südin toya əmzirsə, ana görkli (33); Bir yerdə *ağ* otağ, bir yerdə qızıl otağ, bir yerdə qara otağ qurdırmışdı (34); 2) Hündür. Bayındır xanın *ağ* meydanında bu oğlan cəng etmişdür (36); *Ağ* meydanın ortasında baxdı-turdı (36); □ ağ alınlu. *Ağ alınlu* Bayındırın divanına varmağım yoq (107); ağ birçəklü. *Ağ birçəklü* anan yeri behişt olsun! (41); ağ yeləklü - ağ lələkli. *Ağ yeləklü* ötgün oxın mana vergil (107); *Ağ yeləklü* ötkün oxlar atışaydıq (108); ağ saqallu. *Ağ saqallu* baban yeri uçmağ olsun! (41); *Ağ saqallu* qocanın ağzın sögdi (37);

Ağ saz - böyük meşə. *Ağ sazın* aslanında bir kökim var (118); Ağ sunqur - quş adı. *Ağ sunqur* quşı erkəgində bir kökim var, Ala ördək, qara qazun uçurmıya (119); Ağ-boz - ağ-boz (rəng) Çaparkən *ağ-boz* atın büdrəməsün! (41); *Ağ-boz* atlar çapdırır alpanlar gördüm (95).

AĞ MƏLİK ÇEŞMƏ is. Şəxs adı. *Ağ Məlik Çeşmə* qızına nigah edən... İlək qoca oğlı Alb Ərən çapar yetdi (50).

AĞA is. Ağa. Qaragünə oğlı Qarabudağ aydır: "*Ağam* Qazan, məsləhətdir" (42); *Ağanuzın* ətməgi sizə halal olsun! (60).

AĞAYIL is. Yaylaq. *Ağayıldan* tümən qoyun gedərsə, mənim gedər (40); *Ağayılda* ağca qoyunım sana şülən olsun! (66).

AĞARMAQ f. Ağarmaq. Saqalım *ağarduğın* nə bəgənməzsən? (80).

AĞAC is.1) Ağac. Gəl, bu *ağac* dibində enəlüm, yeyəlim, - dedi (46); *Ağac* gəmiləri oynadan su! (44). 2) Məsafə ölçüsü. Kafərlər yedi *ağac* yer qarşu gəldilər (87).

AĞARMAQ f. Ağarmaq. Dölimindən *ağarsa*, baba görkli (33).

AĞIZ is. 1) Ağız. Dəli Qarcar *ağzın* köpükləndirdi (55); *Ağzın* qurısun, çoban! (45): ◇ ağız açmaq. *Ağız açub* ögər olsam, üstimizdə Tənri görkli! (32); □ ağzı dualı. Ola kim, bir *ağzı dualının* alqışilə Tənri bizə bir yetman əyal verə,- dedi (35); Ağız-dil. *Ağız dildən* bir qaç kəlmə xəbər mana! (39); 2) Sərhəd. Toğuz tümən Gürcüstan *ağzına* varub qondı (104); Ağam Qazan, sası dinlü Gürcüstan *ağzında* oturarsan (42).

AĞIZLI sif. Özündən deyən. *Ağızlılar* bu suyımdan içdiki yoq (56).

AĞIL is. Qoyun saxlanan yer. *Ağılın* qapusını bərkitdi (43); Arqasını urub, bərk *ağılın* ardın sökən! (45).

AĞILMAĞ is. Uca taxt. Sən gedəli *ağılmağım* gökdə ikən yerə endi (75).

AĞIR sif. 1) Böyük çəkisi olan. *Ağır* yüklər zəlimin qatır bilür (32); Mancılığı *ağır* taşdan ğızıldayub qatı enən (90); 2) məc. Qiymətli. *Ağır* xəzinə, bol ləşkər alayın (38); *Ağır* xəzinəsini, bol aqçasını yağmaladılar (42); 3) məc. Zəngin. *Ağır* qonaqlıq eylədilər (55); 4) məc. Əziz, şad. Məgər ol gün kafərlərin *ağır* günləriydi. Hər biri yeməkdə-içməkdə idi (58); ◇ ağırlıq etmək - hörmət qoymaq. Taş Oğuz bəglərinə *ağırlıq edüb* toyladı (124); □ ağır-ulu - zəngin. *Ağır-ulu* divanım sürülmədi (75).

AĞIRDMAQ f. Ucaltmaq. Anlar dəxi çəri dərüb, borı *ağırdan* Qazana qarşu gəldilər (126); Borı *ağırdıb* köçdilər. Yola girdilər (119).

AĞIRLAMAQ f.Əzizləmək... Ol anı yedirər-içirər, *ağırlar*-əzizlər, göndərər (33).

AĞLAMAQ f. Ağlamaq. Qara başım qurban olsun bu gün sana! -dedi, zarılıq eylədi, *ağladı* (38); Mənim üçün *ağlamıyasan*!(47); □ ağlar-bozlar - ağlayıb inləmək. "Qardaş Beyrək" - deyü *ağlar-bozlar* (60); ağlayıbanı-sıqlayıbanı - ağlayıb sızlamaq. *Ağlayıbanı-sıqlayıbanı* evinə gəldi (57).

AĞLAR fe'li sif. Ağlayan. Yedi qız qardaşın yedi yol ayırdında *ağlar* gördüm, Bamsı! (59).

AĞLAĞAN is. Yer adı. Kafər sərhəddinə Cızıqlara, *Ağlağana*, Göğçə tağa aluban çıqayın (69).

AĞLATMAQ f.icb.n. Ağlamağa məcbur etmək. "Baba" deyü *ağlatdılar*, "ana" deyü bozlatdılar (71); Qara gözlü qız qartaşumı *ağlatmağıl* (74).

AĞLAŞMAQ f. müşt.n. Bir yerdə ağlamaq. Həp anda olan bəglər *ağlaşdılar* (125); Bunı eşidicək qırq yigit *ağlaşdılar* (88); □ ağlaşmaq-bögürişmək - ağlaşmaq-hönkürmək. Muradına-məqsudına irməyən yalnuz qardaş! - deyib *ağlaşdılar-bögürişdilər* (58).

AĞLI sif. Ağlı. *Ağlı*, qaralı seçən çağda (34).

AĞMAQ f. Qalxmaq. Şahin pərvaza *ağdı* (116).

AĞRILMAQ f. Qaldırılmaq. Altun-tuc borılar *ağrıldı* (115).

AĞRIMAQ f. Ağrımaq. Yata-yata yanımız *ağrıdı* (42).

AĞCA sif. Ağappaq. *Ağca* qarlar yağmış, dizə yetmiş (65); Sarı yılan soqmadın *ağca* tənim qalqub şişər (38); Mərə, saqalcığı *ağca* qoca (80); □ ağca tozlu - ağappaq tozlu. *Ağca tozlu* qatı yayım zarı-zarı inlər (108); Ağca Qala - Yer adı. *Ağca Qala* Sürməlüyə gəlüb, Qazan qırq otaq dikdirdi (78).

AD is. Ad. Ata *adın* yüridəndə dövlətlü oğul yeg (32); ◇ ad qazanmaq - ad çıxarmaq. Sağım ələ baqduğımda Qartaşım Qaragünəyi gördim, - Baş kəsübdir, qan dökipdir, Çöndi alubdır, *ad qazanubdır* (69); ad qoymaq - adlandırmaq. Dədəm Qorqut gəlsün, bu oğlana *ad qosun* (36); Dədəm Qorqud gəldi, oğ-

lana *ad qodı* (54); adı çıqmaq - şöhrət qazanmaq, məşhur olmaq. Ər malına qıymayınca *adı çıqmaz* (31); □ adı bəllü - məşhur, hamının tanıdığı. İç Oğuzda, Taş Oğuzda *adı bəllü*. Aruz oğlı xanım Basat, mana mədəd! - dedi (100).

ADAĞLU//ADAXLU sif. Adaxlı. *Adağlusından* ərgənlik bir qırmızı qaftan gəldi (57); Baqdı-gördi bu otağ Banıçiçək otağıymış ki, Beyrəgin beşikkərtmə nişanlısı, *adaxlusıydı* (54).

ADAM is. ər. Adam; Ölən *adam* dirilməz, çıxan can gerü gəlməz (31); *Adam* içməyən acı sular sızınca, sızmasa, yeg (32); ◇ adam almaq - adam əsir götürmək. Yol kəsdi, *adam aldı*, böyük hərami oldı (99); adam salmaq - adam göndərmək. *Adam saldı*, əmmisini oxudı, gəldi (119); Təkur *adam saldı*, "Kim idügin bilün!" - dedi (116).

ADƏM is.ər. Peyğəmbər adı. *Adəmə* sən tac urdun, Şeytana lə'nət qıldın (96); □ adəmilər əvrəni - igid. *Adəmilər əvrəni* Dəli Domrul əlin əlinə çaldı, qas-qas güldi (80).

ADLU sif. Adı olan. Beyrək *adlu* bir yigidə bulışdınmı? (61).

AZAD sif. fars. Sərbəst: ◇ azad eləmək //eyləmək - xilas etmək, qurtarmaq. Qırq baş qul, qırq qırnaq oğlı Uruz başına *azad elədi* (50); Qırq evli qulla qırq cariyə oğlı başına çevirdi, *azad eylədi* (78); azad olmaq - azadlıq əldə etmək, sərbəst olmaq. Anun canı *azad olsun*! -dedi (81).

AZĞUN sif. Azmış, yolunu itirmiş. İtüm ilə bir yalaqda yundum içən *azğun* kafər (43); □ azğın dinlü - pozğun dinli. *Azğun dinlü* kafərlərə bir oğul tutdırdınsa, degil mana (73); *Azğun dinlü* kafər bunaldı, oxa girdi (71).

AZMAQ f. 1) Azmaq, yolu itirmək. Qarannu dün içində yol *azsan*, umun nədir? (102); *Azıb* gələn qəzayı tənri savsın, xanım, hey! (32); 2) məc. Doğru yoldan çıxmaq, yanılmaq, sapmaq; Ay əməl *azmış*, fe'li dönmüş, qadir allah ağ alnına qada yazmış! (56); Əməlinmi *azdı*? Fe'linmi *azdı*? (56).

AZNAUR sif. Gürcü. Cənab, əsilzadə, ağa. Şökli Məlik aydır: "Mərə, *aznaur*, nə heyfimiz qaldı?" (43).

AZUĞ is. Azuqə. Yedi günlik *azuğla* çıqayın (69).

AY I is. Yer kürəsinin peyki. *Aydan* arı, gündən görkli qız qardaşın Banıçiçəgi Bamsı Beyrəgə diləməgə gəlmişəm! - dedi (56).



AY II is. İlin bölündüyü on iki hissədən hər biri. Toquz *ay* tar qarnımda götürdügim oğul! (82); Bir *ay* baqsun, bir *ayda* varmazsam, iki *ay* baqsun! (75).

AY III vok.söz. Görərmisin, *ay* oğul, nələr oldı?! (40); Babası aydır: "*Ay* oğul, Banıçiçəgin bir dəli qartaşı vardır, adına Dəli Qarçar deyirlər (55).

AYA I is. Yiyə. Qonur atın *ayası*! Xan Uruzın babası, Xanım Qazan, ünim anla, sözüm dinlə! (63).

AYA II is. Sapanın gözü. Qoyun diməz, keçi diməz, sapanın *ayasına* qor atar, kafəri yıqar (44); Ərənlər əvrəni Qaraquc çoban sapanın *ayasına* taş qodı, atdı (43).

AYA SOFYA. Kilsə adı. Yol üzərində kafərin *Aya Sofyası* vardı (119).

AYAQ I is. Ayaq, bədən üzvü. *Ayağının* sınduğını kimsəyə deməddi (106); Buğa *ayağ* üstinə turamadı, düşdi (36); ◇ ayağa düşmək-yalvarmaq. Beyrəgin *ayağına düşdilər* (66); Qazanın *ayağına düşdilər*, suçların dilədilər, əlin öpdilər (126).

AYAQ II is. Qədəh, badə. Altun *ayaq* sürahilər düzülmüşdi (42); Altun *ayağı* əlindən yerə çaldı (53).

AYAQLILAR sif. Ayağı olanlar. *Ayaqlılar* buraya gəldigi yoq (56).

AYĞIR is. Döllük erkək at. Təpəl-qaşğa *ayğırına* Tondaz bindi (42); Bayböränin oğlıyçun bir dəniz qulunı boz *ayğır* aldılar (52-53).

AYĞIRLIQ sif. Döllük erkək atı olan. Bunun adı Boz *ayğırlıq* Bamsı Beyrək olsun! (54).

AYĞIRGÖZLÜ is. Çay adı. Kafərləri it ardına burağıb xorlıyan, eldən çıqub *Ayğırgözlü* suyından at yüzdürən, əlli yeddi qəl'ənin kəlidin alan, Ağ Məlik Çeşmə qızına nigah edən Sufi Sandal Məlikə qan qusdıran, qırq cübbə bürünüb otuz yeddi qəl'ə bəyinin məhbub qızlarını çalub bir-bir boynın qucan, yüzində-todağında öpən İlək qoca oğlı Alb Ərən çapar yetdi (50).

AYD is. Ayıtmaq fe'lindən. Şayiə. Ulu-kiçi qalmıya, söz *aydına*, Qarı-qoca qalmıya - qu *aydına* (89); ◇ aydı vermək - demək, danışmaq. Ğazi ərənlər başına nə gəldigin *aydı* verdi (103).

AYDIN is. İşıq. Görər gözüm aydını oğul! Tutar belüm qüvvəti oğul! (66); Qarannulıca gözlərim *aydını* oğul! (72).

AYİŞƏ is. ər. Şəxs adı. *Ayişə* ilə Fatimənin nigahı su! (44); Ol *Ayişə*, Fatimə soyıdır, xanım (33).

AYIL is. Aul. Qara *ayılum* qoyunını yüklü qodum, Qoçmıdır, qoyunmıdır, anı bilsəm (97); Ağ *ayıldan* tümən qoyun vergil (36).

AYILLU sif. Aullu. Qara *ayıllu* qoyunını yüklü qodun, qoç oldı! (97).

AYIRD is. Ayırıcı. Varayın anı anası yanından alayın, qılıcla paralıyayın, altı bölük edəyin, altı yolın *ayırdında* bırağayın (72); Yedi qız qardaşın yedi yol *ayırdında* ağlar gördüm, Bamsı! (59).

AYIRMAQ f. Ayırmaq. Axır vəqtində arı imandan *ayırmasun*! (67); Dəf'i Basat qoçı basub boğazladı, dərisini yüzdi, quyruğilə başını dəridən *ayırmadı*, içinə girdi (101).

AYITMAQ f. Deması. El-evünüzdə çalıb-*ayıdan* ozan olsun! (32); Əlin bögrinə urar, aydar (33).

AYNA zərf. Cümə (günü). Sağış günündə *ayna* görkli, *ayna* güni oqıyanda qütbə görkli (32).

AYNA MƏLƏK is. Şəxs adı. *Ayna Mələk*! Qutlu Mələk! Ölməgə-yitməgə getməmişdim, yatacaq yerim genə bu xərab olasıydı (33).

AYRAN is. Ayran. Acı *ayran* tökiləndə çap-çap içən! (45).

AYRIQ is. Başqaları. Adaxlusın *ayrıqlar* alurkən tutub alan (120); ◇ ayrıq girmək - ayrılıq olmaq. Mana tutan gərdəgə *ayrıq* girsün! (75).

AYRILIQ is. Ayrılıq. Əlaqibət, uzun yaşın ucı ölüm, axırı *ayrılıq* (126).

AYRILMAQ f. Beyrək qızdan *ayrılub*, evlərinə gəldi (55); Bəg nökərindən, nökər bəgindən *ayrıldı* (50).

AYRI//AYRU zərf. Ayrı. Avçılardan *ayru* dilbəndi boğazına keçdi (105); Qaçan-gedən sənin ağan degil, *ayrıdır* (111).

AYRU-AYRU zərf. Ayrı-ayrı. *Ayru-ayru* yollar izin dəvə bilür (32).

AYTIŞMAQ f. Dindirmək, danışdırmaq. Altmış bin ər gördümsə, *aytışmadım* (117).

AL I sif. Qırmızı. *Al* şərabın itisindən içərlərdi (40); □ al qanatlu - Qırmızı qanadlı. Mərə, *al qanatlu* Əzrayil sənmisən? (80); Al yanaqlı - qırmızı yanaqlı. Güz almasına bənzər *al yanaqlım*! (35)

AL II is. Hiylə. ◇ Al eyləmək - hiylə işlətmək. Namərd tayın *al* eyləmiş (125).

ALA I sif. Böyük. *Ala* seyvanı gög yüzinə aşanmışdı (34); *Ala* tağa *ala* ləşkər ava çıqdı (54); □ ala-gen - Böyük, geniş. *Ala-gen* sığın-keyik qovar idim (93).

ALA II sif. Qarışıq rəngli. □ ala gözlü - açıq mavi gözlü. Ağ yüzlü, *ala gözlü* gəlinlər gedərsə, bənim gedər (40); Xəbəri yoq ki, alacığı *ala gözli* qızın otağı olsa gərək (54); □ ala tan - alaqaranlıq vaxt. *Ala tanda* yerindən turı gəldik oğulı tutdurdunmı? (91)

AL-ALA sif. İri, çox böyük. Ban *al-ala* ev yanında dikilsə, gərdək görkli (33).

ALA-ALA sif. Böyük-böyük. *Ala-ala* göndərlər süsəldi (50).

ALAY is. Böyük dəstə, izdiham, çoxlu miqdarda adam. Bir ağ sançaqlu *alay* çıqdı (120); Oğlan gördi kim, bir *alay* atlu gəlür, sıçradı (113); ◇ alay bağlamaq - Dəstə bağlamaq, dəstə düzəltmək. *Alaylar* bağlandı, qoşunlar düzüldi (126); *Alay bağladı*-turdı (120); Gördi, kafərlər *alay bağlamış* gəlürlər (113).

ALAY-ALAY zərf. Dəstə-dəstə, böyük dəstələr halında, izdihamla. Bu məhəldə Oğuz ərənləri *alay-alay* gəldi (120).

ALAN sif. Hündür. Qazan Gög *alan* çəmənə çadır dikdirdi (126).

ALAN-ALÇAQ sif. Hündür-alçaq. *Alan-alçaq* həva yerdən gələn arğış! (58)

ALAN SABAH zərf. Sübh tezdən. *Alan sabah* yerindən turan qızlar! (62); *Alan sabah* turmışsan, ağ ormana girmişsən (63)

ALAR SABAH zərf. Sübh tezdən. *Alar sabah* Dərsə xan yerindən uru turdı (37); *Alar sabah* sapa yerdə dikiləndə ağ ban evli (63).

ALAR TANLA zərf. Səhər tezdən. *Alar tanla* yerimdən turduğım səninçün (75); *Alar tanla* yerindən turan yigit, nə yigitsən? (121)

ALACA sif. Böyük. Parasarın Bayburd hasarından pırlayıb uçan, at *alaca* gərdəginə qarşu gələn Qalın Oğuz imrənçisi, Qazan bəgin yınağı Boz ayğırlu Beyrək çapar yetdi (77); Yedi bin qaftanının ardı yırtıxlu, yarımından qara saçlu, sası dinlü, din

düşməni *alaca* atlu kafər bindi yılğadı, dün bucağında Qazan bəgin ordısına gəldi (42).

ALQIŞ is. Dua. Ol zamanda bəglərin *alqışı* alqış, qarğışı qarğış idi (52); Ola kim, bir ağzı dualının *alqışilə* Tənri bizə bir yetman əyal verə, - dedi (35); ✧ alqış vermək - dua etmək. Həm Basata *alqış* verdi (103)

ALĞAR zərf. Xəlvətcə. Altı yüz kafər atlandı, qoyunın üzərinə *alğar* vardı (43); Qazanın üzərinə *alğar* yetdi (69); Nagah *alğarla* gəlməsün, tutuban yigidim öldürməsünlər! (90)

ALDANMAQ f. Aldanmaq. Ala gözlü qızın-gəlinin gətürdilər, *aldanmadım* (118)

ALDATMAQ f. Aldatmaq. *Aldayuban* ər tutmaq övrət işidir (124)

ALDIRMAQ f. 1) əldən çıxarmaq. Qara tonlu azğun dinlü kafərlərə bir oğul *aldırdınsa*, degil mana! (38); Ap-alaca gərdəginə gələ görgil. Gəlməz olsan, Baybican qızı Banıçiçəgi *aldırdın*, bəllü bilgil! (59); Qocalığım vəqti *aldırduğım* yalnuz oğul! -dedi (74); 2) ələ keçirmək, tutmaq. Mərə, mən anı qormıyam toğana *aldırmayınca*?! - dedi.(80); Torumcığım *aldırmışam*, bozlıyayınmı? (73)

ALƏM is. Kainat, dünya. Qamusına bənzəmədi cümlə *aləmləri* yaradan (33)... Mən *aləmləri* yoqdan var edən allahıma sığındım, - dedi (109)

ALƏT is. Alət. Qılıc və sügü, çomaq və s. cəng *alətin* geydirüb tonatdılar (120).

ALİM is. Alim. *Alimlər* sərvəri Osman Üffan oğlı, görkli (32).

ALI VERMƏK f. Buraxmaq, azad etmək. Savaşmadın - uruşmadın *alı verəyim*, döngil gerü! (40); ✧ alı vermək - alıb vermək. Babası aydır: "Oğuzda kimin qızın *alı verərin*?!" - dedi. Baba, mana bir qız *alı ver* kim, mən yerimdən turmadın ol turkəc gərək! (55); Ağca yüzli görklimi oğlına *alı versün* (125).

ALIMAQ f. Tutmaq, ovlamaq. Gördilər, bir süri qaz oturar. Qazan şahini saldı, *alımadı* (116).

ALIN is. Alın. Oğlan yumrıgilə buğanın *alnına* qıya tutıb çaldı (36); *Alnı* açuq comərd ərənlər dinləsün, - dedi (83); □ alın-baş. *Alın-başa* qunt işuğım urardım! (124); Vay, *alnum-başım* umurı! (58)

ALINCUQ is. Alıncıq, kiçik alın. Açuq-açuq meydana bənzər sənin *alıncuğın* (60).

ALINMAQ f. 1) Əsir düşmək. Dünyəlikdə bir qardaşım *alınubdır*, Ozan, sənin xəbərin yoq (62); 2) Məğlub olmaq. Kafər aydır: "Oğlan, *alındunsa*, tənrinəmi yalvarursan?..." (109); Təkur *alındı*, kafər qaçdı (77); 3) Təslim olmaq. Aya Sofya *alındığın* xəbər vardı (120); 4) Bitmək, qurtarmaq. Qarağuca qıymayınca yol *alınmaz* (31)

ALIŞMAQ f. Alver etmək. Verişməgə-*alışmağa* gəldik, - dedilər (87).

ALLAH is. ər. Allah. Dövlətsiz şərrindən *allah* saqlasun, xanım, sizi! (32); Adını bən verdüm, yaşını *allah* versün, - dedi. (36); □ allah-allah - yalvarmaq. *Allah-allah* deməyincə işlər onmaz (31); Allah-təala-allah. *Allah-təala* qorsa, evini bən qurtarayın, - dedi (46); "Oğlı-qızı olmıyanı *Allah-təala* qarğıyıbdır, biz dəxi qarğarız, bəllü, bilsün", - demiş idi (34)

ALMA is. Alma. Güz *alması* kibi al yanağın tutdı, yırtdı (47); Güz *almasına* bənzər al yanaqlım! (35)

ALMAQ f. 1) Satın almaq. Dan-danışux ilə yəxşi ərməğanlar *aldılar* (52); Gəl imdi bəgondigin maldan *al* (53); 2) Zorla almaq. Ölülərinə aş verdigin vəqt əllərindən *alıram* (116); Təkur qarmalayıb əlindən çomağın *aldı* (96); 3) Götürmək. Oğlanı *alub* babasına vardı (36); Qara polat uz qılıcım əlümə *alayınmı*? (35); Mərə oğlan, *al* şol barmağımdakı yüzügi, parmağına taq...(101); 4) Geri götürmək. Axır zəmanda xanlıq gerü-Qayıya dəgə, kimsənə əllərindən *almıya* (31); Ağam Qazan, sən evin *almağa* gedərsən, mən dəxi qarındaşım qanın *almağa* gedərəm, -dedi (46); 5) Zəbt etmək. Qəl'əyi *aldılar* (121-122); 6) Çıxartmaq. Atlarının əyərlərin *aldılar*, geyimlərin çıxardılar (110); Ağam Beyrək gedəli bizə ozan gəldügi yoq, Əgnimüzdən qaftanımuz *alduğı* yoq. Başımızdan gecəlügimiz *alduğı yoq* (62); 7) Məğlub etmək. Çoban bilə (olmasa), Qazan kafəri *alamazdı*, -deyərlər, -dedi (46); Gürzlə dögişdilər, qara polad uz qılıc ilə tartışdılar, sərpə-sərpə meydanda qılıclaşdılar, çiginləri toğrandı, qılıcları ovandı, bir-birin *alımadı* (108-109); 8) Kəsmək. Qadın ana! Qarşum *alub* nə bögrərsən? (47); 9) Qət etmək. Bən bu gün Qonur ata qaqaram, üç günlük yolı bir gündə *aluram*, evilə olmadın yurdum üstinə vararam (44); 10) məc. Aparmaq. Altun-aqça bul xəzinəni kafər *almış*! (45); Bir əski

qaftan verdinüz, bənim başım-beynim *aldınuz*, -deyüb vardı (62-63); 11) Evlənmək. ..bəni bunda gəlüb həlallıqla *alurmısan*? - dedi (59).

ALMAS is. Almaz. Buynızı *almas* cida kibi Qanturalının üzərinə sürdi (88)

ALP//ALB is. İgid. *Alp ərə* qorxu vermək eyb olur (86); Ğoğa güni ögdin dəpən *alpınuz* kim? (114); Məndən sonra *alb* ozanlar söyləsün! (83); ◇ alp olmaq - igid, cəsur olmaq. Yalnuz yigit *alp* olmaz (108); □ alp başı - igidlərin igidi, böyüyü. *Alplar* başı Qazana zərb urdı, - dunya başına tar oldı (99).

ALPAN is. İgid, cəsur. Ağ-boz atlar çapdırır *alpanlar* gördüm (95); □ alpanlar başı - igidlərin böyüyü, başçısı. *Alpanlar* başı Qazan oğlancuq ilə sərxoş olub, yaturlar, -dedi (69).

ALT zərf. Alt. Qaba öncəm *altına* salaydım (47); Qara saqac *altında* kömecdən nə var? (62)

ALTI say. Altı ...*altı* ögəc dərisindən külah etsə, qulağlarını örtmiyən, qolı-budı xırancə, uzun baldırları incə, Qazan bəgün tayısı At ağızlu Uruz qoca çapar yetdi (49-50).

ALTI YÜZ say. Altı yüz. Şökli Məlik aydır: "*Altı yüz* kafər varsun, qoyunı gətürsün", - dedi (43).

ALTMIŞ say. Altmış. Ol kafərin *altmış* arşun qaməti vardı (94); *Altmış* tutam göndərini nə ögərsən, mırdar kafər? Qızılcıq dəgənəgimcə gəlməz mana! (43).

ALTUN is. Qızıl. *Altun* ayağı əlindən yerə çaldı (53); *Altun* cidasını əlinə aldı. (40)

ALTUNDAĞI sif. Altındakı. *Altundağı* Al ayğırı bilürüz Bəkilindir, Bəkil qanı? (108); *Altundağı* qara ayğırı mana vergil, yigit! (76).

ALTUNLICA sif. Qızıldan olan. Günligi *altunlıca* odasına gəldilər (115); *Altunlıca* günlügin diküb, Qanturalı gərdəginə girüb, muradına-məqsudına irişdi (93); *Altunlıca* qamçısın buldı (74).

ALTUNLU sif. Qızıldan. Qayın talı yeləgümdən sum *altunlu* mənim oxım! (95).

ALÇAQ sif. Hörmətli, müqəddəs. *Alçaq* yerdə yapılubdır Tənri evi Məkkə görkli (32).

ALCA sif. Qırmızıca, qıpqırmızı. *Alca* qanı şorladı, qaynına endi (121); *Alca* qanun yer yüzinə dökəyinmi? (35).

ALCAQ I sif. Alçaq, hörmətsiz. Bəndən *alcaq* kişiləri ağ otağa, qızıl otağa qondurdı (34).

ALCAQ II sif. Aşağı. *Alcaqdan* yuca yerlərə çapub çıqdı (38).

AMAN nida. Can ağrısı, həyəcan, fəryad, iztirab, qorxu və s. hissləri ifadə edir. Qırq yoldaşım, *aman*! (40); Dəli Qarçar aydır: "Mədəd, *aman*, əlaman!" (56); *Aman*, mərə kafər, *aman*! (74); ◇ Aman vermək - rəhm etmək, mərhəmət etmək, əfv etmək, bağışlamaq. Kafərlər oğlana *aman* verdilər, əlin çözdilər, gözin açdılar (74); *Aman* diləmək - rəhm istəmək. Mərə, dəli qavat! Dəxi nə *aman* dilərsən? (82).

AMMA bağlayıcı. Amma. Babamdan can dilədim, *amma*, vermədi (82); Ayıtdılar: "Bilməziz. *Amma* gözündən ğeyri yerdə ət yoqdır" -dedilər (101).

AMİN nida. ər.əsli qəd.yəh. Qəbul olsun, arzun yerinə yetsin. "*Amin*" deyənlər didar görsün! (114).

AMİT SOYI is. Tayfa adı. *Amit* soyının aslanı, Qaraçuğın qaplanı! (63).

ANA I is. Ana. Qız *anadan* görməyincə ögit almaz (31).

ANA II əv. Ona. ...ər adam evdə olsa, *ana* disə ki, tur ətmək gətür, yeyəlim, bu da yesün... (33)

ANI əv. Onu. ...ol *anı* yedirər-içirər, ağırlar-əzizlər, göndərər (33).

ANIN//ANUN əv. Onun. Həq təala *anın* könlinə ilham edərdi (31); *Anun* bəbəkləri bitsün (33).

ANDA əv. Onda. Oğlan *anda* yıqıldıqda Boz atlu Xızır oğlana hazır oldı (39); Babam *anda* tutsaq imiş (95).

ANDAN əv. Ondan. *Andan* dəxi sizi, xanım, allah saqlasun (33); *Andan* Yegnək atın döndərdi, ləşkərə gəldi (96).

ANLAR əv. Onlar. *Anlar* bir yedigində, sən iki yegil! (47).

ANA GÖRƏ əv. O cür. Baybörə bəg aydır: "Oğul, Qalın Oğuz bəglərini odamıza oxıyalım, necə məsləhət görərlərsə, *ana görə* iş edəlim", -dedi. (55).

ANARU əv. O tərəfə. "Nə gəlürsə, bənim sağrıma gəlsün" deyü əlüyin ..urur, yönin *anaru*, sağrısın ərinə döndürür (33).

AND is. Bir şey haqqında verilən təntənəli və'd, söz. ◇ And içmək - söz vermək. Beyrək *and* içdi (59); *And* içmişəm, qısır qısrağa bindigim yoq (64).

ANDIRMAQ f. Anlatmaq, yada salmaq. Keçmiş mənim günimi nə *andırırsan*? (47)

ANDIRTMAQ f. ic.n. Yada saldırmaq. Bəkil aydır: "Öləyim ağzın içün, oğul! Ola kim, mənim keçmiş günimi *andırtmıyasan*",-dedi (107).

ANITMAQ f. Yada salmaq. Dədənin anası *anıtdı*, Tənriyə sıqındı (56).

ANLAMAQ f. Eşitmək. Sən bənim ünim *anla*, sözüm dinlə! (53).

ANLANMAQ f. Eşitmək. Qaba dizi üzərinə çökdi, ayıtdı: "Ünim *anlan*, bəglər, sözüm dinlən, bəglər!" (42).

ANMAQ f. Yada salmaq. Beyrək yayı gərdəgində yoldaşların *andı*, ağladı (63); Oğlan təxtə çıqdı, babasının qırq yigidin *anmaz* oldı (36).

ANSUZIN zərf. Cəld, bir anda. Çəkdi, *ansuzın* əlindən aldı, qılıcını tərpətdi, babasının üzərinə at saldı (121).

ANUNÇUN bağl. Onunçun. Oğuz bəgləri yedi gün uyurdı. *Anunçun* "küçicik ölüm" deərlərdi (116).

ANUNÇUN Kİ bağl. Onun üçün ki. Bunı neçün böylə edərdi? *Anunçun ki*, "Məndən dəli, məndən gücli ər varmıdır ki, çıqa mənümlə savaşa", - deyirdi (79)

ANCAQ bağl. Ancaq. Oğuzun bir yəxşi yigidi *ancaq*...yüriyəyim, mədəd deyəyim (53); Bu otuz eki baş kim bürcdə asılmış idi, qağan aslanla qara buğranın yüzin görməmişdi, *ancaq* buğa buynuzunda həlak olmuşlardı (85).

ANCILAYIN əv. Onun kimi. Hey, şu dəli məğmun mənə də şayəd *ancılayın* olmaz sözlər söylər, -dedi (64).

AP-ALACA sif. Ağappaq. Beyrək *ap-alaca* gərdəgi içində yeyüb-içüb bixəbər oturardı (57).

APARMAQ f. Aparmaq. Əmma bizim bir bəgümiz oğlı vardır, bu üç nəsnəyi ana ərməğan *aparsavuz* gərək idi! (53).

APUL-APUL zərf. İti-iti, cəld. *Apul-apul* yürüdi, ağ alnını açdı (87); Aydır: "Xanım, sazdan bir aslan çıqar, at urar, *apul-apul* yürüyişi adam kibi (98).

AR is.ər. Həya, abır. Axır vəqtində *arı* imandan ayırmasun! (67).

ARA is. 1) İki şey arasındakı məsafə. Üzəngiyə qalqıb, qatı çəkdi, uz atdı: Oğlanı iki talusının *arasında* urub çıqdı, yıqdı (37); 2) İç, daxil. Leş *arasında* oğlancığı leşin bulmadı (74); 3) Ətraf. Bu *aralarda* neylərsən? (56); 4) Ərəfə. Qanlı qoca bu *arada* soylamış, görəlim, xanım, nə soylamış, aydır (86); 5) Vaxt. Yemək-içmək *arasında* bəglər səni andı (123); 6) Ara. Məgər, sultanım, oğlan ol *arada* yıqılmışdı (38); ◊ Aradan çıqmaq - canını qurtarmaq, qaçmaq. Sən *aradan çıqğıl*, mən allah-təala bilə xəbərləşim, - dedi (81).

ARAMAQ f. Axtarmaq, yoxlamaq. Mərə bazırganlar, varın iqlim *aran*, Beyrəgin ölisi xəbərin gətürib deniz, ölimidir? (58); Çoq cahillər səni gögdə *arar*, yerdə istər (83); Qara gərdun içində yol *arasan*, azsan, umun nədir? (114)

ARQA//ARXA is. 1) Bel. Bu kəz Beyrək qızın incə belinə girdi; bağdadı, *arxası* yerə urdı (55); Qazan baqdı, gördi çoban ağacı *arqasına* almış, gəlür (46); Qolanını çəkdi, sıçradı, *arqasına* bindi (117); 2) Dayaq. Qalmış yigit *arxası*! Bizə miskin umudı! (63); Qalın Oğuz *arqası*, Bayındır xanın göygisi Salur Qazan qaba dizinin üzərinə çökdi (52).

ARXACIQ is. Belcik. Əri muradına yetürər sənin *arxacığın* (60).

ARQIÇ is. Qayalıq. *Arqıç* qırda yıqanır Əmman dənizində, Sarb yerlərdə yapılmış kafər şəhri (118).

ARĞIŞ is. Sarvan. Bunlu yerdə qodım-gəldim, Otuz toquz yoldaşım, iki *arğışım*! - dedi (63); Bəg babamın, qadın anamın soğatı *arğış*! Ayağı uzın şahbaz ata binən *arğış*! (58).

ARQU BELİ//ARXU BELİ is. Yer adı. *Arqu beli*, Ala tağı avlar idim (93); *Arxu beli*, Ala tağı dünin aşdın (89).

ARQURI//ARQIRI sif. 1) Çılpaq. Sən gedəli, xanım, *arqurı* yatan Ala tağlarun avlanmamışdır (105); 2) Quru yer. Qapu eşigi üzərindən *arqurı* qomışlardı ki, bu məhəldə xan Qazan yetdi (74); 3) Boş-boş. *Arqırı* söyləmə, mərə itüm kafər! (43).

ARĞAB-ARĞAB sif. Sıra-sıra. *Arğab-arğab* qara tağın yıxılmışdı, yucaldı axır!... (66)

ARĞUN is. Çuğul, xəbərçi. Vardı kafərlər *arğunı* Şökli Məlikə xəbər verdi (42).

ARD is. Arxa, bel. Dərsə xanı tutdılar, ağ əllərin *ardına* bağladılar (40); *Ardına* düşdilər, qoa getdilər (60); Toqsan tümən gənc oğuz *ardımca* gəlsün! (74); Yegnəg *ardından* yetdi (96); Arqasını urıb, bərk ağılın *ardın* sökən! (45); Babasının *ardınca* yortub getdi (40).

ARI//ARU sif. Təmiz. *Arı* sudan abdəst aldılar (50); Quşun ala qatını, qumaşın *arusını*, qızın gögçəgini, toquzlama çırğab çuqa Bayındır xana pəncyek çıqardılar (97).

ARU is. ◇ aru turmaq - ayağa durmaq. Bəkil *aru* turdı, ağladı (105).

ARIQ//ARUQ sif. Arıq. Simüz qoyun, *arıq* toqlı sənin qapundan kafərlərə verməmdim (46); Altında Al ayğırı *arıq* oğlan (107); Simüzin al, *aruğın* qo! (57); □ aruq can - pak can. *Aruq candan* eki qarındaşı Dəpəgöz əlində həlak oldı (99).

ARPA is. Arpa. Yanmış *arpa* ətməgi, acı soğan öyni, degil! (75); *Arpa* ətməgi, acı soğan öynəcigi deyəyinmi? (76).

ARSIZ sif. Arsız, həyasız. Kafər aydır: "Oğuzun *arsızı* türkmanın dəlüsinə bənzər! Bağ a şuna", - dedi (108).

ARSLAN is. Aslan. Nə biləyin, oğul, *arslandanmı* oldı, yoxsa qanlandanmı oldu? (39); *Arslan* kibi anradı (76).

ARTIQ//ARTUQ zərf. Artıq, çox. Bəli, sultanım, *artıqdır*! -dedilər (54); Bir yigidin qara tağ yumrısınca malı olsa, yığardərər; tələb eylər, nəsibindən *artuğın* yeyə bilməz (31).

ARTIRMAQ f. Artırmaq. Sağlığla sağıncın, dövlətin həq *artursın* (41).

ARUZ is. Şəxs adı. Taş Oğuz bəglərindən *Aruz*, Əmən və qalan bəglər bunı eşitdilər (123); Qaçub gedərkən *Aruz* qocanın oğlancığı düşmiş, bir aslan bulup götürmiş, bəsləmiş (98).

ARŞUN is. Uzunluq ölçüsü. Ol kafərin altmış *arşun* qaməti vardı (94).

ARŞUN oğlı DİRƏK TƏKUR is. Şəxs adı. Adına *Arşun oğlı Dirək təkur* deərlərdi (94); *Arşun oğlı* Dirək təkura xəbər verdilər (96).

ASİ is.ər. Üsyançı. Oğlan aydır: "Ya *asi* məl'un, sən pütlərünə yalvarırsan, mən aləmləri yoqdan var edən allahıma sığındım",-dedi (109); ◇ asi olmaq - tabe olmamaq, üzə durmaq, itaət etməmək. Oğuza *asi* oldum, bəllü bilin! - dedi (105); Padşahına *asi* olanın işi rast gəlməz (105).

ASILAN-ASILAN f.s. Asılan-asılan. *Asılan-asılan* qayalardan Qazan, oğlan uçırdınmı? (72).

ASILMAQ f. Asılmaq. Böyləliklə, otuz iki kafər bəginün oğlunun başı bürc bədənində kəsilüb *asılmış* idi (85); Bu otuz eki baş kim bürcdə *asılmış* idi...(85).



ASILU zərf. Asılı. Həq təalanın əmrilə Dəli Qarçarın əli yuqaruda *asılu* qaldı (56).

ASMAQ f. Asmaq. Qazan oğlı Uruzı həbsdən çıqarun, boğazından orqanla *asun* (47); Məni sana *asarlar*, götürməgil, ağac! (48).

ASLAN is. Şir, aslan. *Aslanla* qaplana bir oğul yedirdinsə, degil mana! (38); Tolı sazın *aslanına* yedirdinmi? (72).

ASMANLU sif.f. Asiman fars - göy. *Asmanlu* gögdə qara bulut oluban kafərin üzərinə gurlıyayım (76).

AT is. At. *At* yemiyən acı otlar (bitincə) bitməsə, yeg (32); Sarb yürürkən Qazlıq *ata* namərd yigit binə bilməz; binincə binməsə, yeg! (32); ◇ at dəpmək - atla hücuma keçmək. Qaraqucın oynaddı Uruz, kafərin sağına *at dəpdi* (71); Bir saətdə kafərə üç kərrə *at dəpdi* (76); at oynatmaq - məc.meydan oxumaq. Selcan xatun *at oynatdı* (91); at salmaq - atla hücuma keçmək. Bitəkəllüf kafərə *at saldılar*, qılıc urdılar (77); Qara tonlı kafərə *at saldı* (91); Qazanın üzərinə *at saldı* (120).

ATA is. Ata. Oğul *atadan* görməyincə süfrə çəkməz (31); Rəsul əleyhissəlam zamanına yaqın Bayat boyından Qorqud *ata* diyərlər, bir ər qopdı (31).

ATA-ANA is. Öz övladına nisbətən kişi və qadın; valideyn. *Ata-ana* "yanlış xəbərdir, gctmə, oğul!"-dedilər (112); Haman qız sıçradı, ata mindi, Beyrəgin *ata-anasına* muştuluğa çapar gctdi (65).

ATAĞUZLU sif. Ləqəb. Anlar eylə digəc *Atağuzlu* Uruz qoca iki dizinin üstinə çəkdi (42).

ATDIĞI fe'li sif. Atdığı. *Atdığı* taş yerə düşməzdi (48).

ATDIRMAQ f.ic.n. Atmağa məcbur etmək. İbrahimi tutdurdun, Xam gönə çulğadun. Götürüb oda *atdurdun* (109).

ATILMAQ f. məch.n. Üç yeləkli qayın oqlar *atıldı*, dəmrəni düşdi (50).

ATIŞMAQ f. müşt.n. Ağ yeləklü ötgün oxlar *atışaydıq* (108).

ATLANMAQ f. Ata minmək. Xoş, imdi *atlanın*! İkisi *atlandılar* (55); Baybörə bəgin oğlı *atlandı*, ava çıqdı (53).

ATLAS is.ər. Atlaz; parlaq ipək parça növü. *Atlasda* yapılanda gög sayvanlu (63); *Atlas* ilə yapılanda Gög sayvanlı (94).

ATLU sif. Ata minmiş, süvari. Bir bölük *atlu* gəldi. (116); Dərsə xan yayan, bunlar *atlu* yüridilər (40).

ATMAQ f. 1) Bir şeyi əlindən buraxaraq yaxına və ya uzağa tullamaq. Keyikə *atarkən* oqla səni urar, öldürər (37); Oğlım Uruz ox *atanda* puta qalmış (44); 2) Bir şeyi hündür yerdən aşağı tullamaq, salmaq. Kənduyi bir yuca yerdən *atdı* (105); 3) Buraxmaq. Qarşuna ala qaz gəldi, şahinin *atmazmısan* (89); ◇ atı vermək - atmaq. Qaftanı sıyırdı, götürdi, qızların üstinə *atı* verdi (62).

AXİRƏT is. ər. Dini e'tiqadlara görə, öləndən sonra insanların düşəcəyi ikinci və əbədi dünya. *Axirət* həqqini həlal etsün (125); Gəlimli-gedimli dünya, *Axirət* - son ucı ölümli dünyal... (78)

AXIR I is. 1) Son, nəhayət. *Axır* vəqtində arı imandan ayırmasun! (67); Əlaqibət, uzun yaşın ucı ölüm, *axırı* ayrılıq (126); *Axır* zəmanda xanlıq gerü-Qayıya dəgə, kimsənə əllərindən almıya (31); 3) Axırda, nəticədə. *Axır* evindən qodı (99).

AXIR II ədat. Axı. Qanlu-qanlu suların sovğulmışdı, çağladı, *axır*. Qaba ağacın qurımışdı, yaşardı, *axır*! (66).

AXITRILMAQ f. Endirilmək (atdan). Qazan dəxi *axıtrıldı*, yerə endi (121).

AXTARMAQ f. Soymaq. "Bəli, baş kəsdi, qan dökdi, adam *axtardı*!" - dedilər (54).

AXŞAM is. Günün axırından gecənin başlanmasına qədər olan vaxt. Əgər sağdır, əsəndir, *axşam* olmadın genə mən sana gəlürəm (44); Qaranqu *axşam* olanda qayğılu çoban! (43).

AH nida. Ağrı, həyəcan, həsrət və s. hisslər ifadə edir. *Ah*, noleydi, bu öleydi, birinə dəxi vareydim (33); ◇ ah etmək//eyləmək - həsrət çəkmək, təəssüflənmək, qəmlənmək, ah çəkmək. *Ah* etdilər, əqlləri başlarından getdi (57); Bir gecə döşəgində qatı-qatı inlədi, *ah* etdi (106); Baybörənin bunları gördügində *ah* eylədi (52).

AÇDIRMAQ f.ic.n. Açmağa məcbur etmək. Xatun gəlüb zindançıya qapuyı *açdırdı* (116); Alp Uruz çadırların *açdırdı*, cəbbəxanasın yüklətdi (119).

AÇILMAQ f.qayıd.n. Açılmaq. Oğlım idigin andan biləyim, sırça parmağını qanatsun, qanını dəstmala dürtsün, gözimə sürəyin; *açılacaq* olursa, oğlım Böyrəkdir! -dedi (66).

AÇMAQ f.1) Qapalı bir şeyin qapağını və s. qaldırmaq. Qara qıyma gözlərin uyxu almış, *açğıl* axı!...(39); Kafərlər oğlana aman verdilər, əlin çözdilər, gözin *açdılar* (74); 2) Üzə çıxarmaq. Dəxi eybin *açaram*, bəllü bilgil! - dedi (64); 3) Təmizləmək. Arı könüldə pas olsa, şərab *açar* (105);4) "Ağız" sözü ilə birlikdə "danışmaq" mə'nasında. *Ağız açub* ögər olsam, üstimizdə Tənri görkli! (32).

AÇUQ sif. Örtülü olmayan. Qırq yigidlən oğlın Uruz başı *açuq*, yalın ayaq kafərlərün yanınca tutsaq getdi (45).

AÇUQ-AÇUQ sif. Geniş. *Açuq-açuq* meydana bənzər sənin alıncuğın (60).

AC sif. Aclıq hiss edən, yeməyə ehtiyacı olan. *Ac* görsən, toyurğıl! (35); Oğul, çoban, qarnım *acdır* (46).

ACİZ sif.ər. Əlindən iş gəlməyən, bacarıqsız, zəif; ◇ aciz qalmaq - bir iş görmək iqtidarından məhrum olmaq. *Aciz* qaldılar (99).

ACI sif. 1) Şirin olmayan. Adam içməyən *acı* sular sızınca, sızmasa, yeg (32); *Acı* ayran töküləndə çap-çap içən! (45); 2) məc. Xoşa gəlməyən, qəlbə toxunan. İncinib *acı* sözlər söyləmə! (35); 3) məc. Qəzəbli, ağrılı-acılı. *Acı* tırnaq ağ yüzinə aldı-çaldı (57).

ACIQ is. hirs, hiddət, qeyz, qəzəb. ◇ Acığı tutmaq - hirslənmək, hiddətlənmək, qəzəblənmək. Böylə dikəc Əzrayilin *acığı tutdı* (80); Yalançı oğlı Yalancuğın *acığı tutdı* (63).

ACIQMAQ f. Acmaq. Yemək istəmək. Ağam Qazan, bu ağac ol ağacdır kim, sən kafəri basarsan, qarnın *acıqar*, mən sana bu ağacla yemək bişürərin, -dedi (46); Mərə çoban! Qarnın *acıqmamışkən*, gözün qararmamış ikən bu ağacı qoparı gör! (46).

ACMAQ f. Aclıq hiss etmək, yemək istəmək. Buğa *acmışdı* (105).

AŞ is. 1) Xörək, yemək bişmiş. Aydır: "Bunlu qoca ilə Yapağlu qocayı Dəpəgözə verün, *aşın* pişürsün!" -dedi (99); 2) Ehsan, xeyrat. ◇ aş vermək - ehsan, xeyrat vermək. Aygır atum boğazlayub, *aşum vergil*! (112); Aygır atım boğazlayub, *aşum versün*! (75).

AŞAĞA is. 1) Bir şeyin yerə ən yaxın hissəsinə tərəf. Mərə, qavat oğlı, qavat! Mən *aşağa* qulpa yapışuram, sən yuqarı qulpa yapışursan (92); 2) Zərf. Yerə doğru, aşağıya doğru. Əgər səni hasardan *aşağa* orğanla salındıracaq olursam, babana-anana sağlıqla varacaq olırsan, bəni bunda gəlüb həlallıqla alur-

mısan? - dedi.(59); *Aşağadan* yuqarı baqmazmısan? (89); Yuqarudan *aşağa* kafər oğlanı qatı urdı (108).

AŞANMAQ f. Dirənmək. Ala sayvan kög yüzinə *aşanmışdı* (68).

AŞBAZ is. fars. Xörək bişirən, xörək hazırlayan usta. Adam ətin yəxni qılan *aşbazı* olur (70).

AŞIQ//AŞUQ is. Diz qapaqlarından çıxan oynaq sümüyü //Uşaqların aşıq-aşıq oyununda işlətdikləri (adətən,qoyunların diz qapağından çıxarılan) sümük. Məgər sultanım, Dirsə xanın oğlancığı, üç dəxi ordı uşağı meydanda *aşuq* oynarlardı (36); Altun *aşıq* oynar Sancıdanın bəgləri (118).

AŞIQLAMAQ f. Aşıq olmaq, vurulmaq. Böylə dikəc, qız Beyrəgi *aşıqlamışdı*, -aydır. (59).

AŞIT is. Aşmaq, keçmək imkanı. ♢ aşıt//aşut vermək - keçmək, aşmaq imkanı vermək. Qara tağa yetdügində *aşıt* versün (108); Qarşu yatan qara qarlı tağlardan aşar olsa, allah-təala sənin oğlına *aşut* versün (54).

AŞMAQ f. Hündür bir şeyin üstünə çıxıb o biri tərəfinə enmək, keçmək. Qarşu yatan qara tağını *aşmağa* gəlmişəm (56); Qarşu yatan qara qarlı tağlardan *aşar* olsa, allah-təala sənin oğlına aşut versün (54); Ala yatan qara tağları *aşdım* (85).

AŞURMAQ f. 1) Keçirmək. Dədəyi qoa-qoa Dəli Qarçar on yelən yer *aşurdı* (56); 2) Vurmaq, çəkmək. Olmaz isə, bən saqalını tutayın, siz qılıc *aşurın*, parələn! (124).

## B

BABA is. Ata. Sən sağ ol, qadın ana! *Babam* sağ olsun (47); Oğul dəxi neyləsün, *baba* ölüb mal qalmasa, baba malından nə faidə, başda dövlət olmasa... (31).

BAQDIRMAQ f. Baxdırmaq. Dili-damağı quruyıb dört yanına *baqdırdınmı*? (71).

BAŞ sif.ər. 1) Qalıq, qalan. Baqisin ğazilərə bəxş etdilər (97); 2) Əbədi, daimi. Baqi qalan səttar Tənıri, mənim canımı alsan, sən alğıl (81).

BAĞIR is. Mis. Qızıl altun götürdülər, "*bağırdır*" dedim (118).

BAQIŞ is. Baxış, nəzər. Apul-apul yürüşündən, aslan kibi turışından, Qanrıluban *baqışından*, Ağam Beyrəgə bənzədürəm ozan, səni (62).

BAQIŞMAQ f. Baxışmaq. Qarşu yaqadan kafərlər *baqışurlar* (115).

BAQMAQ f. Baxmaq. *Baqdı* gördi ilğar yetdi (90); Dərsə xanın yüzinə *baqdı* (38).

BAĞ I is.f. Bağ, baxça. Ol *bağların* qara salxımları, üzümi olur (80); Ol tağlarumızda *bağlarumız* olur (80); *Bağ* və *bostanın* zinəti su (44).

BAĞ II is. Bağlamaq üçün istifadə olunan ip, qaytan. Ala qalqan *bağını* qısa dügdilər (71); Aydır: "Aqınçıların tirkəşi *bağı*, üzəngüsi qayışı üzülür, dikməgə gərək olur", -dedi. (90)

BAĞDAMA is. Sinəbağı. Qavradı, qızın *bağdamasın* aldı (55).

BAĞDAMAQ f. Dizini bükmək. Bü kəz Beyrək qızın incə belinə girdi; *bağdadı*, arxası üzərinə yerə urdı (55)

BAĞIR is.: ♢ bağrı yanmaq. Kədərlənmək, qəm-qüssəyə batmaq. Bir bəgüm görinməz, *bağrım* yanar (72); Yalnuzca oğul görünməz, *bağrım* yanar (38); Yandı *bağrım*, göynədi içim (61); ♢ bağır basmaq - tə'zim etmək. Dəlü ozan gəldi, baş endirdi, *bağır basdı* (63); Baş endirüb *bağır basğıl* (243).

BAĞIRMAQ f. Bağırmaq. Dəvə *bağırdı* (90)

BAĞIŞLAMAQ f. Bağışlamaq. Məgər Beyrək buna bir kömlək *bağışlamış* idi (57); Qazan suçlarını *bağışladı* (126)

BAĞLAMAQ f. 1) Bağlamaq. Çobanı bir ağaca sara-sara *bağladı* (46); Dədəm Qorqud himmət qılıcın belinə *bağladı* (104); 2) Əhatə etmək, mühasirə etmək. Dört yanını kafər *bağladı*, bəllü bilgil, - dedi (114); ♢ odavət bağlamaq, düşmən olmaq. Ədavət *bağladılar*, hə-mi? (123)

BAĞLANMAQ f. Bağlanmaq. Alaylar *bağlandı*, qoşunlar düzildi (126); Nerədə bildin bənim tutsaq olduğum? Ağ əllərim ardumda *bağlanduğın*? (74)

BAĞLATMAQ f. Bağlatmaq. Ağ əllərin qarusından *bağlatdınmı*? (72).

BAĞLU sif. Bağlı. Ağ əlləri ardına *bağlu* deyəyinmi? (76); □ Əli bağlu - əli bağlı; Xan Qazanın oğlı Uruz bəg üç yüz yigidlən Əli *bağlu*, boynı *bağlu* getdi (43).

BADAM is. Badam. Qoşa *badam* sığmayan tar ağızlum (35).
BADYƏ is. Şərab və ya maye tökmək üçün istifadə olunan ağzı böyük qab. Toqsan yerdə *badyələr* qurulmışdı (42); Toqquz yerdə *badyələr* qurılmışdı (68)
BAZLAMAC is. Sac üstə bişən fətir. Gəldin ol kim soldıran soydır, sapadanca yerindən uru turar, əlin-yüzin yumadan toquz *bazlamac* ilən bir küvlək yoğurd kəvəzlər... (33)
BAYANDAR XAN//BAYINDIR XAN. xüs.is. Şəxs adı. Alar sabah Dərsə xan qalqubanı yerindən uru turıb, qırq yigidin boyına alub, *Bayandar xanın* söhbətinə gəlürdi (35). Aq alınlu *Bayındır xanın* divanına dünin varğıl (106).
BAYAT xüs.is. Qəbilə adı. Rəsul əleyhissəlam zamanına yaqın *Bayat* boyından Qorqud ata deyərlər bir ər qopdı (31).
BAYBİCAN xüs is. Şəxs adı. *Baybican* bəg dəxi yerindən uru turdı (52).
BAYBÖRƏ xüs.is. Şəxs adı. *Baybörənin* oğlı beş yaşına girdi (53)
BAYBURD is.Yer adı. Nagah Parasarın *Bayburd* hasarına gəldilər (58); Parasarın *Bayburd* hasarından parlıyıb uçan...Boz ayğırlu Beyrək çapar yetdi (77).
BAYIMAQ f. Dövlətlənmək, zəngin olmaq. Qadir Tənri verməyincə ər *bayımaz* (31).
BAYIR is. Çöl, bayır. Simüz qoyun, arıq toqlı *bayırda* qalsa qurt gəlib yeməzdi sapanın qorqusundan (48).
BALQAR eti. Xalq adı. Ötəki qara tağın bir yanında altı başı *balqar* bir ər gördüm (95)
BALDIR is. Baldır. Qolı-budı xaranca, uzun *baldırları* incə, Qazan bəgün tayısı At ağızlu Uruz qoca çapar yetdi (50).
BALIQ is. Balıq. Nəmrud gögə ox atdı, qarnı yarıq *balığı* qarşu tutdun (96).
BALÇAQ is. Qılıncın dəstəyi. Gördilər kim, bu gəlin kişinin qılıncının *balçağı* qanlu, oğlu görünməz (91); Selcan xatun qılıncının *balçağı* qan odaya gəldi (91)
BALÇIQ is. Palçıq. Atlu batub anun *balçığına* qunlar döşəyim (86); Atlu batub çıqamız anun *balçığı* olur (86); Alplar içində bizi qusqunumızdan *balçığa* baturdın, - dedi (105).
BAM-BAM DƏPƏ is. Təpə adı. Beyrək gedəli *Bam-bam dəpə* başına çıqdığım çoq (65).

BAMSA xüs.is. Şəxs adı. Sən oğlanı "*Bamsam*" deyü oxşarsan, bunın adı Boz ayğırlıq *Bamsı* Beyrək olsun (54.
BAMSI xüs.is. Şəxs adı. Ayıtdılar Baybörənin oğlı vardır, adına *Bamsı* deyirlər, - dedilər (58); Qıyan Səlcük oğlı Dəli Tondazı sorarsan, sağdır, *Bamsı* (59).
BAN sif. Yüksək. Altun başlu *ban* ev vergil bu oğlana, Kölgə olsun, ərdəmlidir (36); Dünlügü altun *ban* evlərimi götürüb durursan sana kölgə olsun (48); *Ban* al-ala ev yanında dikilsə, gərdək görkli (33).
BANIÇİÇƏK xüs.is. Şəxs adı. *Banıçiçək* yaşmaqlandı, xəbər sordı (54); Oğul məgər sən istədigin qız Baybican bəg qızı *Banıçiçək* ola? (55); Baybican qızı *Banıçiçək* evdəmi, arğış, yoxsa gordamı, arğış? (59)
BAN is. Əzan. □ ban banlatmaq. Əzan verdirmək. *Ban banlatdılar* (64); Kəlisasın yıqub, yerinə məscid yapdım *ban* banlatdım (118).
BANA I şəxs əvəzliyinin təki. Ordumın xəbərin bilürmisin, degil *bana* (44); Hay Dərsə xan, *bana* qəzəb etmə (35).
BANLAMAQ f. Əzan vermək, uca səslə çağırmaq. Saqalı uzın tat əri *banladıqda*...(34); Minarədə *banlayanda* fəqih görkli (33).
BARANSAR B a x: Parasar. Baransarın Bayburt hasarından parlıyub uçan Baybörə xan oğlı Bamsı Beyrək manıa deərlər (120).
BARİ əd.f. Barı. *Bari* Bayandır xanın tövləsindən eki şahbaz yügrək at götürün (55).
BARIŞMAQ f. Barışmaq. İlərü gəlüb Selcan xatunını qucaqlayıb *barışmışlar*, soruşmuşlar (93).
BARGAH is.f. Saray, şahanə çadır. Ol gün ala *bargah*, otaqlar dikildi (115); Ala *bargah* otaqların düzə dikdi (124); Ala *bargah* otağına çoq girmişəm. Bilməzsəm, mana zindan olsun (124).
BARMAQ is. Barmaq. Biləgümdən on *barmağım* qanda gördüm (44); Toquz qara gözlü, xub yüzlü, saçı ardına urulu, köksi qızıl dügməli, əlləri biləgindən qınalı, *barmaqları* nigarlı məhbub kafər qızları Qalın Oğuz bəglərinə sağraq sürüb içərlərdi (42).
BASAT xüs.is.Şəxs adı. *Basatın* qaranulu gözləri yaşla toldı (100); *Basat* qaqıb yerindən turı gəldi (103).

BASILMAQ f. Məğlub edilmək. Ol gəldi ki, yağı *basılmışdı* (74).

BASMAQ f. 1) Qoymaq. Dəxi kopənogindən qurumsı edüb yarasına *basdı* (44); Sügüligi Dəpəgözün gözünə eylə *basdı* kim Dəpəgözün gözi həlak oldı (101); 2) Məğlub etmək. Məni *basarsan*, anı dəxi *basarsan*, -dedi (55); 3) Tapdalamaq, ayaq altına almaq. Oğlanı girən basar, çıqan *basardı* (74); ◇ əl basmaq, əl vurmaq. Altun xaça mən əlümi *basaram* (68). Ətmək basmaq - namərdlik etmək. Beyrək ətməgün *basmadı* (125); Diz basmaq, diz üstə çökmək. *Dizin basub* oturanda həlal görkli (33).

BATMAQ Batmaq. Ox atdılar, *batmadı* (99); Oğul, sana ox *batmasun*, tənüni qılıc kəsməsün (99); Atlu *batub* çıqamaz onun balçığı olur (86).

BATMAN s. Batman (çəki vahidi). Kafər altmış *batman* kürz salardı (91); Hər atanda on iki *batman* taş atardı (48).

BATURMAQ f. Batırmaq. Vardı, könləgi qana-quna *baturdı*. Bayındır xanın ögünə gətürüb bıraqdı (58); Qalaba qorxudar, dərin olsa, *baturar* (71).

BATURTMAQ f. Batırmaq. Dərin olsa, *baturdır*, qalabalıq qorxudır (57).

BAXMAQ f. Baxmaq. Ağ meydanın ortasında *baxdı* turdı (36).

BACA is. Baca. Əzrayılın gözini elə qorxutdum ki, gen qapuyı qodı, tar *bacadan* qaçdı (80); Bəglərbəgi olan Qazan divanında buna heç qapu-*baca* yoğdı (110).

BACARMAQ f. Bacarmaq. (Dəli Qarcar) gördi *bacarı* bilməz, aydır... (57).

BAŞ is. 1) Baş, kəllə. Qara eşək *başına* üyən ursan qatır olmaz (31); Öz gödəndən *başunı* kəsəyinmi? (35); 2) Nəfər. Altı *baş* ərlə mən Qazan vardım, altı günə qomadım, anı aldım (118); 3) Yuxarı, qıraq. Alnına yumruğın tayadı, sürdi meydanın *başına* çıqardı (88); 4) Zirvə. Yerdən uca taqlar *başına* yoldaşların alub çıqdı (71); 5) Əvvəl. Axır separə *başıdır*, amma görkli (32); 6) Başçı. Qaragünə oğlı Budaq, Qazan bəg oğlı Uruz, Bəglər *başı* Yegnək...ox atarlardı (63); ...Alpanlar *başı* Qazan oğlancuq ilə sərxoş olub, yaturlar...(69); ◇ Baş kəsmək, öldürmək. Ol zamanda bir oğlan *baş kəsməsə*, qan tökməsə ad qomazdılar (53); Əgrək aydır: "Mərə, Tərs Uzamış, *baş kəsüb*-qan tökmək hünərmidir?" - dedi (110); Baş qoymaq - sədaqətli olmaq, çətinliklərə sinə gərmək. Vallah, mən Qazan Oğuzına *başım qomışam* (125): Göz açuban gördigim, könül ilə sevdigim, bir yasdıqda *baş qoydığım* (59); baş endirmək, tə'zim etmək. *Baş endürüb*, salam verdilər (53): Dəli ozan gəldi; *baş endirdi*, bağır basdı (63); başına çıqmaq - başına tə'sir etmək. Şərabın itisi *başına çıqdı* (94); başına tar olmaq - çətinə düşmək. Yalan dünya *başına* tar oldı (94); baş üzərinə - baş üstə. Beyrək dəxi "Nola, xanım, *baş üzərinə* dedi (55); başına gəlmək olmaq. Qazi ərənlər *başına gəldügin* aydı verdi (126); baş vermək - canını qurban vermək. Bir yigit aramızdan əksildi, sənin yolında *baş verdi* (126); Baş qaldurmaq - baş qaldırmaq, tərpənmək. *Baş qalduran* kafərləri öldürdi (53); baş-beynini almaq - zəhləsini tökmək. Bir əski qaftan verdiniz bənim *başımbeynim* aldınız, - deyüb vardı (62).

BAŞIAÇUQ is. top. İmereti (Gürcüstanda yer adı). Məgər *Başıaçuq* Tatyan qəl'əsindən, Aqsəqa qəl'əsindən kafərin casusı vardı (69).

BAŞLAMAQ f. Başlamaq. Qoyun ürkməgə *başladı* (98).

BAŞLU sif. Örtüklü. Altun *başlu* ban evlər gedərsə, bənim gedər (40); Altun *başlu* ban ev vergil bu oğlana (36).

BAŞMAQ is. Başmaq, ayaqqabı. Ayağım *başmaq*, yüzim yaşmaq görmədi (33).

BAŞSIZ sif. Zirvəsiz. Başın ala bağır alsam *başsız* ağac (47).

BEZ is. Bez. Qanturalı altunlu incə kətan *bezin* belinə sardı (87); Əski pambuq *bez* olmaz (31).

BEYİN is. Beyin. Dəpəcə böyimişsən tarıca *beynin* yoq (69); Qafil başın ağrısın *beyin* bilür (32).

BEYRƏK xüs.is. Şəxs adı. *Beyrək* gəldi (54); Aradan *Beyrəgi* götürəlim (124); *Beyrəgə* kağız göndərdilər (124).

BEL is. Bel. Ata adını yürütmiyən xoyrad oğul ata *belindən* enincə enməsə yeg (23); ◇ beli qurumaq, hərəkətsiz olmaq. Tura-tura *belümiz qurıdı* (42); belini üzmək, əziyyət çəkmək. Qızcığazın *belini üzər*, yer altında qızcuğazıma binərmiş (117).

BELLÜ sif. Belli. Qırq incə *bellü* qız ilə boyı uzun Burla Xatun yesir getdi (42); [Boyu uzın Burla] qırq incə *bellü* qızun içinə girdi, ögüt verdi (46).

BELÇAQ is. B a x: Balçaq. Oğlan sərmərdi, uru turdı Qılıncının *belçağına* yabışdı kim, bunı çırpa gördi kim əlində qopuz var (114).

BECİD z. Cəld, tez. Oğul, sən mala *becid* ol yığ mən sana qız arayı gedəyim, -dedi (85).

BEŞ say. Beş. Ağ alnında *beş* kəlmə dua qıldıq, qəbul olsun (97); Baybörənin oğlı *beş* yaşına girdi (53).

BEŞİK is. Beşik. Şah Həsənlə Hüseynin *beşigi* ağac (48); *Beşikdə* qoyub getdigim qardaşcığımmısan? (114); Mərə kafərlər bu ərəbəyi *beşigim* sandım (116).

BEŞİKKƏRTMƏ sif. Beşikkərtmə (etn.körpəlikdən qızla oğlanı nişanlamaq). Bəglər, Allah-təala mana bir qız verəcək olursa, siz tanıq olın mənim qızım Baybörə bəg oğlına *beşikkərtmə* yavruqlu olsun...(52); Baqdı-gördi bu otaq Banıçiçək otağıymış ki, Beyrəgin *beşikkərtmə* nişanlısı, adaxlısıydı (54).

BEŞ YÜZ say. Beş yüz. *Beş yüz* Oğuz yigitləri şəhid oldı (50); Evnik qalasının *beş yüz* kafəri üzərimizə qoyıldı (53).

BƏBƏK is. Körpə uşaq, övlad. Sən gəlürsən, bir *bəbəgün* görünməz (91); Anun kibinin, xanım, *bəbəkləri* bitməsün (33); Ağca yüzli yengəmi tul eləmişsən Ala gözlü *bəbəklərin* öksüz qomışsan (103).

BƏQA sif. ər. Daimi, əbədi. Disə bişmiş ətməgün *bəqası* olmaz, yemək gərəkdir, övrət aydar...(33)

BƏDƏVİ sif. ər. Harın, cins at. *Bədəvi* atının boynın qucaqladı, yerə düşdi (37); Oğlı Uruz cilavsını çəkdirdi. *Bədəvi* atın oynatdı, qarşu gəldi (69).

BƏYLİK is. Bəylik. *Bəyligə* usanmadım, yigitligə toymadım (80).

BƏZİRGAN is.f. Sövdəgər, tacir. *Bəzirganlar* dəxi gecə-gündüz yola girdilər (52); *Bəzirganın* ulusu tutıldı, keçisi qaçaraq Oğuza gəldi (53); *Bəzirganlar* yaraq gördilər (58).

BƏKLƏMƏK f. Gözləmək, qorumaq. Yol üzərində kafərin Aya Sofyası vardı. Keşişlər *bəklərdi* (119).

BƏG I is. Möhkəm. Əgni *bəg* dəmir tonun mana vergil (107); Qazan gördi kim, ləşgər ögincə bir ağ-boz atlu, ağ ələmlü *bəg* dəmür tonlu Oğuzun ögincə gəldi (110); Əgni *bəg* dəmir tonın geyən yigit, nə yigitsən? (120).

BƏG II is. Bəy. Təkur *bəyləri* cəm elədi (120); *Bəglər* həb ava bindi (54).

BƏGƏNMƏK f. Bəyənmək. [Dəli Qarcar] ayğırları görücək *bəgəndi* (57); Altımda Al ayğırım nə *bəgənməzsən*, - səni gördi oynar (108).

BƏGLƏRBƏGİ is. Bəylərbəyi. Ağ alınlu Bayındır xanun *bəglərbəgisi* Salur Qazan qartaşı Qaragünə çapar yetdi (108).

BƏGLİK is. Bəylik. *Bəgligə* toymadın Özümə yazıq (48); Xanlar xanı oğlana *bəglik* verdi, təxt verdi (41).

BƏLA is.ər. Bəla. Qadam-*bəlam* toqunar bu gün sana (80).

BƏLƏMƏK f. Bələmək. Tolma beşiklərdə *bələdügim* oğul (82).

BƏLİ əd. Bəli. "*Bəli*, oldur", -dedi (81); Dədə Qorqud: *Bəli*, mənim oğlumdur - dedi (54).

BƏLKƏ əd. Aruz aydır: "Xanım, ürkdigimiz vəqtin düşən mənim oğlancığımdır, *bəlkə*? -dedi (98).

BƏLLÜ sif. Aydın, aşkar, məşhur. İç Oğuzda, Taş Oğuzda adı *bəllü* Aruz oğlı xanım Basat, mana məded, - dedi. (100); Əgər böylə öldürməzsən, bir dürlü dəxi öldirəməzsən, *bəllü* bilgil, - dedilər (37).

BƏLÜRMƏK f. Bildirmək, aşkar olmaq. Yüzi-gözi *bəlürməz* (57); Ol gün cigərində olan ər yigitlər *bəlürdi* (77).

BƏLÜRSİZ sif. Bəlli olmayan. Gördilər kim, bir ibrət nəsnə yatur, başı-kötü *bəlürsiz* (98).

BƏLÜRTMƏK Bildirmək. Basduğın *bəlürtmiyən* bəllü Tənıri (96).

BƏN ş.əv. Mən. Mərə, *bənim* oğlım başını kəsdi, qanını dökdi? (54); *Bən* bu gün Qonur ata qaqaram (44); Azğun dinlü kafərə *bən* varayım (38).

BƏNCİLƏYİN əv.q. Mənim kimi. *Bənciləyin* qarusundan ağ əllərin bağladuban tonuz tamında yaturmı olur? (114).

BƏNZƏMƏK Bənzəmək. Qaza *bənzər* qızım-gəlinüm ağ çıqardı, qara geydi (75); İşdə sürilib gidəyürir və dəxi neçə buna *bənzər* söz söylədi (31); Qamusına *bənzəmədi* cümlə aləmləri yaradan Allah - Tənıri görkli (33).

BƏNZƏTMƏK Bənzətmək. Ulu qız qardaşı bunı Beyrəgə *bənzətdi* (62).

BƏNİZ is. Üz, çöhrə. Əzrayıla buyruq elədi kim, ya Əzrayıl, var, ol dəxi dəli qavatın gözinə görüngil, *bənzini* sarartğıl, - dedi (79); Əmma qızın dərdindən *bənizi* sarardı (98).

BƏRABƏR sif.ər. □ bərabər etmək - qarşı qoymaq. Bunın müdarası budur kim Qazanı çıqaravuz, anlara *bərabər* edəvüz (120).

BƏRƏ əd. B a x: Mərə. *Bərə* çoban, irağından yaqınından bərü gəlgil (43).

BƏRİ//BƏRÜ bəri (zərf mə'nasında). Dədəm Qorqud ötədən *bəri* gəldi (55); Mərə qavat, sən mənim qırımımsan, sən gəl *bərü* (126).

BƏRK sif. Bərk. Arqasın urıb, *bərk* ağılın ardın sökən (44); Əgnı̇i *bərk* dəmür tonım geyərdim (124).

BƏRKİTMƏK Bərkitmək. Ağılın qapusını *bərkitdi* (43).

BƏRLİ sif. Pərli: məc. Qanadlı. Altı *bərli* güz ilə dəpəsinə qatı tuta urdı (50).

BƏRÜ bəri, qoş. mə'nasında. Ərə varalıdan *bərü* dəxi qarnım toymadı, yüzim gülmədi...(33); Beyrək diri olsa, on altı yıldan *bərü* gəlürdi (58).

BƏS Bəs. Bəli, *bəs* ağ saqallu əziz baba evərmax gərək dedi (55).

BƏSƏRƏK is. Təkhürgüclü dəvə. Qanturalı aydır: Qatır - *bəsərəkmi* istər? (86).

BƏSLƏMƏK f. Bəsləmək; böyütmək. Qaçub gedərkən Aruz qocanın oğlancığı düşmiş, bir aslan bulup götürmiş, *bəsləmiş* (98); Süd ilə *bəsləyəlim* - dedilər...*Bəslədilər*, böyüdü, gəzər oldı (99).

BƏXT is.f. Bəxt. Bərü gəlgil, başum *bəxti*, evüm təxti (35).

BƏXŞİŞ is.f. Bəxşiş, hədiyyə. Bayındır xanın *bəxşişin* öginə dökdi (105).

BƏHA is.f. Qiymət, dəyər [Beyrək aydır]: Mərə Ozan, qopuzın mana vergil, atumu sana verəyim! Saqla gələm, *bəhasın* gətürəm, alam, -dedi (60).

BƏHADİRLİK is. İgidlik, bahadırlıq. Mənim ərligim, *bəhadirligim*, cilasunligim, yigitligim Ruma, Şama gedə, çavlana (79).

BƏHADIR is. İgid, bahadır, Oğul, sən qız istəməzmişsən bir cılasun *bəhadır* istəyirmişsən (85).

BƏHRİ sif. Mavi ...Atı *bəhri* hotazlı Qaragünə oğlu Qara budaq çapar yetdi (49).



BİD'ƏT is.ər. Adətdən xaric iş. Dirsə xanın oğlı böylə *bid'ət* işləmiş - deyələr (37).

BİZ əv. (şəxs əvəzliyinin cəmi). Qırq yigidlə Qazanın həlalını *biz* gətürmişiz (43); Mərə qavat, *biz* Qazana düşməniz (124).

BİZƏVAL sif.f.-ər. Daimi, əbədi [Yegnək] *bizəval* mə'budı ögdi (96).

BİZİMKİ Bizimki. Bolay ki, *bizimki* yenə dedilər (115).

BİKR sif.ər. Bakirə. Məgər kafər bəginin bir *bikr* qızı vardı (59).

BİLDİRMƏK f. Bildirmək. Qazan kəndüyü *bildirmədi* (121); Can tatlusın sana *bildirəyinmi*? (35).

BİLƏ ə. qoş. Birgə-birlikdə. Əlinin oğulları peyğəmbər nəvələri - Kərbəla yazısında yəzidilər əlində şəhid oldı - Həsənlə Hüseyn iki qardaş *bilə*, -görkli (32); İkisi *bilə* yola girdi (46); Əmma Taş Oğuz *bilə* bulınmadı (123).

BİLƏK is. Bilək. *Biləgündən* on barmağımı qanda gördüm (44); Gümüş kibi ağ *biləgin* açdı, əlin çıqardı (65); Qunt-qunt *biləklərin* solmasaydı, "Ağam Beyrək" diyərdəm, ozan, sana! (62).

BİLİK is. Bilik, ağıl. Mənim dəxi içində bir əqli şaşmış, *Biligi* yetmiş qoca babam var (41).

BİLİCİ is. Bilici. Oğuzın ol kişi təmam *bilicisiydi*, -nə diyirsə, olurdı (31).

BİLLAH ər.Billah. Qazan aydır: "Vallah, *billah*, toğrı yolı görərkən əgri yoldan gəlmiyəlim,-dedi (120).

BİLMƏK f. Bilmək. Ayru-ayru yollar izin dəvə *bilür*. Yeddi dərə qoxuların dilkü *bilür* (32); Oğlancuğın öldi *bilür* (393); Nə *biləyin*, oğul, bu qozalar sana nərədən gəldi? (39).

BİNDİRMƏK f. Mindirmək. Beyrəgi dəxi *bindirdilər* (125); Oğlanı ata *bindirdilər* (39).

BİNƏT is. Minik. Boynı uzun bədəvi atlar gedərsə bənim də içində *binədim* var... (41); Tavla-tavla şahbaz atlarım gətürüb durursan, sana *binət* olsun (48).

BİNİŞMƏK f. "minmək" fe'linin qarışıq-müştərək növü. Qazlıq atlar *binişdilər* (115).

BİNMƏK f. Minmək. Bəglər həb ava *bindi* (54); Sarb yürürkən Qazlıq ata namərd yigit binə bilməz, *binincə* binməsə yek (32); Bədəvi ata *binüb* oğlancuğın istəyi getdi (38).

BİN say. Min. *Bin* söyləsən, birisini quymaz ərin sözini qulağına qoymaz (33); Dəli Qarcar aydır: *Bin* buğra gətürün kim, maya görməmiş ola (56).

BİNAR is. Bulaq, çeşmə. Məgər evləri ögində bir böyük ağac vardı. Dibində bir yaxşı *binar* vardı (60); Beyrək baqdı gördi kim kiçi qız qarındaşı *binardan* su almağa gəlür (60); Ol *binara* pərilər qonmışdı (98).

BİN BİN say. On min. *Bin-bin* ərdən yağı gördümsə, oyunum dedim (117).

BİR 1) Miqdar sayı. Məgər xanım, Qazılıq qoca tutsaq olduğı vəqt bir oğlancığı vardı, *bir* yaşında idi (94); Oğul atanın yetiridir, iki gözinin *biridir* (31); 2) Qeyri-müəyyənlik bildirir. Bir ağzı dualının alqışı ilə Allah-təala *bir* əyal verdi (35); Məgər Dərsə xan deyirlərdi, *bir* bəgün oğlı-qızı yoxdı (34); *Bir* gün Qam Ğan oğlı xan Bayındır yerindən turmışdı (34).

BİR-BİR say. Bir-bir. Mərə qoyun başları ərkəc, *bir-bir* gəl, keç, - dedi (101); Qalın Oğuz bəglərini *bir-bir* atdan yıqan Qazılıq qoca oğlı bəg Yegnək çapar yetdi (77); □ Bir dəxi - bir də. Qazan burada *bir dəxi* soylamış (120); Dədə Qorqud *bir dəxi* soylamış... (32).

BİRƏ is. Birə. B a x: Bürə. *Birələr* Dəli Qarcara üyişdilər (57).

BİRƏLİ sif. Birəli. Aldı Dəli Qarcarı bir *birəli* yerə gətürdi (57).

BİRƏR s. Bir-bir. Bunın qapusuna *birər* gürz uralım, -dedi (120); Qapıya gəldilər: *birər* gürz urub qapıyı ovatdılar, içəri girdilər (120).

BİRİ əv. Biri (qeyri-müəyyən şəxs əvəzliyi). *Birinə* yapışdıq, qırq yerdən avaz gəldi (46).

BİRİN z. Bir-bir. Oğuz bəgləri *birin* gəlüb yığnaq olmağa başladı (34).

BİRİSİ əv. birisi (qeyri-müəyyən şəxs əvəzliyi). Ozan aydır: "Qarılar dörd dürlüdü: *birisi* soldıran soydır... (33).

BİRLİK is. Birlik, vahidlik. *Birliginə* sığındım əziz Allah, xocam, mana mədəd, -dedi (109); Tanrının *birliginə* yoqdır güman (56).

BİRÇƏKLÜ sif. □ ağ birçəklü - ağ birçəkli. Ağ *birçəklü* anan yanına vardın can verməd (82); Ağ *birçəklü* anası buldır-buldır ağladı (58); Ağ *birçəklü* qarının südin tutdı (37).



BİSƏRƏK - BİSƏRƏK. B a x: Bəsərək. *Bisərək-bisərək* dəvələrin qatarından, O zalım ayırdı ola, qardaş (100).

BİT is. Bit. Əski tonın *biti*, öksüz oğlanın dili acı olur (111); Qız bir oxla Qanturalıyı atdı, şöylə kim başında olan *bit* ayağına endi (91).

BİTƏKƏLLÜF sif. f.d. Qəflətən, birdən. Basat aydır: Mən muna *bitəkəllüf* yapışmayım, - deyüb kəndü qılıcın çıxardı, tutdı (102).

BİTMƏK f. 1) Böyümək, yetişmək. Üç yıladıq taşı düşdigi yerin otı *bitməzdi* (48); Qarşu yatan qarlı qara tağlar qarıyıbdur otı *bitməz* (49); 2) Yaşamaq. Yarımasun - yarçımasun Dəli Qarcar öylə mal istədi ki, heç *bitməsün*, - dedi (56).

BİTÜN sif. Kamil, həqiqi. Ol Məkkəyə sağ varsa əsən gəlsə, sidqi *bitün* hacı görkli (32).

BİXƏBƏR sif. f.-ər. Xəbərsiz. Beyrək ap-alaca gərdəgi içində yeyüb-içib *bixəbər* oturardı (57).

BİÇMƏK f. Biçmək. Qara polad uz qılıcım yoq kim qarvaşduğı dəm eki *biçəydim* (89).

BİCİ is.: □ *cici-bici* zəif, körpə. Pəs varasın bir *cici-bici* türkman qızını alasan, nagahandan tayanım üzərinə düşəm qarnı yırtıla? - dedi (85).

BİŞMİŞ f. sif. Bişmiş... Disə *bişmiş* ətməgün bəqası olmaz, yemək gərəkdür, övrət aydır...(33).

BİŞİRMƏK f. Bişirmək. Qıyma-qıyma ağ ətindən çəkün, qara qaurma *bişürüb*, qırq bəg qızına ilətün (46).

BIĞ is. Bığ. Qaradərə ağzında qara buğa dərisindən beşiginin yapuğı olan, acığı tutanda qara taşı kül eyləyən, *bığın* ənsəsindən yedi yerdə dügən, ərənlər əvrəni, Qazan bəgin qartaşı Qaragünə çapar yetdi (49); *Bığı* qanlu Bügdüz Əmən zəbun oldı (99).

BIĞÇAQ is. Bığ yeri. *Bığçaqı* qararmış yigitçikləri çoq yemişəm. Yigitlikləri tutdı ola, gözüm səni? (103).

BILDIR-BILDIR z. Bıldır-bıldır, muncuq-muncuq. Oğlan böylə dikəc *bıldır-bıldır* gözinin yaşı rəvan aldı (47).

BIRAQ xüs.is. İt adı. /İtüiz/ adı *Bıraq* degilmiydi? (64).

BIRAQMAQ f. 1) Qoymaq. Kəndüyü dəlülügə *bıraqdı*...(63); Vardı könləgi qana-quna baturdu, Bayındır xanın öginə gətürüb *bıraqdı* (58); 2) Almaq. Yayun qarusına *bıraqdı* (101); Çomağı omuzına *bıraqdı*, meydana vardı (107); 3) Yıx-

maq. Qaracıq çoban kafərin üç yüzini sapan taşilə yerə *bıraqdı* (43); 4) Atmaq, salmaq. Hələ Qazanı götürdilər, Tumanın qələsində bir quyuya *bıraqdılar* (116); Əgrəgi tutdılar. Əlincə qəl'əsinə - zindana *bıraqdılar* (110).

BIÇAQ is. Bıçaq. Oğlan *bıçağına* əl urdı (36); *Bıçaq* çıqarıb dərisini yüzdi (88).

BOĞAZ is. Boğaz. Xan qızı, yerimdən turayınmı? Yaqanla *boğazından* tutayınmı? (35); Qazan oğlı Urızı həbsdən çıqarun *boğazından* orğanla asun (47).

BOĞAZLAMAQ f. Boğazlamaq, öldürmək. Ayğır atım *boğazlayub*, aşum vergil (112); Dəf'i Basat qoçı basub *boğazladı*, dərisini yüzdi...(101); Basub eki yerdən *boğazladı* (50).

BOĞAZCA Boğazca (ləqəb): *Boğazca* Fatma diyərlər xatun vardı (64).

BOĞMA is. ◇ boğma çıqarmaq - boğma çıxarmaq. Bu dəli *boğma* çıxaracaq olunca eybimizi qaqdı (65).

BOĞULMAQ f. Boğulmaq. Ozan aydır: "Avazım gödəlmədin, ünim *boğulmadın* bir atdır, əlümə girdi, ilətim, saqlıyayım",-dedi (60).

BOZ sif. 1) Boz (rəng). Saqallu *boz* ac turğay sayradıqda ...; 2) Gənc, yeniyetmə. *Boz* oğlan yetdi. Bir-iki deməди, kafərlərə qılıc urdı (53); 3) Atın rənginə görə onun cinsini bildirir. *Boz* ayğırın çəkdirdi Beyrək bindi (54); Baybörənin oğlıyçun bir dəniz qulunu *boz* ayğır aldılar (52).

BOZLAMAQ f. Uca səslə ağlamaq. "Ağa" deyü nə ağlarsan, nə *bozlarsan*? (61); Mərə qız, nə ağlarsan-*bozlarsan* "ağa" deyü...(61); Baybörə bəg, niyə ağlayub *bozlarsan*? (52)

BOZLATMAQ f. 1) Böyürtmək (dəvəni). Dəvələrim *bozlatdılar* (123); Qaytabanın *bozlatdı* qaraqucın kişnətdi (90); 2) Uca səslə ağlatmaq. Baba deyü ağlatdılar, "ana" deyü *bozlatdılar* (71); Ağ birçəklü anan varsa *bozlatmağıl* (108); Ağ saqallu babasını, ağ birçəklü anasını ağladuban *bozladırmı* olur? (114).

BOZLAŞMAQ f. Uca səslə ağlaşmaq. Uşun qoca "Oğul, oğul" deyü ağca yüzli anasilə ağlaşdılar, *bozlaşdılar* (110).

BOZLAŞDIRMAQ f. Uca səslə ağlaşdırmaq. Qızıl dəvə gördügində *bozlaşdıran*...(44).

BOZMAQ f. Pozmaq. Qalın Oğuz bəglərindən əhdim *bozam*, derdim (103); Mənim avımı *bozma*, ləşgərimi tağıtma (44).



BOZ OQ etn. Boz oq (tayfa adı). Üç oq, *Boz oq* yığnaq olsa Qazan evin yağmaladardı (123); Üç oq, *Boz oq* qarşulaşdılar (126).

BOZULMAQ f. Pozulmaq. Gəlməz olsan, məmləkət *bozulıb* xarab olur (107); Bu yana yigit bəglər gördilər kim, av *bozulmış* (106).

BOY I Boy, qədd, qamət. Vardılar, Beyrəgin qaftanı varmış buna verdilər Aldı, geydi *Boyı boyuna*, beli-belinə, qolı-qolına yaqışdı (62); □ *boyı uzun* uzunboylu. *Boyı uzun* Burla xatunını götürüb sağraq sürdürmək gərək, - dedi (46); Məgər xanım, *Boyı uzun* Burla xatun oğlancuğını andı, qəran qalmadı (76); □ səlvi boylu sərv boylu. Evdən çıqub yüriyəndə *səlvi boylum* (35).

BOY II yan.. Alar sabah Dirsə xan qalqubanı yerindən uru turıb, qırq yigidin *boyına* alub Bayındır xanın söhbətinə gəlürdi (34); Qırq ala gözlü yigidin Uruz *boyına* aldı (69).

BOY III Dastan, hekayət. Bu *boy* Dəli Domrulun olsun (83); Salur Qazanın evi yağmalandığı *boyı* bəyan edər (42); □ boy boylamaq - dastan söyləmək. Dədəm Qorqut gəlübən *boy* boyladı, soy soyladı (51); Dədəm Qorqut *boy* boyladı, soy soyladı (41).

BOY IV Tayfa, qəbilə. Rəsul əleyhissəlam zəmanına yaqın Bayat *boyından*, Qorqut ata diyərlər bir ər qopdı (31).

BOYINCUQ is. Boyuncuq. Qıl kəpənək *boyıncuğın* sürər, deyəyinmi? (76).

BOYUN is. Boyun. Beyrək at *boynun* qucaqladı, qayıda döndi (121); *Boynı* uzun bədəvi atlar gedərsə, mənim gedər...(40); Bir əski dəvə çuvalı buldı, dəldi *boynına* keçürdü (63); □ boynını urmaq - boynunu vurmaq. Dəpəgözün kəndü qılıcilə *boynunu* urdı (103).

BOL sif. Bol, çox, zəngin. Südi, pendiri *bol* qaymaqlu çoban (43); Altun-aqça *bol* xəzinəni kafər almış...(45); Ağır xəzinəm, *bol* aqçam götürüb durursan, sana xərclıq olsun (48).

BOLAY ki mod.söz. Olsun ki. Məgər bir qoca babam bir qarı anam var; gəl gedəlim, ikisindən biri *bolay ki*, canın verə... (81); Varayın, *bolay ki*, mana bir əsir verə...(81); Varayın, *bolay ki*, mana bir əsir verəydi, oğlancığımı qurtaraydım (99); *Bolay ki*, bizimki yenə, - dedilər (115).

BORI//BORU is. Boru, şeypur. Burması altun tuc *borular* çalındı (50); *Borı* çalındı, kos uruldı (126); Altun - tuc *borılar* ağrıldı (155); □ borı ağırtmaq - şeypur çaldırmaq. *Borı* ağırdıb köçdilər (119); Anlar dəxi çəri dərüb, *borı* ağırdıp Qazana qarşu gəldilər (126).

BORC is. Borc. *Borcluyı borcundan* qurtarğıl (35).

BORCLU sif. Borclu. *Borcluyı* borcından qurtarğıl (35); *Borcluyı* borcundan qurtardı (35).

BOSTAN is.f. Bostan. Bağ və *bostanın* zinəti su (44).

BOŞALMAQ f. Boşalmaq. Qarı bəglər ölmədin el *boşaldı* (91); Qız köşkdən baqardı, Taraqlığı *boşaldı*, gedisi mavıldı (87).

BOŞANMAQ f. Boşanmaq. Bu kərrə at oğlanın biləgindən *boşandı*, qaçdı (113).

BÖYLƏ əv. Belə. Qavat, mən bu işi tuysam, sana *böylə* gəlürmiydim (124); Anası oğlanın *böylə* dikəc Qazanın əqli başından getdi (74).

BÖYLƏLİKLƏ mod.söz. Beləliklə. *Böyləliklə* otuz iki kafər bəginün oğlunun başı bürc bədənində kəsilüb asılmış idi (85).

BÖYÜK sif. Böyük. Əlhəmdülillah, mənim oğlancığım *böyük* ər olmış... (120); Ağzı *böyük* xümrələr ortalığa salınmış idi (68).

BÖYÜK-BÖYÜK sif. Böyük-böyük. *Böyük-böyük* suların körpüsi ağac (48).

BÖYÜMƏK f. Böyümək. Yad oğlı saqlamaqla oğul olmaz, *böyüyəndə* salur-gedər, gördüm deməz (31); Məgər, xanım, Qazanın bir oğlancığı vardı, *böyüdü*, yigitcik oldı (118).

BÖKƏLƏK is. Heyvanları sancan bir növ milçək. Hey, oğul Qarcar, adama uş *bökələk* kibi bunludar (57).

BÖGÜRMƏK f. Böyürmək. Qadın ana, qarşum alub nə *bögrərsən*? (47).

BÖGÜRTMƏK f. Böyürtmək. İç Oğuz bəglərilə Qazan dopa dəpdi, Şöklü Məlikə həvalə aldı, *bögürdibəni* atdan yerə saldı (50); Dəmir qapu Dərvəndəki dəmür qapuyı dəpüb alan, altmış tutam ala göndərinin ucında ər *bögürdən* Qıyan Səlcük oqlı Dəli Dondaz çapar yetdi (49); Şöklü Məliki *bögürdibəni* Qazan bəg atdan saldı (66).



BÖGÜRÜ-BÖGÜRÜ zərf. Böyürə-böyürə. Böylə digəc, qırq yigidi qaba sarıqların götürdilər, yerə çaldılar, *bögürü-bögürü* ağlaşdılar, zarılıq qaldılar (59).

BÖGÜRÜŞMƏK f. Böyürüşmək. Muradına-məqsudına irməyən yalnuz qardaş! - deyib ağlaşdılar, *bögürüşdilər* (58).

BÖLMƏK f. Bölmək [Qılıcı] iki parə *böldi* (102).

BÖLÜK is. Hissə, topa. Mərə, Oğuzdan bir *bölük* atlı gəldi (91). Keyik olsa, bir, ya iki *bölük* olurdı (69).

BÖRK is. Papaq. Başındağı tuğulqanı nə ögərsən, mərə kafir? Başımdağı *börkümcə* gəlməz mana (43); Bəg yigit, baş olsa *börk* bulunmazmı olur (91).

BÖRKLÜ sif. Papaqlı. Qafalı-*börklü* başın kəsməyincə...qomazım dedi (103).

BÖHTAN is.ər.Böhtan. Ögünməklik övrətlərə *böhtandır* (91).

BU əv. Yalan söz *bu* dünyada olınca olmasa yeg (32); Aruz, mana *bu* işi edəcəgin bilsəydim, Qaraqucda Qazlıq atuma binərdim (124); Bəglər, *bu* günki bəgligim bunın olsun (64).

BUQAĞU is. Buxov, qandal. Ağır *buqağu* topucağın dögər, degil (75); Ağır *buqağu* topucağın dögər, deyəyinmi? (76).

BUĞA is. Buğa. Məgər, xanım, Bayındır xanın bir *buğası* vardı, bir dəxi buğrası vardı (36); Bu məhəldə dəmür zəncirlə *buğayı* gətürdilər (87).

BUĞAC Buğac (şəxs adı). *Buğac* bəg yerindən uru turdı(40); Bir buğa öldürmiş sənin oğlın adı *Buğac* olsun (36); *Buğac* xan çapub yetdi (40).

BUĞACIQ MƏLİK Buğacıq Məlik (şəxs adı). Sol tərəfdə *Buğacıq Məlikə* Qarabudaq qarşu gəldi (77).

BUĞIR is. Erkək dəvə. Yanaşub yola girəndə qara *buğır* görkli (33).

BUĞRA is. Erkək dəvə. Genə toy edib atdan-ayğırdan, dəvədən *buğra*, qoyundan qoç qırdırmışdı (34); Qaytabanın *buğrası* ürkdi, gedər (112).-

BUD is. Bud. Basat Dəpəgözün *budı* arasından sıçrayub çıqdı (101); Qolı, *budı* xırancə, uzun baldırları incə, Qazan bəgün tayısı At ağızlu Uruz qoca çapar yetdi (50).

BUDAQ I is. Budaq. Ağ qovağın *budağından* yırğayuban keçmişsən (63); Qaba ağacla tal-*budağın* qurımışdı, yaşarıb gögərdi, axır (11).

BUDAQ II xüs.is. Budaq (şəxs adı). *Budaq* aydır: "Bunda laf urub nedirsən?" (94); Cilasun yigitlərlə Qaragünə oqlı Dəli *Budaq* soldan dəpdi (50).

BUZ is. Buz. Ağzım içi *buz* kibi, sünüglərim tuz kibi oldı (80); Qışda-yazda qarı-*buzı* ərinməyən Qazılıq tağına gəldi çıqdı (38).

BUZAĞI is. Buzov. Buğa, buğa dedikləri qara inək *buzağısı* degilmidir? (88).

BUY Buy (nida). Qısırca yengə "*Buy*, bu zavala gələcək dəlü bəni görmiş kibi söylər", -dedi (64).

BUYNIZ is. Buynuz. Ol buğa qatı taşa *buynız* ursa un kibi ügidərdi (36).

BUYRUQ is. Buyruq, əmr.Bayındır xandan *buyruq* böylədir xanım, -dedilər (34); Tən$_1$rinin *buyruqilə* peyğəmbərin qovlilə aydan arı, gündən görkli qız qardaşın Banıçiçəgi Bamsı Beyrəgə diləməgə gəlmişəm, - dedi (56); □ buyruq etmək - əmr etmək. Baybörə bəg bazırganlarını yanına oxıdı, *buyruq* etdi (52); □ Buyruq eləmək. Buyruq eləmək. Əzrayılə *buyruq* elədi kim, ya Əzrayıl var ol, dəxi dəli Qavatın gözinə görüngil, bənzini sarartğıl (79).

BUYURMAQ f. Əmr etmək. Hər nə kim *buyursa*, qəbul edərlərdi (31); Qara hindu qullarıma *buyuraydım*, Səni para-para toğrıyalardı, ağac! (48).

BULAŞMAQ f. Bulaşmaq. Qara qana *bulaşdı*, bunlu oldu (125); Aruz qara polad uz qılıcın tartub Beyrəgin sağ oyluğın çaldı, qara qana *bulaşdı* (125).

BULDIR-BULDIR zərf. B a x: Bıldır-bıldır. *Buldır-buldır* gözlərinin yaşı aqar (64); Beyrəgə qatı fəraq gəldi, qatlanmadı, *buldır-buldır* gözinin yaşı rəvan oldı (61).

BULINMAQ f. Olmaq, tapılmaq. Bir mənim kibi oqul *bulunmazmı* olur... (47); Əmma Taş Oğuz bilə *bulınmadı* (123).

BULIT is. Bulud. Qara *bulıt* dedigin sənin dövlətindir (44); Asmanlu gögdə qara *bulut* oluban kafərin üzərinə gurlıyayım (76).

BULIŞMAQ f. Rast gəlmək, qabaq-qabağa gəlmək,görüşmək. Eki həsrət bir-birinə *bulışdılar* (97); Ağır adlu şəhərlərdən gəldügində, Beyrək adlı bir yigidə *bulaşmadınmı* (61); Bəglər, qardaş uğrına Dəpəgöz ilə *buluşuram* (100).

BULMAQ f. Tapmaq, rast gəlmək. Dilək ilə bir oğul güclə *buldum* (38); Qara gərdunda *bulduğum* oğul qanı? (38); Baybörə bəg aydır: Dədə, mən üçini *buluramsa*, ikisini sən *bulurmısan*? -dedi (56).

BUNCILAYIN əv. Bunun kimi. Ocağına *buncılayın* övrət gəlsün... (33).

BUN$_1$ is. Sıxıntı, kədər, fəlakət, bəla. Qalın Oğuz bəglərini *bun$_1$dan* qurtardın (103).

BUN$_1$ALMAQ Aciz qalmaq, sıxıntılı olmaq. Av avlıyıb quş quşluyub gəzərkən *bun$_1$aldı* (106); Azğun dinlü kafər *bun$_1$aldı*, oxa girdi (71); Üç yerdə yaralandım, qara başım *bun$_1$aldı*, yalnuz qaldım (46).

BUN$_1$I is. Qasırğa. Yel əsdi, yağmur yağdı, *bun$_1$ı* qopdı (95).

BUN$_1$LU sif. Sıxıntılı, bəlalı. Ağ saqallu babam *bun$_1$lu*, -dedi (107); Dədə Qorqud: Hey oğul Qarcar uş bökələk kibi *bun$_1$ludur* (57); Bunlu yerdə qodım gəldim Otuz toqquz yoldaşım, iki arğışım (63); □ *Bunlu* olmaq, sıxıntılı olmaq. Qazan *bun$_1$lu* oldı (123). *Bunlu* qalmaq - sıxıntılı olmaq. Qara başı *bun$_1$aldı*, *bun$_1$lu* qaldı (80).

BUN$_1$LU QOCA. *Bun$_1$lu* qoca (şəxs adı). *Bun$_1$lu qoca* ilə Yapağlu qocayı ana xidmətkar verdilər (100).

BURAQMAQ B a x: Bıraqmaq. Kafərləri it ardına *burağıb* zorlıyan... İlək qoca oğlı Alb ərən çapar yetdi (50).

BURADA zərf. Burada. Beyrək Aruz qaqdığın *burada* bildi (124); Qazan bəg *burada* yurdlən xəbərləşmiş, görəlim, xanım, nə xəbərləşmiş (44).

BURMA sif. Burma. *Burması* altun tuc borular çalındı (50); Bir zaman ayıtma, ozan, ağam Beyrək gedəli bizə Ozan gəldügi yoq...Buynuzı *burma* qoçlarımız alduğı yoq (62).

BURUN is. Burun. *Burnından* qanı düdük kibi şorladı (109); Oğlancıqların kiminün *burnın*, kiminün qulağın yeməgə başladı (99).

BURÇUQ-BURÇUQ. Puçur-puçur. Baqdı gördi kim, ayun on dördinə bənzər bir məhbub, ala gözli gənc yigit *burçuq-burçuq* dərləmiş uyur (113).

BURCLU sif. B a x: Bürc. Ağca *burclu* hasarlarda tutılaydın, oğul (82).

BURCUQ. Yarı. Yedi bin qaftanının ardı yırtıxlu, yarımından qara saçlu, sası dinlü din düşməni alaca atlu kafər bindi, yılğadı, dün *burcuğında* Qazan bəgin ordısına gəldi (42).

BUSTAN is. f. Gül bağı. İbrahimi tutdurdun, Xam gönə çulğadun, götürüb oda atdurdun, Odı *bustan* qıldun (108).

BUTA Nişangah. □ buta atmaq - nişangah qoyub atmaq [Dəli Qarcar] yoldaşlarilə *buta atub*, oturardı (55).

BUTUN Tez. Yalısı qara Qazlıq atın *butun* bindin (38).

BÜDƏ zərf. Tez. Şahbaz ayğırın çəkdirdi, *büdə* bindi (104).

BÜDRƏMƏK f. Büdrəmək. Çaparkən ağ-boz atın *büdrəməsün* (51).

BÜKƏC is. Axta (?). Qarma *bükəc* sümüzün alıb tutan (45).

BÜRƏ is. Birə. Bin dəxi xaraca-qaraca *bürələr* dilədi (56); Bin dəxi *bürə* gətürün mana dedi (56); İmdi, Dədə, köpəklə *bürəyi* sən bul... (56).

BÜRÜMƏK f. Bürümək. Cübbəsin üzərinə *büridi* (106).

BÜRÜNMƏK f. Bürünmək. Qırq cübbə *bürünüb* otuz yedi qəl'ə bəyinin məhbub qızlarını çalub bir-bir boynın qucan, yüzində todağından öpən İlək qoca oqlı Alb Ərən çapar yetdi (50).

BÜRC is. Bürc. Basub öldürməsə anun başını kəsirlər, *bürcə* asarlar (86); Qoşa *bürcdən* qayın oqı əklənməyən Yağrınçı oqlı İlalmış səninlə bilə varsun... (95); Ağ hasar qəl'əsinin *bürcün* yıqdım (116).

BÜT is. Bud. *Bütünə* ala ox toxunsa, əgilməz idin (106).

BÜTÜN I əv. Bütün. Otuz iki dişdən çıqan *bütün* orduya yayıldı (106).

BÜTÜN II zərf. Tez. Qazlıq atın *bütün* binən, Nə yigitsən adın nədir degil mana (121); Boynı sınsun Al ayğırı *bütün* bindim (42); Yelisi qara Qazlıq atın *bütün* bindi (105).

BÜTXANA is.f. Bütxana. Kafər: Sənün bir Tənıri varsa. mənüm yetmiş iki *bütxanam* var, - dedi (109).



# V

VAQEƏ is.ər. Yuxu: Gecə yaturkən Qaracıq çoban qara qayğulu *vaqeə* gördi (43).

VAY nida. Təəssüf, kədər, ağrı kimi hisslər ifadə edir: "*Vay*, bəgim qartaş! Muradına-məqsudına irməyən yalnıuz qardaş!" -deyib ağlaşdılar-bögürişdilər (58).

VALLAH nida ər. Allaha and olsun (inandırmaq üçün deyilir): *Vallah*, yəxşi yigit, mürüvvətlü yigit! -dedilər (53).

VAR is. 1) mövcud: Sən *var* ikən av avladı, quş qoşladı (37); 2) bütün, olan. Qaftanı altından ayağın bərk sardı (at) *var* qüvvətilə atınını yelisinə düşdi (105).

VARLIQ is. Mövcudluq; var olma: Ya qadir Allah, birligin, *varlığın* haqqıçün, Əzrayili mənim gözümə göstərgil... (79)

VARMAQ f. Getmək: Ağ saqallu babanı yanına *vardın*, can vermədi (82).

VASİL is. ər: Vasil olmaq - çatmaq, qovuşmaq: Beyrək padşahlar padşahı haqqə *vasil oldı*, bəllü bilsün! -dedi (125).

VAF-VAF səstəqlidi söz. İtin hürməyini bildirir: Qaranqu axşam olanda *vaf-vaf* ürən! (45).

VAFİR sif.ər. Bol: Yaxşı at, yaxşı qaftan, *vafir* xərclıq verdi (104).

VERƏG is. Dayaq: Güz almasına bənızər al yanaqlım! Qavunım, *verəgim*, döləgim! (35).

VERİŞMƏK f. qarş. n. Alver etmək: "*Verişməgə* - alışmağa gəldik", - dedilər (87).

VERMƏK f. Bir şeyi başqasına ötürmək, çatdırmaq. Qadir Tənıri *verməyincə* ər bayımaz (31).

VƏ bağlayıcı. ər. Sadə cümlələrdə həmcins üzvləri, mürəkkəb cümlələrdə isə onun tərkibinə daxil olan cümlələri bir-birinə bağlayır: həm şimdi nə yeərsən, nə içərsən *və* nəyə binərsən? -dedi (116).

VƏQT is.ər. Zaman, vaxt: Ölülərinıə aş verdigin *vəqt* əllərindən aluram (116).

VƏ'DƏ is. ər. Bir iş üçün qabaqcadan tə'yin olunan vaxt, müddət: Əcəl *və'də* irməyincə kimsə ölməz (31); □ Və'də eyləmək, və'də vermək: "Hər kim ol üç canvəri basa yenısə, öldürsə, qızımı ona verirəm", - deyü *və'də eyləmişdi* (85).

VƏ YA bağlayıcı, ər. B a x: və bağlayıcısı: ya qara buğranın₁ köksi altında qalam! *Və ya* buğanın₁ buynuzında ilişəm (86-87).

VƏZİR is., ər. Padşahın məsləhətçisi olub dövlət işlərinə baxan şəxs; nazir: Bayındır xanın *vəziri* idi (94).

VƏSİYYƏT is.,ər. □ vəsiyyət eylə - ölərkən, yaxud sağ ikən tapşırmaq, son arzusunu bildirmək: həm *vəsiyyət eyləmiş*, "Mənim qanım qomıyasan, alasan", - demiş (125).

VƏTƏN is.,ər. Bir adamın doğulub böyüdüyü və vətəndaşı olduğu ölkə, məmləkət, doğma yurd: Bərdəyə, Gəncəyə varub *vətən* tutdı (104).

VƏCH is., ər. Yol, üsul, vasitə, tərz, qayda (adətən "ilə" qoşması, yaxud "-lə" şəkilçisi ilə işlənir): Dədə Qorqud aydır: "Bu *vəchlə* sən adam qomaz, dükədərsən",-dedi. (99)

VİLAYƏT is. ər. Kəramət: Zira Dədə Qorqut *vilayət* issi idi, diləgi qəbul oldı (56).

## Q

QAB B a x: qaba. □ Qab qayalar başında yuva tutan, Qadir ulu Tən₁riyə yaqın uçan (89); *Qab qayalar* oynamadın yer obruldı (91).

QABA sif. 1) Böyük, yekə. Güni gəldi, *qaba* qarın gen köksdə oynadam sənin içün! (70); 2) Böyük, kobud, ağır. Güni gəldi, *qaba* çomaq altında yoğradım sənin içün (70).

QABA AĞAC antrop. 1) Qüdrətli, müqəddəs Ağac: Qədim oğuzlarda Ağac təbiətin canlanma simvolu olaraq müqəddəs sayılmışdır. Görünür, elə bu baxımdan da "Qaba Ağac" ad birləşməsi yaranmışdır: Anam adın sorar olsan, -*Qaba Ağac*. Atam adın dersən - Qağan Aslan (102); 2) Köklü-gövdəli, möhkəm bir ağac: Qaraca Çoban zərb eylədi, qaba ağacı yerilə-yurdilə qopardı (46).

QABA-QABA sif. Varlı, dövlətli bəglər. *Qaba-qaba* bəglər oğlı qovğa qılsa, Qamçı salub tökdürən Qazan ər idim (117).

QABANGÜCİ, antrop. Qaraca Çobanın qardaşının adı: *Qabangüci* Dəmirgüci - bu iki qardaşı yanına aldı (43).

QABIRĞA//QAPURĞA, is. (anat.): Qabırğa. *Qapurğasın* qarnına qavşurdı (117).

QAVAT sif. Əbləh, yaramaz: Mərə *qavatlar*, nə ağlarsız?,-dedi (79); Banıçiçək otaqdan bağırdı: Mərə dayələr, bu *qavat* oğlı *qavat* bizə ərlikmi göstərir?, -dedi (54).

QAVUN is. Qadın. *Qavunım*, verəgim, dələgim (53)

QAVRAMAQ f. Əlini keçirmək: *Qavradı*, qızın bağdamasın aldı (55).

QAVŞIRMAQ f. Əl uzatmaq: Əl *qavşırıb*, ol yigidə səlam vergil (111).

QAQINC is. Başa qaxmaq. ◇ Qaqınc qaxmaq. Qalın Oğuz bəgləri...bənim başıma *qaqınc qaxarlar* (58).

QAQMAQ, f. Qalxmaq, atın belinə qalxmaq: Bən bu gün qonur ata *qaqaram*, üç günlük yolı bir gündə aluram, evilə olmadın yurdum üstünə vararam (44).

QAĞAN I ("qağan-aslan") -qədim tarixdə ulu dövlət başçısı, Xaqan. Xalq arasında indi də ata-babaya və ya böyük qardaşa müraciətlə işlənən "qağa" sözü əsatiri bir relikt olmaq e'tibarilə buradandır (S.Ə.,261)

QAĞAN II (zool.). Vəhşi, yırtıcı. □ Qağan aslan. Vəhşi. Ol üç canvərin biri *qağan aslandı*, biri qara buğaydı (85).

QADA is. Bəla, dərd, fəlakət. ◇ Qada yazmaq. Fəlakət. Qadir sənin alnuna *qada* yazsun, Çoban,-dedi (45); Qada-bala. Dərd-bəla, qarğış. *Qada-bəlam* toqınar bu gün sana, -dedi (80); Qadası yetmiş. Əcəli çatmış. *Qadası yetmiş* qavat oğlı, qavat (108).

QADİR sif. ər. Qüdrət sahibi, yaradan. *Qadir* sənin alnuna qada yazsun, Çoban,-dedi (45); □ Qadir Allah. Qüdrətli Allah. Ay əməli azmış, fe'li dönmüş, *Qadir* Allah ağ alnına qada yazmış (56); Qadir Tən₁ri: qüdrətli yaradan. *Qadir* Tən₁ri verməyincə ər bayımaz (92).

QADIN//QADUN is. □ Qadın olmaz, ləyaqət sahibi olmaz. Qaravaşa ton geyürsən qadın olmaz (31). □ *Qadınım ana* (qadın ana). Ana adına söylənilən siyasi-ictimai titul; abidənin yarandığı dövrdə ananın cəmiyyətdə el başbiləni, xaqan və bəy ailə sistemində böyük şəxsiyyət olduğuna işarədir. Bərü gəlgil, ağ südin əmdigim, *qadınım ana* (39).

QAZ zool. Əti yeməli çöl quşu. Uçardan *qaz*, tauq, yürürdən keyik, tavşan bu hələyə toldurub, Oğuz yigitlərinə bunı

dam etmişdi (110); ◇ Qaza bənzər (məc). Gözəl gəlin. *Qaza bənzər* qızı-gəlini ağ çıqarub qara geydi (110).

QAZAN Qalın Oğuz dövlətinin başçısı. Bir gün Ulaş oğlı Tülü quşun yavrısı, bizə miskin umudı, Amit soyının, aslanı, Qaracuğın qaplanı...Qalın Oğuzın dövləti...arqası Salur *Qazan* yerindən turmışdı (42).

QAZANMAQ f. Gördüyü işinə görə nəyə isə nail olmaq; ◇ Ad qazanmaq. Çöldi alubdır, *ad qazanıbdır* (69).

QAZILIQ//QAZLIQ is. ər. I vəz. Qazi, hakim. ◻ Qazılıq atası. Atası hakim olan: Qarağucda *Qazlıq* atası bundan keçdi (73); ◻ Qazılıq qoca. Qoca Qazı: Sol yanında *Qazılıq Qoca* oğlı Uruz turmuş idi (52); *Qazılıq Qoca* iş görmüş, iş yarar adam idi (94); ◻ Qazlıq atı. Qazının atı: Yaralanub *Qazlıq atımdan* enməyincə (38).

QAZLIQ TAĞI top. Qafqaz dağları [V.V.Bartold]. Nə *Qazlıq tağı*, aqar sənin suların? Aqar kibi, aqmaz olsun (39); Qaçar keyiklərinə qarğamağıl, *Qazlıq tağının* suçu yoqdur (39).

QAİM sif.ər. Möhkəm. Ol gün qarğu dillü *qaim* oxlar atıldı (71).

QAYA is. Qaya. Çığnam-çığnam *qayalardan* çıqan su. Asılan-asılan *qayalardan*, Qazan, oğlan uçurdınmı? (72)

QAYĞI//QAYĞU is. Narahatlıq. Saç *qayğudur* (44).

QAYĞILI//QAYĞULI sif. Qorxulu. ◻ Qayğulu vaqiə. Qorxulu yuxu. Gecə yaturkən Qaracuq Çoban qara *qayğulı* vaqiə gördi (43); Qayğulu Çoban. Narahat Çoban: Qarangu axşam olanda *qayğulu* Çoban (43).

QAYƏT z.ər. Çox. Qazan *qayət* səxt oldı (116).

QAYI//QAYU, top. Qədim Oğuz qəbilələrindən birinin adı. Axır zəmanda xanlıq gerü *Qayıya* dəkə, kimsənə əllərindən almaya (31).

QAYIN is. Qayın ağacı. *Qayın* oxı atanlar kar qılmadı (100).

QAYINANA qoh.t. Ər və arvadın anası. Qız bildi kim, *qayınanası, qayınatasıdır* (91).

QAYINATA, qoh.t. Qayınata. *Qayınata* muştuluq mana nə verərsiz? - dedi (66).

QAYURMAQ f. Fikir, dərd-qəm çəkmə. Qorqma, *qayurma*, bəg sərxoşdur, cavab verəməz, - dedilər (38); Mənim xud qardaşım varmış, *qayursam* olmaz (111).



QAYITMAQ f. Getməmək, geri qayıtma. Dərsə xanın xatunı *qayıtdı* gerü (38); ◇ Qayıda döngil. Geri qayıt, getmə. Mərə, qəzası yetmiş yigit, *qayıda döngil*, -dedi (92).

QAYIŞ is. Qayış. Arqasından iki *qayış* çıqardı (90).

QAYMAQLI//QAYMAQLU sif. Südi, peniri bol, *qaymaqlu* çoban (43).

QAYNAQ is. Caynaq. Ya qağan aslanın *qaynağında* didiləm (87).

QAYNAMAQ f. 1) Əsəbiləşmək: Qan tamarları *qaynadı* (44); 2) (məc.). Məgər sənin ağan yoq olubdur? Yüreginə *qaynar* yağlar qoyulubdur (61).

QAYTABAN zərf. Dəvələrin saxlandığı yer. *Qaytabandan* qızıl dəvə vergil, bu oğlana, Yüklət olsun, hünərlidir (36); ◇ Qaytabanın bozlatmaq. Dəvə yatağına səs-küy salmaq. *Qaytabanın bozlatdı*, qaraquçın kişnətdi (90).

QALABA sif. Böyük. ◻ Qalaba ölkə. Böyük yer-yurd: Cılasun qoç yigitlərə *qalaba ölkə* vergil (50).

QALARDA-QOPARDA, qoş.s. Buralarda, bu yerlərdə. *Qalarda-qoparda*, yigit, yerin nə yerdir? *Qalarda-qoparda* yerim Günortac, - dedi (102).

QALQAN//QALXAN Qalxan. Ap-alaca *qalqanın* vergil mana (46) ◇ Qalqan oynatmaq. Qalxan döyüşündə məşhur olan. Yağrınanda *qalqan oynar* babasının$_1$, qadir qoursa, başın$_1$ kəsəyim (86).

QALQMAQ f. 1) Ayağa durub harasa getmək; Beyrək *qalqdı*, ağlayu-ağlayu qırq yigidin yanına gəldi (59); 2) Bir hərəkəti icra etmək məqsədilə qalxmaq. Boğazca Fatma deyərlər, bir xatun vardı, *qalq*, sən oyna,-dedilər (64), Aydır: Xanım, məqsudim oldur ki, ərə varan qız *qalqa*, oynaya, mən qopuz çalam, -dedi (64); 3) Hazır olmaq. Aydır: *Qalqubanı* yigitlərüm, yerünüzdən uru turun (34); ◇ Qalqub şişmək (məc.). Qubarlanmaq mə'nasında. Sarı yılan soqmadın ağca tənim *qalqub şişər* (38).

QALİ//XALİ is. Xalı. ◇ Qali döşəmək. Oturulası otaqlara xalı sərmək. Ağ çadır dikdilər, ala *qalı döşədilər*, ağca qoyun qırdılar, yedi yıllıq al şərab içürdilər (87).

QALIN sif. 1) Varlı-dövlətli. *Qalın* Oğuz bəglərinə sağraq sürüb içərlərdi (42); *Qalın Oğuz dövləti*. Böyük oğuzların dövləti. Məgər xanım, ol gecə *Qalın* Oğuz dövləti, Bayındır xanın

göygüsi, Ulaş oğlı Salur Qazan qara qayğulu vaqiə gördi (44); 2) Kobud, təkəbbürlü, hiyləgər: Alubanı *qalın kafər* əllərinə yönəldilər (40).

QALMAQ f. 1) Var olmaq, daimi, həmişəlik. Qanı dedigim bəg ərənlər? Dünya mənim deyənlər? Əcəl aldı, yer gizlədi, Fani dünya kimə *qaldı* (50); 2) Nəsli kəsilmək. Bir gün ola düşəm öləm, yerimdə-yurdumda kimsə *qalmaya,* -dedi (52); 3) Varis. Bir gün ola düşəm öləm, sən *qalasan* - yay çəkmədün, ox atmadın...(69); 4) Təəccüb. Bazırganlar ardından *baqa qaldı* (53); 5) Ağır vəziyyətə düşmək: həq- təalanın əmrilə Dəli Qarcarın əli yuqarıda asılu *qaldı* (56); 6) Xilas etmək: Qazan aydır: Qaracıq Çoban, anamı kafərdən diləyəyim, at ayağı altında *qalmasun,* - dedi (48); 7) Ardı. Qalanısın yora bilmən, Allah yorsun, - dedi (44).

QALMAŞ antr. Oğuz bəylərindən birinin adı. İlək Qoca oğlı Sarı *Qalmaş* Qazan bəgün evi üzərinə şəhid oldu (43).

QALDIRMAQ f. Allaha üz tutub dua etmək. ◇ Əl qaldırmaq. Qalın Oğuz bəgləri *əl qaldırdılar,* dua eylədilər (52).

QAM antr. Qədim türklərdə kahin deməkdir. Burada Bamsı Beyrəyin atası. *Qam börənin* oğlı Bamsı Beyrək boyını bəyan edər, xanım, hey...(52); *Qam Ğan oğlı* xan Bayındır yerindən turmışdı (52); Bir gün *Qam Ğan oğlı* yerindən turmışdı (34).

QAMIN//QAMƏN sif. Gur. *Qamən* aqan görkli suyın qurumasın (41); *Qamın* aqan yügrək sudan bir oğul aqıtdınsa, dəgil mana (38).

QAMIŞ is. Qarğı şəkilli bitki. Kafəri *qamış* kibi od aluban yandırayım

QAMU əvəz. Hamı. *Qamu* yerdə Əhədsən (96).

QAMÇI is. Qamçı, döymək vasitəsi. *Qamçı* ilə işarət qılub, odaya düşün (91); ◇ Qamçı salmaq. Döymək. *Qamçı salub* tökdürən Qazan ər idim (117).

QAN is. Qan. Alca *qanın* yer yüzinə dökəyinmi? ◇ Qan tökmək. Qəhrəmanlıq göstərmək mə'nasında: Ol zamanda bir oğlan baş kəsməsə, *qan dökməsə,* ad qomazlardı (53); Qan qaynamaq (məc.). Səmimiyyət hissi keçirmək, tanımaq. Eylə olsa, xanım, Beyrəgin *qanı qaynadı,* ədəblə yab-yab gerü döndi (54); Qan qusdurmaq. Zülm etmək, məhv etmək. Varıban dəstursuzca Bayındır xanın yağısın basan, altmış bin kafərə *qan qusduran* Ğəflət Qoca oğlı Şir Şəmsəddin çapar yetdi (77); Qan yaş tolmaq. Gözləri dolmaq, qəhərlənmək; Bu halları gördügində Qazanın qara qıyma gözləri *qan-yaş toldı* (44); Qan tökmək. Burada qəhrəmanlıq, hünər, igidlik göstərmək. Əgrək aydır: Mərə, Tərs Uzamış, baş kəsüb, *qan tökmək* hünərmidir? - dedi (110).

QAN ABQAZ top. IX-XI əsrlərdəki Gürcüstan nəzərdə tutulur. *Qan Abqaz* əlinə mən gədərəm, Altun xaça mən əlümi basaram (68).

QANAD is. 1) Qanad. Gördi kim, pəri qızları *qanad-qanada* bağlayıb uçarlar (98); 2) Qol. Bıçaq alub *qanadlarım* qıran Qazan.

QANATMAQ f. Kəsib qan çıxartmaq. Oğlım idigin andan biləyim, sırça parmağını *qanatsun,* qanını dəstmala dürtsün, gözümə siləyin (66).

QANĞI əvəz. Hansı. Qanğınuza yapışurlarsa, Qazan bəgün xatunı *qanğınuzdur*? - deyü, qırq yerdən avaz verərsiz, -dedi (46).

QANDA əvəz. Harada, hara. Bu gün, yarın *qanda* isə gəlür (38).

QANI əvəz. Hanı. İki vardın, bir gəlürsən, yavrum *qanı*? (38).

QANLU QOCA antrop. "Kanlı" xalqımızın yaranmasında iştirak etmiş qədim soyköklərdən biri olan kəngərlərin qədim adıdır /S.Ə./. Abidənin dilində bu söz şəxs adlarında ehtimal ki, bu mə'nada xatırlanır. Əsərdə Qanturalının atasının adı. Oğuz zəmanında *Qanlı Qoca* derlərdi, bir gürbüz ər vardı (85).

QANRILMAQ f. Dönüb baxmaq. *Qanrıluban* baqışından Ağam Beyrəgə bənzədürəm, ozan, səni (62).

QANTURALI antrop. Qanlı Qocanın oğlunun adı. *Qanturalı* aydır: - Baba, mən yerimdən turmadan, ol turmuş ola (85).

QAPAQ is. 1) Hər hansı bir şeyin (qab-qacaq və s.) ağzını və ya üstünü örtmək vasitəsi, qapaq. Qalqanını ovatdı, tuğulqasını yoğurdı, *qapaqlarını* sıyırdı, oğlanı alımadı (108); 2) Göz qapağı. *Qapaq* qaldırdı, Dərsə xanın yüzinə baqdı (38); Nagah gözi *qapağına* qılıc toqundı (76).

QAPAQQAN is.antr. Oğuz qəbiləsi üzvlərindən birinin adı. *Qapaqqan* deyərlər, bir kişi var idi (99).

QAPIRĞALI sif. ("qabırğa" sözündən). Məc.: güclü, qüvvətli. İyəkülü ulalur, *qapırğalı* böyüyər (36).

QAPLAN is. Pələng. Aslana, *Qaplana* bir oğul yedirdinsə, degil mana. (38)

QAPMAQ f. Tezcə, cəld götürmək. Üç gündür qoşlığım yox! Oğul, at üzərindən məni *qap*, döşəgimə çıqar, -dedi (106).

QAPU is. Yedi yerdə *qapu* açıldı (102); Kərəm eylə, Allah eşqinə. *qapuyı* aç, çıqayın, - dedi (57).

QAPULU sif. Qapıları olan, qapılı. Kafər aydır: - Qazanın *Qapulu* Dərvənddə on bin qoyunu vardır (43); □ Qapulu Dərvənd. top.Dərbənd şəhərinin qədim adı. Qazanın *Qapulu Dərvənddə* on bin qoyunu vardır (43).

QAPAMAQ f. Örtmək, bağlamaq, tutmaq. Dəli Domrul aydır: Mərə qapuçılar, *qapunı* qapayın (80).

QAR is. Qar. *Qar* ilə yağmur yağanda ər kibi turan (45).

QARA I sif. Qara. Yalısı *qara* Qazlıq atın bütün bindin (38); *Qara* bağrı sarsıldı (38); Qanı *qaradır* (44); □ Qara bulut. Böyük Oğuz dövlətinin üzərinə gəlməkdə olan düşmən, qara qüvvə: Qaragünə aydır: *Qara bulıt* dedigin sənin dövlətindir (44); Qara qaplan. Vəhşi, yırtıcı; *Qara qaplan* qopdı Dəpəgöz (100); Qara qaurma. Qara qovurma. Qıyma-qıyma ağ ətindən çökün, *qara qaurma* bişirüb, qırq bək qızına ilətün (46); Qara qıyma göz. Orta Asiya və Şərqi Türküstan türklərinə məxsus gözlərə işarədir. *Qara qıyma gözlərin* uyxu almış, açğıl axı (39); Qara eyib (məc.). Böyük günah, böyük qüsur. Bu *qara eyib* bana ya bəndəndür, ya xatundandur, - dedi (34); Qara kəpənək. Orta əsrlərdə Azərbaycan etnoqrafiyasında çox geniş istifadə olunmuş, kişilərə məxsus qolsuz üst paltarı, çuxa: Oğlana *qara kəpənək* geydirmişlərdi (74); Qara gözlü. Gözəl, gözləri qara. Toquz *qara gözlü*, xub yüzli, saçı ardına urulu...kafər qızları Qalın Oğuz bəglərinə sağraq sürüb içərlərdi (42); Qara otaq. Qaranlıq otaq. Dədə Qorqud dastanlarının yarandığı dövrlərdən övlada, uşağa ailənin səadəti, işığı kimi baxmışlar; görünür, ona görə də övladsızlara bu cür münasibət yaranmışdır: Kimün ki, oğlı-qızı yoq, *qara otağa* qondurun, qara keçə altına döşəyin... demişdi (34); Qara polad. Böyük polad. Xalis polad. *Qara polad* üz (öz) qılıcım əlümə alayınmı? (35); Qara tonlu. Dərviş paltarı. *Qara tonlı* dərvişlərə nəzirlər verdim (38); Qara hindu qul. Hindistanın qara qulları. *Qara hindu qullarıma* buyuraydım, Səni para-para toğrayalardı, ağac. (48).

QARA II is. Gənc ömür, gənclik həyatı. □ Qara baş: *Qara başım* qurban olsun oğul, sana (39); ◇ Qara geymək. Matəm tutmaq, yas saxlamaq: Banıçiçək qaralar geydi, ağ qaftanını çıqardı (58); Qara sarınmaq, yas saxlamaq: Anam mənüm içün gög geyib, *qara sarınsun* (75).

QARA III 1) sif. Böyük. □ Qara evlər. Böyük mülk, ev-eşik: Çala bilən yigidə oqla qılıcdan bir çomaq yeg, Qonağı gəlməyən *qara evlər* yıqılsa yeg (32); Qara yer. Böyük, geniş sahə: Toqsan başlu ban evlərin *qara yer* üzərinə dikdirmişdi (42); 2) Şəxs adlarının önündə titul, ləqəb mə'nasında işlənmişdir. *Qara Aslan Məliki* Qarabudaq yerə saldı (66).

QARABUDAQ antr. Qazan xanın qardaşı oğlu: *Qarabudaq* aydır: Ağam Qazan, məsləhətdir (42).

QARA BUĞA is. zool. Qara öküz: *Qara buğa* gəldügündə xurdxaş eylədin (89).

QARA BUĞRA is. zool. Dəvə balası: *Qara buğra* gəldikində nə kiçikmiş?-deyələr (89).

QARAVAŞ is. Qulluqçu qadın. Övrət əlin-əlinə çaldı, *qaravaşa* söylədi...(106).

QARAVUL is. Gözətçi. Oğuz elinə *qaravul* olsun,-dedi (104).

QARAQUC is. zool. Cəld at. Mən *qaraquc* atıma binmədin, ol binmax gərək (55).

QARAQUŞ is. zool. "Qartal" kimi. Çayın baqsa, çalmalu, *qaraquş* ərdəmlü, qurqurma quşaqlu, qulağı altun küpəli, Qalın Oğuz bəglərini atdan yıqan Qazılıq qoca oğlı bəg Yegnək çapar yetdi (77).

QARADƏRƏ top. Qarabağda qədim bir yer adı. *Qaradərə* ağzında qara buğa dərisindən beşiginin yapuğı olan, acığı tutanda qara taşı kül eyləyən...ərənlər əvrəni, Qazan bəgin qartaşı Qaragünə çapar yetdi (49).

QARA DƏNİZ is. hidronim. İlərü yatan *Qara dəniz* gördüm (95).

QARAGÜNƏ antr. Qazan bəgin qardaşının adı. *Qaragünə* aydır: Qara bulıt dedigin sənin dövlətindir (44).

QARALU-GÖKLÜ qoş.s. Rəngbərəng. *Qaralu-göklü* otağı sorar olsam, şülən kimün? (61).

QARALUCA sif. Qaraca. Qız aydır: Çalma, ozan, ayıtma, ozan. *Qaraluca* mən qızın, nəsinə gərək, ozan? (61).

QARANQU//QARANNU is. Qaranlıq. □ Qaranqu axşam. Axşam qaranlığında. *Qaranqu* axşam olanda qayğulu çoban (43).

QARAÇƏKUR antr. Oğuz dövlətinin məşhur igidlərindən biri. Biri Qanturalı, biri *Qaraçəkur* və oğlı Qırqqınuq və Boz ayğırlu Beyrək (87).

QARACA ÇOBAN antr. Qazan xanın çobanı. Qazan köpəgi qovlayı *Qaraca çobanın* üzərinə gəldi (45); *Qaraca çoban* sapan çatlatdı (48).

QARACIQ//QARAÇUQ /ÇOBAN. antr. Qaracıq, qara çoban. Ərənlər əvrəni *Qaracıq çoban* sapanının ayasına taş qodı, atdı; *Qaraçuq çoban* kafərin üç yüzini salan taşilə yerə buraqdı (43).

QARACUQ antr. Qaraxanlı dövlətinin başçısı. □ Qaracuğın qaplanı (məc.). Bir gün Ulaş oğlı Tülü quşun, yavrısı, bizə miskin umudı, Amit soyının aslanı, *Qaracuğın, qaplanı,* Qonur atın iyəsi, xan Uruzın ağası, Bayındır xanın göygüsi, Qalın Oğuzın dövləti, qalmış yigit arxası Salur Qazan yerindən turmışdı (42).

QARVARMAQ f. Qapıb tutmaq. Yügrək atın yükürdüb Qantural kürzin gögə atar, enüb yerə düşmədin *qarvar,* tutar (87); Anası at üzərindən *qarvardı.* (106).

QARVAŞMAQ f. qarş.n. Tutuşmaq. At üzərindən ikisi *qarvaşdılar,* tartışdılar (109).

QARĞA-QUZĞUN zool. Leş yeyən quşlardan. Baqsa görsə, bir dərənin içinə *qarğa-quzğun* enər-çıqar (38); *Qarğa-quzğun* qan görüb, oğlanın üstünə qonmaq istərdi (38).

QARĞAMAQ f. Qarğış etmək. "Aqar" ayıda *qarğamağıl,* Qazlıq tağının suyının günahı yoqdır. "Bitər" ayıda otlarına *qarğamağıl,* Qazlıq tağının suçı yoqdır (39).

QARĞAŞA, is. Narahatlıq. ◇ Qarğaşa etmək. Dədə Qorqud: Oğul, Qaçar, nə *qarğaşa* edərsən? Götür, bu, ismarladuğın nəsnədir (57).

QARĞIŞ is. Birisinə uğursuzluq arzusu, diləyi. Ol zəmanda bəglərin, alqışı alqış, *qarğışı qarğış* idi (52).

QARĞU is. Boyu uzun, boru şəkilli, sulu, bataqlıq yerlərdə bitən cənub bitgisi. *Qarğu* kibi qara saçım uzanır gördüm (44); Qarğudalı gövdəsindən düzəldilmiş süngü. Qarğutalı süglini mana vergil (107).

QARDAŞ//QARTAŞ, qoh.t. Bir ata-anadan olan oğul övladı. Kərbəla yazısında yezidilər əlində şəhid oldı, Həsənlə Hüseyn iki *qardaş* bilə görkli (32); Vay, bəgim *qartaş.* Muradına-məqsudına irməyən yalnuz qardaş (58); Çoban şəhid olan *qardaşların* həqqinə qodı (44).

QARDAŞLU sif. Dostu, qardaşı olan. Üç yüz altmış altı alp ava binsə, Qanlu keyik üzərinə qoğa qopsa, *Qardaşlu* yigitlər qalqar-qopar olur (112).

QARDAŞSIZ sif. Kimsəsiz, köməksiz. *Qardaşsız* miskin yigit ən,səsinə yumruq toqunsa, Ağlayubən dört yanına baqar olur (112).

QARI is. 1) Qadın, arvad, zövcə. Ozan aydır: *Qarılar* dörd dürlüdür - birisi solduran soydur, birisi tolduran toydur, birisi evin tayağıdır, birisi necə söylərsən, bayağıdır (33); 2) Qoca. Ağ birçəklü *qarının* südin sökdi (37); Baban *qarı,* anan *qarı,* Səndən yegrək qadir bizə oğul verməz (76); 3) Köhnə, hiyləgər. Qarı düşmən. Köhnə düşmən. *Qarı düşmən,* tatar oğlı əlümizə girmişkən ceza ilə öldürəlim (74); *Qarı düşmən* dost olmaz (31).

QARIMAQ f. Qocalmaq (məc.).Şahbaz atın *qarımışdı,* qulun verdi axır (66); Qaytabanlar *qarısa,* kürüm verməz, Qaraquclar *qarısa,* qulun verməz (76).

QARIN anat. Bu evi xərab olası ərə varalıdan bərü dəxi qarnım toymadı, yüzim gülmədi (33).

QARINDAŞ B a x: Qardaş.

QARIPLIQ B a x: Qəriblik.

QARICIQ sif. Qocalmış, zəif qarı. *Qarıcıq* anam gətürüb durursan, mərə kafər, anamı vergil mana. (48).

QARIŞMAQ f.q.n. Birləşmək. Oğlanın babası Bayındır xanın ordısına *qarışdı* (36).

QARIŞIQ sif. Bulaşıq. Sıqdı, südlə qan *qarışıq* gəldi (39).

QARLI sif. Daim qarla örtülü (dağ). Yum verəyim, xanım, *Qarlı* qara tağlarun yıqılmasun (50).

QARMALAMAQ f. Cəld tutmaq. Kafər təkur onu *qarmalayıb* zərb etdi (96); Qazılıq qocayı *qarmalayıb,* tutıb qəl'əyə qoydılar (95).

QARMA-BÜKƏC, qoş.s. Arqasını urıb, bərk ağılın ardın sökən, *Qarma-bükəc* simüzin alub tutan (45).
QARUN sif. Varlı, dövlətli. Burada Ağca qala, Sürməlidə at oynatdım, Atla *Qarun* (?) elinə çapqun yetdim. (118).
QARUSI zərf. Qarşısı. Yayın *qarusına* bıraqdı (101); Ağ əllərin qarusından bağlatdınmı (72).
QARŞU zərf. Qabaq, ön. Dərsə xana *qarşu* vardı (38); Qadın ana. *Qarşum* alub nə bögrərsən? (47). Bayındır xanın *qarşusında* oğlı Qarabudaq bay tayanub turmışdı (52); ◇ Qarşu varmaq. Qabağına gəlmək...Dərsə xanın xatunı tuymuş oğlancuğına *qarşu* varub, soylamış...(40). Qarşu yatan (Bu) görünən: *Qarşu yatan* qara tağım yüksəgi, oğul (72); *Qarşu yatan* ala tağdan bir oğul uçurdunsa, deyil mana (38); Qarşu gəlmək. Qarşılamaq, qabağını kəsmək: Ol qırq namərd *qarşu* gəldi (38).
QARŞULAMAQ f. Qabağına çıxmaq, qarşılamaq: Bayındır xanın yigitləri Dirsə xanı *qarşuladılar* (34).
QARARMAQ f. Qaralmaq. Toz yarıldı, gün kibi şıldadı, dəniz kibi yayqandı, meşə kibi *qarardı* (69); Bığcığı qararmış yigitcikləri çoq yemişəm (109); Qarnın acıqmamışkən, gözin *qararmamışkən* bu ağacı gör (46).
QAS-QAS zərf. Qımışmaq. ◇ Qas-qas gülmək. Sün'i gülmək. Köpəkləri göricək *qas-qas* güldi (57).
QAT zərf. Ön, qabaq, qarşı: Xan babamın *qatına* bən varayım (38); Bayındır xanın *qatında* sana qəzəb ola (37).
QATAR-QATAR sif. Var-dövlət. *Qatar-qatar* qızıl dəvələrini yetdilər (42).
QATI sif. ər. ("qət'i" sözündən): 1) Birdəfəlik, həqiqi; □ Qatı qəzəb. "Məhv etmək": Xan qızı, səbəbi nədir, degil, mana. *Qatı qəzəb* edərəm şimdi sana, -dedi (35); 2) Bərk. ◇ Qatı qaqmaq. Bərk çəkmək: Yalançı oğlı Yalıncıq yay ufanduğına *qatı* qaqdı (63); Qatı incimək. Bərk incimək. Əlhasili, ordı bunın ucından *qatı incindilər* (99); Qatı-qatı inləmək. Bərkdən inləmək. Hər gecə döşəgində *qatı-qatı* inlədi (106); Qatı yaqlanmaq (məc.). Bərk əzilmək. Qazan bəg gördi ki, kafər *qatı yaqlandı* (71).
QATIR zoon. Atdan kiçik olan ev heyvanı. Bazırgan surətində *qatır*, dəvə çəkdilər, gəldilər (119); ◇ Qatır olmaz (zərb.-məs.). Qara eşək başına üyən ursan, *qatır* olmaz (31).



QATLA zərf. Dəfə. Əmma götürməyəcək olursan, bu *qatla* öldürmədim, ol vəqtin öldürərin -dedi (56); Oğlan bu *qatla* buğanın alnına yumruğını tayadı (35).
QATLANMAQ f. Dayanmaq, səbr etmək. *Qatlan*, mərə qavat oğlı, mən sana varayım, - dedi (108); *Qatlanmadı*, qırq incə qızı boyuna aldı (38).
QATMAQ f. Birləşdirmək. Dün *qatdı*, yort eylədi; *Dün qatmış*, üç gün dünli yortmış yigit, qaranqulı gözin uyxu almış yigit... (113); ◇ öginə qatmaq, qabağına qatmaq. Qanturalı baqdı, gördi kim, bir kimsənə yağıyı öginə *qatmış* qovar (91).
QAFTAN etnoqr. Qədim türklərin üstdən geydikləri xüsusi paltar növü. *Qaftanı* altından ayağın bərk sardı, var qüvvətilə atının yelisinə düşdi (105); Beyrəgə dayələr *qaftan* geyürib tonatdılar (65).
QAXINC is. Birisinə göstərilən yaxşılığı və s. onun üzünə demək, başına vurmaq. Beyrək aydır: Bu qıza basılacaq olursam, Qalın Oğuz içində başuma *qaxınc*, yüzinə toxunc edərlər, -dedi (85).
QAÇ əvəz. Neçə. (Bir) qaç - (bir) neçə. Ol qırq namərdin (bir) *qaçı* oğlanın yanına gəldi (37); (Bir) *qaç kəlmə* - neçə kəlmə. Ağız-dildən (bir) *qaç kəlmə* xəbər mana, -dedi (39).
QAÇAN əvəz. Haçan. Qaçan kim. Budaq atsa, Beyrək - "ölün, var olsun!" - deyirdi (63).
QAÇMAQ f. Dirsə xanım oğlancuğı *qaçmadı* (36); Dədə Qorqud göstəki üzdi, turamadı, *qaçdı* (56); ◇ Qaçar keyik. Qaçağan ceyranlar. *Qaçar* sənin keyiklərinə qarğamağıl, Qazılıq tağının günahı yoqdır (139); ◇ Qaçanını qovmamaq (məc.). *Qaçanını* Qazan bəg qovmadı, aman deyəni öldürmədi (50).
QAŞ is. Qaş. □ Qara qaş(lım). Nazik və qara qaşı olan: Qələmçılar çaldığı *qara qaş*(lım) (93); (Çatma)*qaş*(lüm) başlanğıcdan ucları bir-birinə qovuşuq qaş. Qurulu yaya bənzər çatma *qaş*(lum) (35).
QAŞĞA zoon. Alnı ağ at. (Təpəl) - *qaşğa* - alnında ağı olan. Təpəl *qaşğa* ayğırına Tondaz bindi (42).
QEYRƏT is. ər. Vətən, xalq, ailə namusu, ən əziz və müqəddəs sayılan şeyin təəssübünü çəkmə, qoruma hissi. □ Baba qeyrəti ailə üçün. Oğul da qılıc quşanur *baba ğeyrəti* içün (71); Qeyrət gəlmək. Təəssüb hissi qüvvətlənmək. Qazana *qeyrət* gəldi.

QEYNƏMƏK f. Qaynamaq (məc.). Uruzın şəfqət tamarları *qeynədi* (121).
QƏBZƏ is. ər. Dəstə, qulp (məc.). "Evimin dirəyi" xalq məs. kimi. Dünlügi altun bin evimin *qəbzəsi* oğul (47).
QƏBUL is. ər. məqbul sayılan. ◇ Qəbul eyləmək. Övlad hesab etməmək: Ol zəmanda oğul ata sözin iki eləməzdi, iki eləsə, ol oğulu *qəbul eləməzlərdi* (71); Qəbul etmək. Razılaşmaq: Hər nə ki buyursa, *qəbul edərlərdi*, sözin tutub təmam edərlərdi (31); Qəbul olmaq, məqbul saymaq: Ağ alnunda beş kəlmə dua qıldıq, *qəbul olsun* (31); Dədə Qorqut vilayət issi idi, diləgi *qəbul oldı* (56).
QƏDD is. ər. Boy, qamət, görkəm. Uluhğın,a həddin, sənin boyun - *qəddin* yoq! (96).
QƏDƏM is. ər. Addım, ayaq. ☐ Qədəmi qutsız. Uğursuz, ağır ayaq. Qız aydır: *Qədəmi qutsız* gəlin deyincə, udsız gəlin desünlər (112).
QƏRAR is. ər. (məc.): ◇ Qərarı qalmamaq. Əhvalı qarışma: Böylə dikəc anasının *qərarı qalmadı* (47); Məc. Qərarı qalmaq. Səbri tükənmək. Məgər xanım, Boyı uzun Burla xatun oğlancığını andı, *qərarı qalmadı* (76).
QƏRƏ. B a x: Qara.
QƏRİBLIĞ is. ər. Yad yerdə yaşama. *Qəribliğa* qardaşın istəyü sənmi gəldin, qardaş (115).
QƏSD is. ər. Birisini öldürmək cəhdi. ◇ Qəsd eyləmək. Anasıyla söhbət eylədi, atasına *qəsd eylədi* (37).
QƏHR is. ər. Qəzəb, hirs, hiddət. ◇ Qəhr etmək. Hirslənmək. Qaqduğın *qəhr edən* qəhhar Tən,ri (96).
QƏHƏR. B a x: Qəhr ◇ Qəhər gəlmək. Kədərlənmək. Çoban böylə dikəc Qazana *qəhər* gəldi (46).
QƏHHAR sif. ər. Güclü, qüdrətli. ☐ Qəhhar Tən,ri. Güclü, qüdrətli Tanrı: Qaqduğın qəhr edən *qəhhar* Tən,ri (96).
QİYAMƏT is. ər. Qarşıdurma, savaş. *Qiyamətin* bir güni oldı; Bir *qiyamət* savaş oldı (77); ◇ Qiyamət qopmaq. Dini əqidəyə görə axır zamanda bütün ölülərin dirilib ayağa qalxacaq günü. Axır zəman olub *qiyamət qopınca* bu didügi Osman nəslidir (31).
QIVANMAQ f. Güvənmək, arxalanmaq:...Mən dəxi baqsam sevinsəm, *qıvansayım*, guvənsayum...- dedi (52).

QIVANMAQ-GÜVƏNMƏK qoşa söz. Güvənmək, fəxr etmək. Ol qırq namərdin bir qaçı oğlanın yanına gəldi, aydır: - Baban dedi keyikləri qovsun gətürsün, bənim ogimdə dəpələsün, oğlumın at səgirdişin, qılıc çalışın, oq atışın görəyim, sevinəyim, *qıvanayım-güvənəyim*, - dedi - dedilər (37).
QIZ is. *Qız* anadan görməyincə ögüt almaz (31); *Qız* aydır: Mərə yigit, mənim atumı kimsə keçdügi yoq (55); Beyrək götürər *qızı* yerə urmaq istər, *qız* götürər Beyrəgi yerə urmaq istər (55); Bu kəz Beyrək *qızın* incə belinə girdi (55); Banıçiçək aydır: -Mərə, *qızlar*, bu yigit nə yigitdir? (54). Qız vermək. Qızı ola. Allah-təala mana da bir *qız* verə, -dedi (52); Qız qurtarmaq. Qızın xilas etməsi. Yarın Oğuz elinə xəbər vara, dəvə əlində qalmışdı, *qız qurtardı* (89); Rəfiqə. Qırq incə bellü *qız* ilə Boyu uzun Burla xatun yesir getdi (31); ...kafər *qızları* Qalın Oğuz bəglərinə sağraq sürüb içərlərdi (42); Qızlar ayıtdı: -Vallah, sultanım, bu yigit yüzi niqablu, yaxşı yigitdir (54).
QIZ QARDAŞ is. Bacı. Dəli Qarcar *qız qardaşını* diləyini öldürər (55); Ölüsi xəbərin götürənə *qız qardaşım* verərdim, - dedi (58); Beyrək baqdı gördi kim, *qız qardaşı* binardan su almağa gəlür, "qardaş Beyrək" -deyü ağlar bozlar (60).
QIZ KİŞİ is. Qadın tayfası; müasir dilimizdəki "anam, bacım" mə'nasında. Ağız dildən, *qız kişi*, xəbər mana (61); Anam kişi, *qızım kişi*. Ala tanla yerindən turı gəldin (91).
QIZ-GƏLİN qoşa söz. Qız-gəlin, gənc qızlar. Qaza bənzər *qızımın-gəlinümin* çiçəgi, oğul (47).
QIZLU is. Qızı olan. Oğullıları ağ otağa, *qızluyı* qızıl otağa, oğlı-qızı olmıyanı qəra otağa qondurun, -dedi (35).
QIZIL I sif. Qırmızı. ☐ Qızıl otaq - qırmızı otaq: Bir yerə ağ otaq, bir yerə *qızıl otaq*, bir yerə qara otaq qurdurmışdı (34); Qızıl qaftan. Qırmızı qaftan. Sən *qızıl qaftan* geyərsən, biz ağ qaftan geyəriz, -dedilər (57); Qızıl dəvə (məc.). Var-dövlət. Qaytabanda *qızıl dəvə* bundan keçdi (73).
QIZIL II is. Qızıl. ☐ Qızıl dügmə(lü). Qızıl düymə: ....köksü *qızıl dügməli*, əlləri biləgindən qınalı, barmaqları nigarlı məhbub kafər qızları Qalın Oğuz bəglərinə sağraq içərlərdi (42).
QIZILCIQ sif. Qırmızı. Qızılcıq dəgənək - qırmızı dəyənək: Altmış tutam köndərini nə ögərsən, mırdar kafər? *Qızılcıq dögənəgincə* gəlməz mana (43).

QIZCIĞAZ is. Yeganə qız: Üç canvər öldürdügi içün bir *qızcığazımı* aldı getdi, -dedi (30).

QIYA I sif. Çəpəki. ◇ Qıya tutmaq. Çəpəki tutmaq. Oğlan yumruğılə buğanın alnına *qıya tutıb* çaldı (36); Qıya tikmək (məc.). Çəpəki baxmaq. *Qıya tikübən* Baybörə bəgin yüzinə baqdı (52).

QIYA II f.sif. Qəsd etməyə cəsarəti çatmaq. Yalnuzca oğluma *qıya(n)* Qazan.

QILMAQ f. 1) Etmək. (Zarlıq) qılmaq. "Oğul", "Oğul" deyübən *zarlıq qıldı*, ağladı (47); (Həlak) qılmaq. Dilədi ki, oğlanı *həlak qılaydı* (36); 2) İcra etmək. (Dua) qılmaq. Ağ alnuzda beş kəlmə *dua qıldıq*, qobul olsun (84); (Namaz) qılmaq. Məhəmmədin sağ yanında *namaz qılan* Əbubəkr siddiq görkli (32).

QILIC is. *Qılıcum* nə ögərsən, mərə kafər? (43); ◇ Qılıc quşanmaq. Belinə qılınc bağlamaq. Oğul da *qılınc quşanur* baba ğeyrəti içün (71); Qılıc tutmaq. Qılıncla döyüşmək. Altı cəllad ənsəndə yalın *qılıc tutar* (89); *Qılıc çalışıma* baqsun, sevinsin (37).

QILICLAMAQ f. Qılıncla vurmaq. Sağ yanını *qılıcladı*, yerə saldı (50).

QILICLAŞMAQ f.qar.n. Qılıcla döyüşmək. Mənim çəkişdügim, mənim *qılıclaşdığım* görgil, ögrəngil (71).

QILCIDMAQ f.s.təq.s. Geyim *qılcıdmasından*, at çığırmasından məgər yigit ayğır binərdi (113).

QIMIZ is. At südündən hazırlanan içki. Dəpə kibi ət yığ, göl kibi *qımız* sağdır (35); ◇ Qımız sağırdmaq. Qımız hazırlamaq üçün atları sağdırmaq. Dəpə kibi ət yığdım, göl kibi *qımız sağırdım* (38).

QIN is. Xəncər, qılınc və s. kəsər silahları qoymaq üçün qab. Zülfüqarın *qını* ilə qəbzəsi ağac (48); Kəndu qılıcın *qınına soqdı* (102); Aydır: - Anda iki qılıc var, biri *qınlu*, biri *qınsuz* (102); □ Qınsuz qılıc - qabsız qılıc. Gördü bir *qınsuz* qılıc turmaz, enər, çıqar (102).

QINA is. Xına. □ (Qızıl) qına. Qızılı qına ağ əlinə yaqmaz oldı (57).

QINALI. B a x: Xınalı.

QIPÇAQ MƏLİK antrp. Hamidlən Mərdin qəl'əsin dəpüb yıqan, dəmür yaylı *Qıpçaq Məlikə* qan qusdıran, gəlübən Qazanın qızın ərliklə alan...Qaragünə oğlı Qarabudaq çapar yetdi (49).

QIR is. Səhra. Arqıc *qırda* yıqanır Əmman dəgizində, Sərb yerlərdə yapılmış kafər şəhri (118); Arqıc *qırda* döndərdigim. Mərə kafər, sənin, baban, (118); □ (Ortac) qır. Şərik səhrada. Ağ qayanın qaplanının erkəgində bir köküm var. *Ortac qırda* sizin keyiklərinüz turğurmıya (118).

QIRAN sif. Boş səhra. □ *Qıran yerdə* tikilmiş otaqların, o zalım yığdırdi ola, qardaş (100).

QIRQ s.Qırx. *Qırq* incə qız - ən'ənəyə görə qədim türk kübar ailələrində qadın və qızları, eləcə də igidlərini qırx gözəl qız-gəlin və qaçaq igidlər müşayiət etmişdir. Dərsə xanun xatunı qayıtdı, gerü döndi, qatlanmadı, *qırq* incə qızı boyına aldı (38); Qırq yigit. Qırx qoçaq. Alar sabalı Dərsə xan qalqubanı yerindən uru turıb, *qırq iyidin* boyına alub Bayındır xanın söhbətinə gəlürdi (34); Qırq gün. Qırx rəqəminin özü də saylıq kəmiyyətindən başqa, müqəddəs sayılmışdır: Oğlanın *qırq gündə* yarası önəldi, sapasağ oldı (39); *Qırq namərd* - e'tibarsız çıxan qırq namərd mühafizəçilər. Ol *qırq namərdin* bir qaçı oğlanın yanına gəldi. (37).

QIRQQINUQ antrp. Qaraçəkurün oğlı. Biri Qanturalı, biri Qaraçəkür və oğlı *Qırqqınuq* və Boz ayğırlu Beyrək (87).

QIRDIRMAQ f.icb.n. Kəsdirmək. Genə toy edib atdan-ayğırdan, dəvədən buğra, qoyundan qoç *qırdırmışdı* (34).

QIRILMAQ f.məc.n. Məhv olmaq, ölmək. Gördi oğlanın ala gözlü qırq yigidi *qırılmış* (74); Qara gözlü yigitlərim *qırılduğun*, Sən gəlmədən, baba, kafərlər tanışdılar (74). On beş bin kafər kimi *qırıldı*, kimi tutıldı (77).

QIRIM is. Döyüş, vuruş, müharibə, öc, döyüşçü. *Mənim qırımım* Tərs Uzamış olsun. Alp Rüstəm aydır: "*Mənim qırımım* Ənsə qoca oğlı Oqçı olsun", - dedi (126); Oğlan babasına muştçı göndərdi, "*qırımım aldum*", - dedi (109). Qırımından qayırmaq - rəqibindən qorxmaq. Alp yigitlər qırış *qırımından* qayırırmı? (90); Qarşısından qaçmamaq. Qırımından dönməsə - qaçmasa, ərlik yaxşı, - dedi (96); Qara polad üz qılıcı çalmayınca, *qırım dönməz* (31).

QIRIŞMAQ f.e.n. Qarşı-qarşıya bir-birini qırmaq. Qarğu talı sügülər ilə *qırışdılar*, meydanda buğa kibi süsişdilər, köks-

ləri dəlindi (109). □ Qırış günü. Qırğın, döyüş günü. Alp yigitlər *qırış güni* qırımından qayırırmı? (90).

QIRMIZI sif. Qırmızı. Qırmızı otaq - bəzəkli otaq. Gördi göğ çayırın üzərinə bir *qırmızı* otaq dikilmişdi (54).

QOVĞA is. ər. Dava-dalaş, səs-küy. Mənim köprüm yanında bu *qovğa* nədir, niyə şivən edirsiz? - dedi (79); ◇ Qovğa salmaq, səs-küy salmaq. Avazı qaba köpəklərə *qovğa salan.* (45)

QOVMAQ f. Qovmaq. Oğlandı nə bilsün? Keyiki *qovardı* gətürərdi babasının ögində sinirlərdi (37); Baban dedi, keyikləri *qovsun,* gətürsün bənüm ögümdə dəpələsün (37); ◇ Qova getmək. Qova-qova getmək: Bamsı Beyrək birini *qova getdi* (54).

QOVA-QOVA zərf. Ürküdə-ürküdə. Dədəyi *qoa-qoa* Dəli Qarcar on yelək yer aşurdı (56).

QOVULMAQ f.məc.n. Kimsə tərəfindən rədd olunmaq. *Qoulan* kimsə oğlanın bədəvi atın oxlatdılar (71).

QÖVM is. ər. Qohum, el-tayfa. Qövmlü *qövmilə* gənəsidimi? (105); Qorqut Ata Oğuz *qövminin* müşkilini həll edərdi (31).

QOY//QO əd. əmr. Razılıq bildirir. *Qoy,* bəni qadın ana, çəngələ ursunlar. Qo ətimdən çəksünlər, qara qourma etsünlər... (47)

QOYMAQ//QOMAQ f. 1) Qoymaq. Ərənlər əvrəni Qaracuq çoban sapanın ayasına taş *qodı,* atdı (43); 2) Bir işi, mərasimi icra etmək. Dədəm Qorqut gəlsün, bu oğlana ad *qoysun* (36); 3) İcazə, imkan vermək. *Qoyun* məni bu ağacla söyləşim, -dedi (47); Qazan bəkdən buyruq olubdur, *qon,* otursun, -dedi (64).

QOYULMAQ f.məc.n. 1) Verilmə. Bəg yigitlər cılasunlar bir-birinə *qoyulan* çağda (34); 2) Qəfildən basqın etmək mə'nasında. Nagahandan Qaracıq çobanın üzərinə altı yüz kafər *qoyuldı* (43); Yürəginə qaynar yağlar *qoyulubdur*? 3) Göndəmək mə'nasında: Evnik qalasının, beş yüz kafərin üzərimizə *qoyuldı* (53); Qoyu vermək - azad etmək. Tut ol dəlüyi öldür, səni *qoyi* verəlim, var get, -dedilər (113); Qomağım yoq verməröm. *Qomağım* yoq qırq namərdə (41).

QOYUN I is. zool. Ev heyvanı, qoyun sürüsü. Altı yüz kafər *qoyunın* üzərinə ilqar vardı (43); Qoyun diməz - qoyuna



baxmaz: *Qoyun* diməz, keçi diməz, sapanın ayasına qor atar, kafəri yıqar (44); ◇ Qoyun getmək. Qoyun aparılmaq. Ağayıldan tümən *qoyun* gedərsə, mənim gedər (40).

QOYUN II is. Qoyun, qucaq. Kişi *qoyn*ı*nda* yatan həlalına sirrin deməzmi olur? (106); Uc toqunı, alca qanı şorladı, *qoyn*ı toldı (37).

QOL I anat. 1) İnsan bədəninin ətraf üzvlərindən biri. Boyı boyına, beli belinə, *qolı* qolına yaqışdı (62); ◇ Qol saluban oynamaq. Araya girib oynamaq, rəqs etmək. Ərə varan qız qalqa, *qol* saluban oynaya, mən qopuz çalam, -dedi (64); 2) Sapanın "qolları". Çobanın üçyaşar tana dərisindən sapanının arasıydı, üç keçi tüyindən sapaninin *qollarıydı* (48); 3) Paltarın qolu. Boyı boyına, beli belinə, *qolı* qolına yaqışdı (62).

QOL II zərf. Tərəf, sol qol - sol tərəf. Sol *qolda* oturan səbəglər (63).

QOLTUQ anat. Qolların dibi, altı. *Qoltuğına* qısılmağa gəlmək (məc.)- qız diləmək, elçilik etmək. Gen ətəgünə, tar *qoltuğına* qısılmağa gəlmişəm; (56); Qoltuq qısmaq - gizlətmək, xəlvəti. Altmış tutam sür cidasın *qoltuq qısub,* ol kafərin qarşusından süsəm, - dedi, süsəmədi (96).

QOM is. ər. El-oba, qohum, qəbilə, tayfa. Qom qomlamın qoma yurdım! (44).

QONAQ is. *Qonağı gəlməyən* qara evlər yıqılsa yek (32) Ozan, evin tayağı oldır ki, yazıdan-yabandan evə bir *qonaq gəlsə,* ər adam evdə olmasa, ol anı yedirər-içirər, ağırlar-əzizlər göndərər (33).

QONAQLAMAQ f. Qohum - qəbiləni bir yerə yığıb məclis açmaq. Xanlar xanı xan Bayındır yildə bir kərrə toy edib Oğuz bəglərin *qonaqlardı* (34); Əmiraxurbaşı qarşuladı, endirdi, *qonaqladı* (53).

QONAQLIQ is. Şadlıq-şənlik və məsləhət məclisi. Ağı *qonaqlıq* eylədilər (55).

QONMAQ f. 1) Qonmaq. Qarğa-quzğun qan görüb, oğlanın üstinə *qonmaq* istərdi (38); 2) Bir yerə düşüb müvəqqəti düşərgə salmaq. Bu yanadan dəxi bazırganlar gəlübəni qanlı Dərvənd ağzına *qonmışlardı* (53); ◇ Qonduğı yer. Düşdüyi yer. Qanturalı baqdı gördi bu *qonduğı yerdə* quğı quşları, turnalar, turaclar, kəkliklər uçarlar (90); Çevrə alub getdilər, *qondılar* (86); 3) Yerləşmək. Qanlu qara Dərvənddə kafər dəxi *qon*

*mış idi* (74); 4) Oturtmaq. Kimün ki, oğlı-qızı yoq, qara otağa *qondurın* qara keçə altına döşən, qara qoyun yəxnisindən öninə gətürün (34).

QONUR I sif. Şabalıd rəngli. *Qonur atın* iyəsi, xan Uruzın ağası, Bayındır xanın göygüsi, Qalın Oğuzın dövləti, qalmış yigit arxası Salur Qazan yerindən turmışdı (42); Bu məhəldə Qazan yetdi, *Qonur atın* oynatdı (74).

QONUR II antr. Sarıyağız; Aruzın çobanı. *Qonur* qoca Sarı çoban deyərlərdi (98).

QONŞU is. Bir-birinin yaxınlığında yaşayanlar. *Qonşularına* çağırar ki, Yetər, Zübeydə, Zəlixə, Ürüydə can, qız-can Paşa (33); Yanıma ala baqduğımda *qonşuma* eyü baqdım (73). Qonşı həqqi. Qonşu borcu. "*Qonşı həqqi.* Tənri həqqi" - deyü söylər (33).

QOPMAQ f. 1) Tanınma, məşhurlaşma, ad qazanma. Rəsul əleyhüssəlam zəmanına yaqın Bayat boyından, Qorqut ata diyərlər, bir ər *qopdı* (31); Məndən dəxi ər *qopmıyasan,* Yegnəgüm, dön, - dedi (95); 2) Yerindən, kökündən çıxarmaq. Bir ağacı yerindən *qopardı* (99); ◊ Qoparı görmək. Çıxarmaq. Qarnın acıqmamışkən, gözün qərarmamış ikən bu ağacı *qoparı gorı* gör (46); 3) Kədəri dağılmaq. ◊ Yel əsdi, yağmur yağdı, bunı *qopdı* (95); 4) Gözlənilməz fəlakət mə'nasında. Qara uran *qopdı* Dəpəgöz, Ərqi yüzində çevirdim, alımadım, Basat (100); Yarımasun-yarçumasun, sənin oğlın, kür *qopdı,* ərcil qopdı (36).

QOPUZ//QOPIZ is. Orta Asiya türklərində və qədim Azərbaycanda işlədilmiş saza bənzər musiqi aləti. ◊ Qopuz götürmək. Aşıqlar kimi şənliklərdə çalıb oxumaq üçün qopuz götürmək. Qolca *qopız götürüb* eldən-elə, bəgdən-bəgə ozan gəzər (32); Qopuz çalmaq. Qopuz çalmaq. Xanım, məqsudım oldur ki, ərə varan qız qalqa oynaya, mən *qopuz çalam,* -dedi (64); Qopuz almaq. Qopuzın götürmək. Beyrək *qopuzı aldı,* babasının ordusına yaqın gəldi (60).

QORQUD//QORQUT qəd. etnonim. "Kitabi-Dədə Qorqud" dastanlarında verilmiş müdrik ata, xalq arasında tanınmış ulu rəhbər, böyük Ozan, xalqın elçisi və məsləhətçisi, dastanların söyləyicisi. Rəsul əleyhissəlam zəmanına yaqın Bayat boyından *Qorqut ata* diyərlər, bir ər qopdı (31); /Dədəm/ *Qorqut* gəldi, oğlana ad qoydı (54); *Dədəm Qorqut* boy boyladı, soy soyladı bu Oğuznaməyi düzdi-qoşdı, böylə dedi (41).

QORQMAQ//QORXMAQ f. Qorxmaq. *Qorqma,* qayırma, bəg sərxoşdur, cavab verməz - dedilər (38); Yigitlərim, Əzrayilin gözin elə *qorxutdum* ki, gen qapuyı qoydı, tar bacadan qaçdı (80); Gələn xırsuzları *qorqudan* (45).

QORXU is. Müəyyən hadisə və s. tə'siri altında yaranan hiss; ◊ Qorxu vermək. Qorxutmaq. Alp ərə *qorxu* vermək eyb olur (86); Qorxu düşmək. Qorxmaq. Çobanın içinə *qorxu düşdi* (98).

QOXU is. Burunla hiss olunan iy, qoxu; ◊ /Yağı/ qoxusu almaq (məc.). Təhlükə hissi keçirmək. Al ayğır qaçan kim, yağı qoxusın alsa, ayağın yerə dögərdi, tozı gögə çıqardı (107); Yedi dərə *qoxuların* dilkü bilür (32).

QOÇ is. zoon. 1) Qoyunun erkəyi. ◊ Qoç öldürmək. Kəsmək. Atdan ayğır, dəvədən buğra, qoyundan *qoç öldürgil* (35); Qoç seçmək. Kəsmək üçün seçmək. Qoyunlarına vardı, bin *qoç seçdi* (57); 2) (məc.). İgid, qoçaq. Cilasun *qoç yigitlərə* qalaba ölkə verdi (50); *Qoç yigidim,* şah yigidim (83).

QOCA sif. 1) Yaşlı, qocalmış. ◊ Qocanın ağzın sögmək. Təhqir etmək. Ağ saqqallu *qocanın ağzın sögdi* (37); Qoca babam. Qoca ata. Biligi yetmiş *qoca babam* var. Qamağım yoq qırq namərdə! -dedi (41); 2) Qədim eponimlərdən sonra işlənərək böyük, müdriklik bildirir. İlək *Qoca* oğlı Sarı Qalmış Qazan bəgün evi üzərinə şəhid oldı (43); Anlar eylə dikəc Atağuzlu Uruz *Qoca* iki dizinin, üstinə çökdi (42); Oğlilə, gəlinilə Qanlı *Qoca* Oğuza girdi (93).

QOCALIQ d.is. Yaşın ötər çağı. Qocalıq vəqti. Qoca vaxtı. *Qocalığım vəqti* aldırduğım yalnuz oğul, - dedi (74).

QOŞA, z. Cüt. Qoşa badam (məc.). Balaca ağız mə'nasında (dan.); püstə ağız da deyilir. *Qoşa badam* sığmayan tar ağızlum (35); Qoşa bürc. Əkizlər bürcü. *Qoşa bürcdən* qayın oqı əklənməyən, Yağrıncı oğlı İlalmaş səninlə bilə varsun! -dedi (95).

QOŞLIQ is. Rahatlıq, dinclik. Üç gündür *qoşlığım* yox. Oğul, at üzərindən məni qap, döşəgimə çıqar, -dedi (106).

QOŞMAQ f. 1) Bir hadisə, əhvalat haqqında düşünüb söyləmək. /Düzdü/ *qoşdı.* Qoşa söz. Dədəm Qorqut gəlübən boy boyladı, soy soyladı, bu Oğuznaməyi düzdi-*qoşdı* (41); 2) Bir-

gə, bərabər, birlikdə getmək. Yanındağı üç yüz yigidin mana yoldaşlığa *qoşdı* (108).

QOŞUN is. Dövlətin nizami, hərbi qüvvələri. ◇ Qoşun düzmək. Hərbi hazırlıq. Alaylar bağlandı, *qoşunlar* düzəldi (126).

QU I. is. Söz, xəbər. ◇ Qu ayıtmaq. Dinib danışmaq. Ulu kiçi qalmıya, - söz ayıdana, Qarı-qoca qalmıya, *-qu ayıdana* (89).

QU II. zoon. Qu quşu.Qanturalı baqdı, gördi bu qonduğı yerdə *quğı quşları*, turaclar, tumalar, kəkliklər uçarlar (90).

QUV is. 1) Səs-küy , dedi-qodu. ◇ Quv quvalamaq. Söz-söhbət yaymaq. *Quv quvaladı*, din dinlədi (33); 2) Gözdən salmaq. Bir-birinə söylədilər. - Gəlün oğlanı babasına *quvlıyalum* (36).

QUZĞUN zoon. Leş yeyən quş. Gördi kim, uçarda *quzğun*, tazı tolaşmış, yurta qalmış (44).

QUZU zoon. 1) Qoyunun balası, quzu. ◇ Quzu bişirmək. Quzu ətindən hazırlanmış yemək. Ağam Qazan, gecədən bir *quzı bişirüb* dururam (46); 2) (məc.). Quzu vermək. Arzuya çatmaq, bala vermək. Ağayılda qoyunın qarımışdı, *quzı verdi*, - axır (66).

QUZUCAQ//QUZICIĞ məc. Ağca qoyunlar olan yerdə. Bir *quzıcığı* olmazmı olur (47); Ağayılda ağca qoyun *quzıcığın* süsərmi olur? (92); *Quzucığı* mənrişib belə keçdi (73).

QUYU is. Quyu. Hələ Qazanı gətürdilər, Tumanın qəl'əsində bir *quyuya* bıraqdılar (116).

QUYMAQ f. Qulaq asmaq, dinləmək. Bin, söylərsən, birisin quymaz (33).

QUYRUQ is. Heyvan quyruğı. ◇ Quyruq çırpmaq. Quyruq bulamaq. Ağca qoyun gördügində *quyruq çırpub* qamçılayan (45); *Quyruğı* ilə başı birlikdə, ayırmadan, Dəf'i Basat qoçı basub boğazladı, dərisini yüzdi, *quyruğilə* başını dəridən ayırmadı (101).

QUL is. 1) Qədim dövrlərdə müharibədə əsir tutulub satılan adam. ◇ Qula buyurmaq. Qulu işə göndərmək. Qara hindu *qullarıma buyuraydım*, Səni para-para toğrıyalardı, ağac. (48). *Qulla* qırq cariyə birlikdə. Qırq evli *qulla* qırq cariyə oğlı başına çevirdi, azad eylədi (78); Xidmətçi, qul olmaq. Qırq yigidlən oğlum gətürüb durursan, *qulun olsun* (48); 2) Allahın yaratdığı bütün insanlar isə Allahın qulları sayılır. Həq-təala Cəbrayılə buyurdı ki, Ya Cəbrayıl, var, şol *quluma* qırq ərcə qüvvə verdim, - dedi (109).

QUL-QARAVAŞ is. Cavan, qüvvətli qulluqçular. *Qul-qaravaşını*, dilərsən? Altun-aqçanı dilərsən, vereyim? - dedi (64)

QULAQ anat. Eşitmə orqanı. Oğlancıqların, kiminün burnın, kiminün *qulağın yeməgə* başladı (99); ◇ Qulağın qaldırmaq. Şübhələnmək, nə isə duymaq. At başını yuqarı tutdı, bi *qulağın qaldırdı* (60); Məc. Qulağına səs toqunmaq. Nə isə na mə'lum səs eşitmək. Böylə dikəc oğlanın *qulağına səs toquno* (39); Qulağın almaq. Nə edəcəyini öyrəndi. Boyı uzun, beli ince Burla xatun boynilə *qulağın aldı*, düşdi (47); Qulağı altun küpəli. Altun sırğalı... qurqurma qurşaqlu, *qulağı altun küpəli* Qalın Oğuz bəglərini bir-bir atından yığıcı Qazlıq Qoca oğl bəg Yegnək çapar yetdi (49); Qulağına qoymaq. Eşitməzlik etmək. Ərin sözini *qulağına qoymaz* (33); Qulaq urmaq. Ədəbərkanla dinləmək. *Qulaq urıb* dinləyəndə ümmət görkli (32).

QULUN//QULAN. zoon. At balası. Qulun vermək (məc.). Arzusuna çatmaq. Şahbaz atın qarımışdı, *qulun verdi*, axır (66); Qulan bilür (məc.). Heyvanların gəzdiyi yerlərdə iz, nişan qoyması. Gənəz yerlər çəmənlərin *qulan bilür* (32); Qulunu olmaq. Atı olanın qulunu olar. Hey, ana! Ərəbi atlar olan yerdə, Bir *qulunı olmazmı* olur? Sən sağ ol, qadın ana! Babam sağ olsun (47).

QULUNCIĞ zoon. Kiçicik at balası. ◇ Qulunciğ aldırmaq. Atımın balasın aldırmaq. *Quluncığım aldırmışam*, kişnəyəyinmi? (79).

QULP is. Tutacaq, dəstə. ◇ Qulpa yapuşmaq. Əl yerindən tutmaq. Mən aşağı *qulpa yapuşuram*, sən yuqarı *qulpa yapuşursan* (92).

QUM//QUN is. Qum, daşlı-qırıntılı çınqıl. ◇ Qunlar döşəmək. Palçıq yollara qum, çınqıl tökmək. Atlu batub anun balçığına *qunlar döşəyim* (86).

QUNT sif. Parlaq. Başımda *qunt* işıqlar saqlardım səninçün (70); Alın-başa qunt işuğım urardım (124).

QUNC is. Corabın, uzunboğaz çəkmənin dizə qədər qalxan hissəsi. Ədüginin *quncuna* soqdı (101).

QUR'AN is. Müsəlmanların müqəddəs dini kitabı. ☐ Qur'an görkli. Gözəl Qur'an. Yazılıb-düzülüb gögdən endi tənri

elmi *Qur'an görkli*, Ol Qur'anı yazdı-düzdi, ülәmalar ögrәnincә göydi-biçdi, Alimlәr sәrvәri Osman üffan oğlı, görkli (32).

QURBAN is.әr. Adәtlәrә görә Allah yolunda kәsilәn qoyun vә ya başqa bir heyvan; ◇ Qurban olmaq. Әziz vә әvәzsiz olanın uğrunda öz ömründәn keçmәk dilәyi. Qara başım *qurban olsun* bu gün sana! -dedi, zarılıq eylәdi, ağladı (38).

QURTULMAQ f. Xilas olmaq. Dәpәgöz aydır: Oğlan, *qurtuldınmı?* (101); Ya pәs necә *qurtuldun*, Dәli Qarcarın әlindәn? -dedi (56).

QURULMAQ f.mәc.n. Yedi kişi ilә *qurulurdı* mәnim yayım (95).

QURCUŞMAQ f. qarş.n. Bir-birindәn tuta-tuta. *Qurcuşuban*, uğraşuban tağdan endi (91).

QUSQUN is. Atın quyruğunun altından keçirilәn qayış. Bәkil aydır: -Alplar içindә bizi *qusqunumuzdan* balçığa baturdın (105).

QUTBӘ//QUDBӘ is.әr. Xütbә, xitab olunma. Qutbә oqunma. Xitab olunma. Әziz tәnri adına *qüdbә oxutdılar* (97); □ Qutbә görkli. Gözәl xitab. Sağış günindә ayna görkli, ayna güni oqıyanda *qütbә* görkli (32).

QUTLU sif. 1) Xoşbәxt, uğurlu. ◇ Qutlu olmaq. Uğurlu olmaq. Dibdә oturan xas bәglәr, *Qutlu olsun* dövlәtiniz! -dedi (63); 2) Şәxs adlarının qabağında gәlәrәk lәqәb kimi işlәnmişdir. Qutlu Mәlәk, ölmәgәmi-yitmәgәmi getmişdim, yatacaq yerim genә bu xәrab olasıydı (33).

QUTSUZ sif. Uğursuz, ayağı ağır (mәc.). *Qәdәmi qutsuz* gәlin deyincә, udsız gәlin desünlәr (112).

QUCAQLAMAQ f. Mehribanlıq vә nәvaziş әlamәti olaraq bir-birini qolları arasında köksünә sıxmaq. Beyrәk at köksin *qucaqladı* (60); Bәdәvi atının boynın *qucaqladı*, yerә düşdi (37).

## Ğ

ĞAZİ is.әr. Döyüşçü. Baqisin *ğazılara* bәxş etdilәr (97); *Ğazılar* başına nә gәldügin söylәdi (109); □ Ğazı әrәnlәr - qalib gәlmiş döyüşçülәr: *Ğazi әrәnlәr* başına gәldügin aydı-verdi (126).

ĞAİB, sif.әr. 1) Yox olan; □ Ğaib olmaq. Görünmәz olan: Tağ çiçәk anan südilә sәnin yarana mәlhәmdir, -dedi, *ğaib oldı* (39); 2) Görünmәz alәmdәn, müqәddәs alәmdәn: *Ğaibdәn* dürlü xәbәr söylәrdi (31).

ĞAYӘT zәrf. әr. Çox böyük. *Ğayәt* sarb kәlisaydı (119).

ĞALABA sif. Çox böyük. *Ğalaba* toyum oldı (112).

ĞAN x.is. Bayındır xanın atasının adı. Qam *Ğan* oğlı Bayındır yerindәn turmışdı (52).

ĞAFİL zәrf. Birdәn, qәflәtәn: *Ğafil* başın, ağrısın beyin bilür (32); □ Ğafil olma. Qәflәtdә olma, ayıq ol: *Ğafil* olma, görklü başın qaldır, yigit! (114).

ĞAFİLLӘ zәrf.әr.az. Birdәn, ğafildәn: Bazırganlar yatur ikәn *ğafillә* beş yüz kafәr qoyuldılar, çapdılar (53).

ĞAFİLLİCӘ zәrf.әr.az. Xәbәrsiz-әtәrsiz. Aydır: -Bәglәr, *ğafillicә* qara başım-gözüm uyxuda ikәn düş gördi (95).

ĞEYRӘT is.әr. Qeyrәt, güc, bir iş görmәk hissi: Oğul da qılıc quşanur baba *ğeyrәtiçün* (71); ◇ Ğeyrәt gәlmәk. Bir iş görmәk, hәrәkәtә gәlmәk hissi: Qazana *ğeyrәt gәldi* (46).

ĞӘZA is.әr. ◇ *Ğәza eylәmәk* - kafәrlәrә qarşı müqәddәs yürüş eylәmәk: Baş qaldıran kafәrlәri öldürdi, *ğәza eylәdi* (53); Ğәza etmәk. Kafәrlәrә qarşı yürüş etmәk: Üç yüz kafәr öldürdüm, ğәza etdim (46).

ĞӘZӘB is.әr. Acıq, hiddәt. ◇ Ğәzәb eylәmәk: tәnbeh etmәk, acıqlanmaq: Bayındır xan sәni çağıra, sana qatı *ğәzәb eylәyә* (37).

ĞӘNİ sif.әr. Varlı, Qüdrәtli (Allah); □ Ğәni Tanrı. Varlı, dövlәtli Tanrı: Sana sığındım, comәrdlәr comәrdi, *ğәni Tanrı*, mәdәd! -dedi (99).

ĞӘRİB sif.әr. Kimsәsiz, yad yerdә olan: □ Ğәrib baş. Kimsәsizlikdәn әzab çәkmәk. *Ğәrib başın* qovğada qaldımı? (105).

ĞӘRİM is.әr. Әvәz, qәramәt; ◇ Ğәrim qoymaq. Әvәz qoymaq: Biz anı sana *ğәrim qouruz*, - dedilәr (49).

ĞIZILDAMAQ sәs.tәq.f. Ğızıldılı sәs çıxarmaq. Mancılığı ağır taşdan *ğızıldayub* qatı enәn (30).

ĞIRIM is. Müharibә, döyüş. ...qarğu sügü ucında әr bögirdәn, *ğırıma* yetdügündә "kimsәn?" deyü sormıyan Qıyan Selcik oğlı Dәli Tondaz sәninlә bilә varsun!,- dedi (95).

ĞOVĞA//ĞOĞA is.әr. 1) Hay-küy. ◇ Ğoğa salmaq. Sәs-küy salmaq: Qanlu quyruq üzüb çap-çap yudan! Avazı qaba köpәklәrә *ğoğa salan* (45); 2) Dava, müharibә. ◇ Ğovğada qal-

maq. Müharibədə qalmaq. Ğərib başın ğovğada qaldımı? (105); □ Ğovğa günü. Müharibə günü: *Ğovğa güni* ögdin dəpən alpınuz kim? (114).

## D

DA əd. 1) Tə'kid və israr bildirir. Tur, ətmək gətir, yeyəlim, bu *da* yesin (33); 2) Söylənən fikrə yəqinlik çaları verir. Hey şu dəli məğmun mana *da* şayəd ancalayın olmaz sözlər söylər, - dedi (64); Sənin *də* içində binədin varsa, yigit, degil, mana (40); Çün sən Qazana düşmən oldın, biz *də* düşməniz, - dedilər (124); 3) Dəxi ədatı mə'nasında. Bin *də* quyruqsuz-qulaqsız köpək dilədi (56); Oğul *da* qılıc quşanur baba ğeyrəti üçün (71); Allah təala sana *da* bir qız verə, - dedilər (52).

DAVUL is.ər. Təbil, çubuqlarla vurularaq çalınan qədim musiqi aləti. Gumbur-gumbur *davullar* çalındı (115).

DADI is. Tərbiyəçi, dayə. Mərə, *dadı*, mən avçı degiləm, bəg oğlı bəgəm, həp sizə, - dedi (54); Əmma mən Banıçiçəgin, dadısıyam (54).

DAZ sif. Otsuz-bitgisiz yer. □ Daz yer. Otsuz, quru yer. *Daz yerdə* turağay atmağa yaxşı! -dedi (69).

DAİM, zərf. Həmişə, əbədi olan. Həmişə Qazanın başına bunlu gəlsün, tayısı Aruzı *daim* ana tursun (123); ◇ Daim turan. Əbədi olan, Allah. *Daim* turan Cəbbar Tənri (83).

DAYAMAQ f. Möhkəm yumruqla saxlamaq. Oğlan bu qatla buğanın alnına *yumruğunı dayadı*, sürdi meydanın başına çıqardı (36).

DAYƏ is. fars. Tərbiyəçi qadın. Hey, hey, *dayələr*, babam mana bən səni yüzi niqablu Beyrəgə vermişəm, deyərdi (54); Oğlancuğını *dayələrə* verdi saqlatdı (35).

DAYI is. Ananın qardaşı. *Dayım* Əmən imiş, anı bildim (95).

DAM is.fars. Dustaqxana, türmə. Oğuz yigitlərinə bunı *dam* etmişdi (110).

DAMAĞ is.ər. Kef, əhval, həvəs. Tatlu *damağ* verüb soruşduğum (83); ◇ Damağı qurumaq. Kefsiz, əzablı. (*Dili*) *damağı quruyub* dört yanına baqdırdınmı? (71).

DAN-DANIŞUX//DAN-DANSUX. Bu gün, səhər tezdən. Səhər erkən İstanbula gəldilər. *Dan-danışux* ilə yəxşi ərməğanlar aldılar (57); Oğul, *dan-dansux* bu gün Oğuzda nə gördün? (55).

DAR sif. Kiçik, balaca. Qoşa badam sığmayan *dar* ağuzlum (93).

DARIMAQ f. Dağıtmaq, çapıb-talamaq. Qazan aydır: ...Qulanla sağın-keyikə qonşı yurdım! Səni yağı nerədən *darımış*, gözəl yurdum! (44).

DEGƏC//DİGƏC zərf. Deyincə, deyən kimi. Dədə Qorqud böylə *degəc* Dəpəgöz aydar (99); Boylə *digəc* Qalın Oğuz arqası, Bayındır xanın göygüsi Salur Qazan qaba dizinin üzərinə çökdi (52); Böylə *digəc* oğlanın qulağına səs toqundı (34).

DEDİGİ//DEDİYİ f.sif. Söylədiyi, sadaladığı, qeyd etdikləri. Nə *dedigimi* yetürün, geyinümlən mənim şahbaz atımı götürün (53); Qaragünə aydır: - Qara bulut dedigin sənin dövlətindir (44); Qanı *dedigim* bəg ərənlər? (126); Əgər bu *dedigim* nəsnələri götürərsinüz, xoş, verdim (56).

DEGİL əd. 1) İnkarlıq ədatı. Əgər sağ-əsən *degil* isə başınuza çarə edin (40); 2) "-dir" xəbər şəkilçisi qəbul etdikdə ismi cümlələrin xəbəri olur. Ol öylə adam *degildir* kim, sana görünə! - dedi (54).

DEMƏK f. 1) Bir sözü, bir mə'lumatı şifahi şəkildə söyləmək, ifadə etmək. Adını bən *dedim*, yaşını Allah versün! - dedi (54); Yeyərsə yesün, yeməzsə, tursun, getsün, *-demişdi* (42); Oğlan səni öldürmədin, sən oğlanı öldüri görgilə! - *dedilər*! (37); 2) Nəql etmək, rəvayət etmək. Təkura xəbər vardı, - Oğuzdan Qanturalı *derlər*, bir yigit var imiş, qızğın diləyü gəli yürür, - *dedilər* (87); Rəsul ələyhissəlam zəmanına yaxın Bayat Boyından, Qorqut Ata *derlər*, bir ər qopdı (31); 3) Xəbər vermək, deməк, çatdırmaq. Taş Oğuz bəglərinə xəbər oldı işdə Qazan gəldi, - *dedilər* (126); 4) Əmr etmək, sərəncam vermək, tapşurmaq. Adın nədir, yigit, *degil* mana! (121); 5) Sayılmaq, hesab olunmaq. - Ana həqqi-Tənri həqqi *degilməsəydi*, qalqubanı yerindən turaydım, yaqanla boqazından tutaydım (53); 6) Qərara gəlmək. *Deirəm*, qanın alalım, həm sizə ismarlamış, "mənim qanım alsun", - demiş (126); 7) Yorulmadan. Gecə-gündüz *deınədilər*, yortma oldı (126).

DƏVƏ is. Qədim zamanlardan indiyə qədər səhra və quru çöllərdə istifadə olunan davamlı, əti yeyilən və bol yun verən heyvan. *Dəvələrinə* vardı, bin buğra - nər seçdi (57); Atdan ay-

ğır, *dəvədən* buğra, qoyundan qoç öldürgil (35); ◇ Dəvə vermək - hədiyyə, bəxşiş vermək. Qaytabandan qızıl *dəvə vergil,* bu oğlana, yüklət olsun, hünərlidir! (36); ◇ Dəvə bozlatmaq - qapıb-talamaq, ürkütmək. *Dəvələrin* bozlatdılar, Qara Qucda Qazlıq atlarim kişnətdilər (123).

DƏĞ B a x: Tək.

DƏDƏM QORQUD//DƏDƏ QORQUT x.is. Dədə Qorqud. "Kitabi-Dədə Qorqud" dastanının müəllifidir; bununla yanaşı o, həm də böyük Oğuz tayfasından çıxmış ulu ozan, tayfa ağsaqqalı, Oğuzun qədim şair və nasirlərindən biridir. Qorqud Ata Oğuz tayfasında baş verən bir çox tarixi və ictimai hadisələrin yaxın iştirakçısı olmuş və onları türk dastan ən'ənələri əsasında "boy"lar şəklində tərtib etmişdir. Dastandakı hadisələrin, qədim türk bədii düşüncələri və ən'ənələrinin tərtib edilməsi Dədə Qorqudun əski türk ədib, şair və ozanı olduğunu aydın göstərir (Dədə Qorqud sözlərinin yaranması və mənşəyi haqqında Azərbaycan alimi, mərhum professor M.Seyidovun dəyərli əsəri vardır. "Qorqud" sözünün etimoloji təhlili və obrazının kökü haqqında qeydlər" - "Azərbaycan" j.,1979, N-1, səh.199). Məsləhət gördilər ki, *Dədəm Qorqud* varsun. Çağırdılar. *Dədəm Qorqut* gəlür oldı (55); *Dədə Qorqut* oğlanın babasına söyləmiş, görəlim xanım, nə söyləmiş (36).

DƏKİN qoş. Qədər. Qırq günə *dəkin* sıravardı geyəgüz, andan sonra bir dərvişə verəlim, -dedi (57).

DƏGMƏK f. 1) Çatmaq. Qorqut ata ayıtdı: - Axır zəmanda xanlıq gerü Qayaya *dəgə,* kimsənə əllərindən almıya (31); 2) Yayılmaq. Ağlı, qaralı seçən çağda. Köksi gözəl qara tağlara gün *dəkəndə* (34); 3) Çatmaq, yetişmək. Haqluya həqqi *dəkə,* haqsuza yüzi qaraluğı *dəgə*! (64); 4) Gəlib çatmaq (vaxt). Növbət Qazana *dəgdi* (126).

DƏGƏNƏK is. Başı toppuz çomaq. *Dəgənəgimcə* gəlməz mana (41).

DƏGİRMAN is. Dən, taxıl üyüdülən qurğu. Dəvə *dəgirmandan* gəlmədi, - diyər (33).

DƏLİ sif.fars. 1) Ağlı, şüuru yerində olmayan. Ay oğul, Banıçiçəgin bir *dəli* qartaşı vardır (53); 2) Qocaq, igid, qorxmaz, ürəkli. Burada şəxs adlarına əlavə edilərək obrazların daxili aləmi, onların hünərvərliyini səciyyələndirən epitet: Cılasun yigitlərlə Qaragünə oğlı *Dəli Budaq* soldan ötdi (55); Həqtəalaya *Dəli Domrulun* sözi xoş gəldi (58); Qıyan Selcik oğlı *Dəli Tondaz* səninlə bilə varsun! - dedi (95); Qıyan Səlcük oğlı Dəlü Donda çapar yetdi (49).

DƏLMƏK f. 1) Dağıtmaq. Quduz qurtlar evimi *dəlir* gördüm (44); 2) Deşmək. *Dəldi,* yay girişinə taqdı (103); Sadaqda oxum kişin *dələr* (108); ◇ Dəlüb keçmək (məc.) dalğaları yarıb keçmək; İlərü yatan dən,izi *dəldim* keçdim (95); Dərəşam suyunı *dəlüb* keçdilər (115).

DƏM is.fars. Qısa vaxt, an. Evin yağmalatdığın *dəm* Taş Oğuz bilə bulınmadı, səbəb oldur, - dedi (123); Həman *dəm* at saldı (96).

DƏMİR//DƏMÜR is. Dəmir, metal. Üç kişi sağ yanından, üç kişi sol yanından *dəmür* zəncirlə buğayı tutmuşlardı (36).

DƏMİR QAPI is. Qədim Dərbənd şəhərinə giriş qapısı, qala qapıları kimi, mühafizə olunmaq məqsədilə tikilmiş qapı. *Dəmir qapu*: Dərvənddəki *dəmür qapuyı* dəpüb alan, altmış tutam ala göndərinin ucında ər bögürdən Qıyan Səlcük oğlı Dəlü Donda çapar yetdi (49); □ Dəmir yay: dəmirdən hazırlanmış yay. ...*dəmür yaylı* Qıpçaq Məlikə qan qusduran, gəlübəni Qazanın qızın ərliklə alan Oğuzun ağ saqqallu qocaları görəndə ol yigidi təhsinləyən...Qarabudaq çapar yetdi (49); ... □ dəmir tonlu: müsəlləh, hərbi geyimli. Bir ağ-boz atlu, ağ ələmlü bəg, *dəmur tonlu* Oğuzun önüncə gəldi (120).

DƏMİR QAPU DƏRVƏND top. Dəmirqapu Dərbənddəki *dəmür qapuyı* döpüb alan...Dəlü Donda çapar yetdi (49).

DƏMİRGÜC x.is. Qaraca Çobanın qardaşının adı. Qabangüci, *Dəmürgüci* - bu iki qardaşı yanına aldı (43).

DƏMRƏN is. Oxun ucundakı dəmir ucluq. Üç yeləkli qayın oqlar atılanda *dəmrəni* düşdi (50).

DƏN,İZ//DƏNGİZ Dəniz. Ulaşuban sular taşsa, dən,iz tolmaz (31); □ Dən,iz qulunu - dəniz atı. Baybörənin oğlı üçün bir *dən,iz qulunı* boz ayğır aldılar (52).

DƏNLÜ qoşma. Kimi. Gördü kim, at Bəkilin, Bəkil üzərində degil, əmma bir quş *dönlü* oğlandır (107).

DƏPƏ B a x: TƏPƏ.

DƏPƏMƏK, B a x: TƏPƏMƏK.

DƏPƏGÖZ B a x: TƏPƏGÖZ.

DƏPƏRƏ, B a x: TƏPƏRƏ.

DƏPƏCƏ B a x: TƏPƏCƏ.

DƏRVƏND top. Dəbənd qalası. Kafər aydır. Qazanın qapulu *Dərvənddə* on bin, qoyunı vardır (43).

DƏRVİŞ is. fars. Qapı-qapı gəzərək, meydanlarda adamları başına yığıb peyğəmbərdən, imamlardan, Kərbəla hadisələrindən danışaraq pul yığan adam. Andan sonra *dərvişə* verəlim! -dedi (70).

DƏRD is.fars. Qəm, qüssə, kədər, ürək acısı. Əmma qızın *dərdindən* bənizi sarardı (215,98)

DƏRƏ is. İki dağ və təpə arasında, eləcə də düzənlikdə uzun, dərin çuxur. *Dərələrdə* kafərə qırğun girdi (77); Gördi kim, bir *dərənin* içində toz gah dərilür, gah tağılur (91).

DƏRƏ-DƏPƏ is. Dərəli-təpəli yer. Şahinin ardına düşdi, *dərə-dəpə* aşdı (116).

DƏRƏCİK is. Çala-çuxurlu. Eviniz ardı *dərəcik* degildimi? (64).

DƏRİ is. İnsan və heyvanın bədəninin üst örtüyü. Altmış ərgəc *dərisindən* kürk eləsə, topuqlarını örtməyən, altı ögəc *dərisindən* gülah etsə, qulağlarını örtməyən, qolı-budı xırancə, uzun baldırları incə, Qazan bəgün tayısı Atağızlu Uruz qoca çapar yetdi (49-50); ◇ Dərisini yüzmək. Dərisini soymaq. Bıçaq çıqarıb *dərisini yüzdi* (88).

DƏRİLMƏK f. Yığılmaq, gəlmək, toplanmaq. İç Oğuz, Taş Oğuz bəgləri Bayındır xanın söhbətinə *dərilmişdi* (52).

DƏRİN sif. Səthindən dibinə qədər xeyli məsafə olan yer. *Dərin* olsa baturdır, qalabalıq ona qorxudır (57).

DƏRGAH is.fars. 1) Allahın qarşısında. Məqsudimiz həqtəala *dərgahında* hasil oldı (91);2) Saray. Mənim ulu *dərgahımda* gəzə, mənlik eyləyə (79).

DƏRGÜRMƏK f. Qırmaq, məhv etmək. Yen,idən toğanını *dərgürmiyələr* (119).

DƏRLƏMƏK Bax: TƏRLƏMƏK.

DƏRMƏK f. Çatar-çatmaz. 1) At üstündə əglənməyib yortan Qazan sənin belin olmuş, üzəngiyə *dərmiyən* dizin olmuş (77); 2) Yığıb toplamaq. Bir yigidin qara tağ yumrusunca malı olsa, yığar-*dərər* (31); ◇ Dərib durmaq. Büzüşüb durmaq. Həb, bir yerdə *dərib dururam* (57); 3) Dərə bilmən. Özünə gələ bilməmək. Şundan bərü əqlim-usum *dərə bilmən* (44-43).

DƏRƏŞAM top. Yer adı. *Dərəşam* ucından keçdi, ol qardaşı tutılan qoruya gəldi (113).



DƏRNƏK is.Yığıncaq, toplu. Bir gün yolı bir *dərnəkə* uğradı, qondılar (110); Qanlu Oğuz ellərində *dərnək* var imiş, anda vardım (111).

DƏRNƏKSİZ sif. Yurdsuz. Ussı yoq, *dərnəksiz* kafər (49).

DƏRSİNMƏMƏK f. Qorxmamaq. Ağca tozlu qatı yaydan *dərsinməyən* (88).

DƏSTMAL is.fars. Burun dəsmalı. *Dəstmalın* əlinə aldı, bögürü-bögürü ağladı (52); *Dəstmalı* gözünə silcək, Allah-təalanın qüdrətilə gözi açıldı (66); ...sırça parmağın qanatsun, qanın *dəstmala* dürtsün, gözümə sürəyin (66).

DƏSTUR is.fars. Göstəriş, tarşırıq; ◇ Dəstur vermək. Tapşırmaq. Yad qızı həlalıma *dəstur versün* (75); Dəstur diləmək. İcazə istəmək. İçəri - söhbətə girdi, *dəstur dilədi* (111).

DƏSTURSUZCA zərf. Birdən, gözlənilmədən. Varıban *dəstursuzca* Bayındır xanın yağısın basan, altmış bin kafərə qan qusduran Ğəflət qoca oğlı Şir Şəmsəddin çapar yetdi (77).

DƏF'İ zərf. ər. Dərhal. Əzrayil dəxi babasının-anasının *dəf'i* canın aldı (83).

DƏXİ əd.ər. 1) Da,də mə'nasında. Oğul *dəxi* neyləsün, baba ölüb mal qalmasa (31); Mənim *dəxi* oğlım olsa, xan Bayındırın qarşusın alsatursa, qulluq eyləsə... 2) Artıq, daha. *Dəxi* kəndüsi tölə-tölə atlarına vardı (56).

Dİ əd. Tə'kid, əmr, xahiş bildirən ədat. Mərə, Dəlü Ozan, çal *di*; İmdi Qazan bəg, *di* bizi ög! -dedilər (114-65,276-117).

Dİ B a x: DE.

DİB is. 1) Dib, kök. *Dibin* ala baqar olsam, dibsüz ağac! (48); 2) Dara çəkilən yer, cəza verilən yer. Kafərlər Uruzı alub qənarə *dibinə* götürdilər (47); Məgər evləri önündə bir böyük ağac vardı, *dibində* bir yaxşı binar vardı (60); 3) Düşdüyü yer: Beyrək xan dəxi oqın atdı *dibinə* gərdəgin dikdi (57); ◇ Dibdə oturmaq. Məclisin yuxarı başında oturmaq: Eşikdəki inaqlar! *Dibdə oturan* xas bəglər! (63).

DİVAN is.fars. Məhkəmə, toplantı; ◇ Divana gəlmək - idarəyə gəlmək; Bəglər yığıldı *divana gəldi* (125); Qazan vardı, odasına girdi, yeddi gün *divana çıqmadı*...(125); Divana varmaq - idarəyə, məhkəməyə gəlmək. Yildi bir kərrə Bayındır xan *divanına varardı* (164).

DİVAR is.fars. Divar, evin divarı. Şöylə çalayım, səni mağara *divarına* kim, quyruğun mağarayı yaqlasun! - dedi (101).

DİDAR is.fars. Görünüş, üz, zahiri sima. Qazan aydır. Su həq *didarın* görmüşdür (44).

DİDİLMƏK f.məc.n. Parçalanmaq, ovulmaq, yaralanmaq. Ya qağan aslanın qaynağında *didiləm* (87); Buğa dizin çəkdi, buynızilə bir mərmər taşı yoğurdı, pənir kibi *diddi*! (87).

DİZ is.anat. Qıçın qatlanan hissəsi. Böylə dikəc Qalın Oğuz arqası, Bayındır xanın göykisi Salur Qazan qaba *dizinin* üzərinə çökdi (52). ◇ Dizin çəkmək. Hörmət əlaməti olaraq salam verib əyilmək. *Dizin çəkdi*, aydır: - Dövlətlü xanın ömri uzun olsun! Beyrək diri olsa, on altı yıldan bərü gəlürdi (58).

DİZİLMƏK Bax: DÜZÜLMƏK.

DİZCİK is. Dizlik. Döyüş zamanı zərbədən qorunmaq üçün dizlərə geyilən hərbi forma. *Dizcik*, qarucıq bağladı (112).

DİKMƏK B a x: TİKMƏK. Oxı nə yerdə (nerədə) düşsə, anda gərdək *dikərdi* (57); Kafərin sərhədinə irdilər, çadır *dikdilər* (87).

DİKDİRMƏK f.icb.n. Bir işi başqasına gördürmək. Şami günligi yer yüzünə *dikdirmişdi* (34).

DİKİLMƏK f.məc.n. Ban al-ala ev yanında *dikilsə*, gərdək görkli (7,33).

DİKİLİ Bax: TİKİLİ.

DİL is.anat. Danışıq, ünsiyyət vasitəsi olan üzv. At ayağı gülük, ozan *dili* çevik olur (36); Ağzın qurusun, çoban, *dilün* çürüsün, çoban (45); ◇ Dil çıqartmamaq. Dinib-danışmamaq. *Dil çıqartmadılar* (120). *Dili-damağı qurumaq*. Əzab-əziyyət çəkmək (məc.). *Dili-damağı qurıyıb* dört yanına baqdırdınmı? (72).

DİLBƏND is.fars. Çalma, döyüş zamanı istifadə edilən baş örtüyü. Qırq yigidinə *dilbənd* saldı, əl eylədi (41).

DİLƏK is. İstək, arzu, dua, yalvarış. *Dilək* ilə bir oğulı güclə buldım (73); Zira Dədə Qorqut vilayət issi idi, *diləgi* qəbul oldı (56); ◇ Diləgi qəbul olmaq. Arzusuna, istəyinə nail olmaq. Zira Dədə Qorqut vilayət issi idi, *diləgi* qəbul oldı (56).

DİLƏMƏK f. 1) Almaq, elçiləmək. Aydan arı, gündən görkli qız qardaşın Banıçiçəgi Bamsı Beyrəgə *diləməgə* gəlmişəm! - dedi (56); Dəlü Qarcar qız qardaşın *diləyəni* öldürür (55); 2) Yalvarmaq, övlad istəmək. Dəpə kibi ət yığ, göl kibi qımız sağdır! Ulı toy elə, hacət *dilə*! (35); 3) Cəhd etmək. *Diləydi ki* oğlanı həlak qılaydı (36); 4) Xilas etmək. Qaracıq çoban, anamı kafərdən *diləyəyim*, at ayağı altında qalmasun,-dedi (57-48).

DİN is.ər. Din, Allahın birliyinə inanış. Hecəsinləyin düz oqınsa, yasin görkli, Qılıc çaldı, *din* açdı şahi-Mərdan Əli görkli (32); *Dini* - Məhəmməd yanına dürişəyim, səninçün! -dedi (107); □ Din düşməni. Allahın birliyinə iman gətirməyənlər. Yedi bin qaftanının ardı yırtıxlu, yarımından qara saçlu, sası dinlü, *din düşməni* alaca atlu kafər bindi (42); Din sərvəri. Din başçısı. Məhəmməd peyğəmbər. Tanrı dostı, *din sərvəri* Məhəmməd görkli (32).

DİN is.Səs-küy, deyib-danışmaq. ◇ Din dinləmək. Səs eşitmək. Quv quvlamadı, *din* dinlədi (33).

DİNLƏMƏK f. Eşitmək. Qulaq urub *dinləyəndə* ümmət görkli (83); Alnı açuq comərd ərənlər *dinləsin*! -dedi (54).

DİRƏK is. 1) Dayaq. Bir tama *dirək* ururlar, ol tama tayaq olur (35); 2) Arxa, kömək. Bizə misgin umudı, Türküstanın *dirəgi* (99).

DİRƏK TƏKUR x.is. Düzmürd qalasının gözətçisinin adı. Adına Arşun oğlı *Dirək Təkur* deyərlərdi (94).

DİRİ sif. Canlı, sağ olan, yaşayan. Bir yigit olsa, *dirisi* xəbərin gətürsə, çırğab (çuxa), altun aqça verərdim (58); Mərə, ya bənim babam ölümidir, *dirimidir*? (119).

DİRİLMƏK f.məc.növ. Canlanmaq, cana gəlmək. Ölən adam *dirilməz*, çıxan can gerü gəlməz (31).

DİRGÜRMƏK f. Diri aparmaq. Gərək bəni öldürüm, gərək *dirgürün*, qoyu verin! - dedi (40).

DİRSƏ XAN//DƏRSƏ XAN (Dursa xan) antrp. Oğuz bəylərindən birinin adı. Məgər *Dirsə xan* deyirlərdi, bir bəgün oğlı-qızı yoqdı; *Dərsə xan* aydur: -Bayındır xan bənim nə əksüglügüm gördi? (34)

DİTRƏMƏK f. Titrəmək, coşmaq. Hərəkətə gəlmək (burada). *Ditrədi* mənim canım cuşə gəldi (80).

DİŞ is.anat. Otuz iki *dişdən* çıqan bütün orduya yayıldı (106).

DİŞİ sif. Dişi, qadın tayfası. Dirsə xan *dişi* əhlinin sözilə ulu toy elədi, hacət dilədi (35).

DOYMAQ f. Doyunca yemək. Qara tonuz ətindən yəxni yedirdin *doyamadım* (60).

DOLAMAC sif. Dolay-dolay. *Dolamac* yollarını qadir qoyursa, dünlə yortam (86).
DOPALANMAQ f. Birlikdə. İç Oğuz bəglərilə Qazan *dopa-dəpdi* (50).
DOST is.fars. Yaxın yoldaş, dost. Görəyim, Oğuzda mənim *dostum*, düşmənim kimdür? - dedi (62); Ol ögdigim yuca Tanrı *dost* olubanı mədəd irsün (36).
DOXARLI d.is. Şahinçi, şahin ovlayan. Tuladları, *doxarlı-yı* qodığım, Yağı yordı əlümdə qıl kişlim, ayğır malı (63).
DÖVLƏT I is.ər. Ölkənin hakim sinfinin mövcud qurumunu qorumaq məqsədini daşıyan siyasi təşkilat. Qalın Oğuzın *dövləti* qalmış, yigit arxası Salur Qazan yerindən turmışdı (42); Daim gəldügində tursa, *dövlət* yaxşı (96).
DÖVLƏT II is.ər. Mal, sərvət, mülk, pul və b. maddi ne'mətlərin məcmusu. Könlün yuca tutan ərdə *dövlət* olmaz (31); On otuz on yaşında tolsun, həq sizə yaman gətürməsin, *dövlətiniz* payəndə olsun, xanım hey! (31); ◇ Dövləti olmaq. Ağıl, şüur və tədbirli olmaq. Baba malından nə fayda başda *dövlət* olmasa...(31).
DÖZƏN OĞLI ALP RÜSTƏM x.is. Qədim türklərdə ən'ənəvi olaraq müəyyən sosiyyəvi hərəkətinə görə verilmiş şəxs adı. Qalqubanı yerindən turı gələn, İki qardaş bəbəgin öldürüb zəlil gəzən, *Dözən oğlı Alp Rüstəm* mana derlər, -dedi (121).
DÖKMƏK//TÖKMƏK f. Qəhrəmanlıq göstərmək. Oğuz ellərinin adət-ən'ənələrinə görə hər hansı bir oğlan bir qəhrəmanlıq göstərməyincə ona ad qoymazlardı. Dastanlarda bu ən'ənə xüsusilə öz əksini tapmışdır. Ol zamanda bir oğlan baş kəsməsə, qan *dökməsə* [ona] ad qoymazlardı (53); Gördilər kim, ol yigit kim, baş kəsübdür, qan *döküb dür*, Bayböre bəgin sağında oturar (54).
DÖGMƏK//DÖYMƏK f. Əziyyət vermək, əzaba salmaq, incitmək. Kimni *dögdi*, kiminin başın yardı, qızlar oturan otağa gəldi (64); Keçənindən otuz üç aqça alurdı, keçmiyənindən *dögə-dögə* qırq aqça alurdı (79).
DÖGÜLMƏK f.məc.n. Musiqi alətində çalmaq: Gumbır-gumbır nəqarələr *dögüldi* (50).



DÖGÜŞMƏK f.q.n. Vuruşmaq, döyüşmək. Uruşmadan, *dögüşmədən* aləmi toldurayım (76); Gəl börü, mərə kafər, *dögüşəlim*! - dedi (120).
DÖL is. Döl. *Dölün* almaqdan səfan varsa, Şökli Məlik, qara gözlü qızın varsa... (49)
DÖLƏGİM is. Qadın, ana, dünyaya övlad gətirən... Qavunım, verəgim, *dөləgim* (35).
DÖNƏBİLMƏZ antr. Oğuz bəylərindən birinin adı. Əmən gəlsün, Alı Rüstəm gəlsün, *Dönəbilməz* Dülək Uran gəlsün, gerü qalan bəglər həp gəlsün! - dedi (124); Andan *Dönəbilməz* Dülək Uran altı pərlü çomağılə at dəpüb gəlüb yuqarıdan aşağa kafəri qatı urdı, alımadı (96).
DÖNMƏK f. Qayıtmaq, qayıdıb gəlmək. Dədə *döndi*, Baybörə bəgün evlərinə gəldi (56); Gördi kim, oğrı köpək, yekə tana evini bir-birinə qatmış - tavuq komasına, sığır tamına *dönmüş* (33).
DÖNƏ-DÖNƏ zərf. Dəfələrlə, tez-tez. *Dönə-dönə* savaşayın, *dönə-dönə* çəkişəyin (70).
DÖRD s. 4 rəqəminin adı. Ozan aydır: Qarılar *dörd* dürlüdür: birisi soldıran soydır, birisi toldıran toydır, birisi evin tayağıdır, birisi necə soylərsən, bayağıdır (33); Oğuzda *dört* yigit niqabla gəzərdi (87).
DÖŞƏK is. Yundan və pambıqdan hazırlanan yatacaq vasitəsi. Küçücik tonuz şülənli, bir torba saman *döşəkli*...kafər (119).
DÖŞƏMƏK f. Oturmaq üçün yerə parça-palaz açmaq, sərmək. Ala qalı *döşədilər*, oturdı (87); Kimün ki, oğlı-qızı yoq qara otağa qondurun, qara keçə altına *döşəyin* (34).
DUA is.ər. Allaha üz tutub kömək diləmək. *Duaları* müstəcab olurdi (52); ◇ Dua eyləmək. Allaha yalvarmaq. Böylə di gəc Qalın Oğuz bəgləri yüz kökə tutdılar, əl qaldırıb, *dua eylədilər* (52).
DÜZÜLMƏK f.məc.n. Hazır olmaq vəziyyəti. Alayla bağlandı, qoşunlar *düzüldi* (126).
DÜZMÜRD top. Qala adı. *Düzmürd qalası*. Günlərdə bi gün *Düzmürd qəl'əsinə* gəldi (94).
DÜKƏNMƏK B a x: TÜKƏNMƏK.
DÜKƏTMƏK B a x: TÜKƏTMƏK.

DÜGÜN is. Şənlik məclisi, toy. *Dügün* qanlu olsun, xan qızı, - deyü barmağından altun yüzügi çıqardı, qızın barmağına keçürdi (65); ◊ *Dügün-diring etmək*. Böyük toy məclisi açmaq. Yavuqlısı vardı, tez *dügün-diring* etdilər (112); *Dügün yarağı görmək*. Toy şənliyinə hazırlıq. Ağır *dügün yarağın gördi* (57).

DÜGMƏK f. Bağlamaq, dügün vurmaq. Bığın ənsəsindən yedi yerdə *dügən* ərənlər əvrəni, Qazan bəgin qartaşı Qaragünə çapar yetdi (49).

DÜGMƏ I is. Paltara tikilən düymə...Köksü qızıl *düg-mə*(li), əlləri biləgindən qınalı...kafər qızları... (42).

DÜGMƏ II sif. Şiş, dağın zirvəsi, təpəsi. *Dügməsi* böyük bizim tağlarımız olur (80).

DÜLDÜL is. Həzrəti Əlinin atının adı. Şahimərdan Əlinin *Düldülinin* əyəri, ağac (48).

DÜLƏKURAN antr. İlək qocanın adı. Bunı gördi, İlək qoca oğlı Dönəbilməz *Düləkuran* meydana girdi (121).

DUVAQ is. etnoqr. Gəlin gedən qızın üzünü örtən tül örtük. Vay al *duvağım* iyəsi. Vay alnum - başım ümidi xan Beyrək! - deyü ağladı (58).

DURUŞDURMAQ f. Səbir, dözüm. Yığışdırsun, *duruşdur-sun* günahınızı Adı görklü Məhəmməd Mustafa yüzi suyuna bağışlasun, xanım, hey!... (67)

DUXA QOCA antr. Dəli Domrulun atasının adı. Qədim etnonimdir (dukak və ya Tokak). Bu titulu deyilənlərə görə, Oğuzun yabğusu (hökmdarı) qoşunlarının başçısı, Səlcuq bəyin atası daşımışdır (262). Məgər xanım, Oğuzda *Duxa Qoca* oğlı Dəli Domrul deyərlərdi, bir ər var idi (79).

DUŞAQ is. At ayağına vurulan buxov. Burada (məc.) duzaq, əngəl, manеə. ◊ Duşaq olmaq (Duzaq olmaq). Vəli, mana sən yaman yerdə *duşaq* oldun, oğul! -dedi (70).

DÜDÜK is. (burada məc.) borudan tökülən kimi. Burnundan qanı *düdük* kimi şorladı (202,94).

DÜZ I sif. Dəqiq, düzgün, doğru. ◊ *Düz oxunmaq*. Dəqiq oxumaq. Hecəsindən *düz oqınsa*, yasin görkli (6-32).

DÜZ II is. Səhra, boş yer. ◊ *Düzə dikmək*. Düzdə, səhrada tikmək. Ala bargah otaqların *düzə dikdi* (124).

DÜZMƏK f. (məc.). Özü yaradıb, özü də danışmaq. Dədəm Qorqud boy boyladı, soy soyladı, bu "Oğuznamə"yi *düzdi*, qoşdi (41).



DÜM sif.şid.dərəc. Qapqara. □ *Düm qara*, zil qara. *Düm qara* pusarıq ordumın üzərinə tökülü gördüm (44); Qara bağrı sarsıldı, *düm yürəgi* oynadı, qara qıyma gözləri qan-yaş toldı (72).

DÜN I zərf. Dünən. *Dün* yoq, ötəgi gün evin bundan keçdi (47).

DÜN II zərf. Gecə-gündüz. ◊ *Dün qatmaq* - gecəni-gündüzə qatıb yol getmək. *Dün qatdılar*, Oğuzun sərhəddinə yetdilər (115); □ *Dün uyxusi*. Gecənin yuxusu. *Dün uyxusundan* kafər otağa qoyıldı (57).

DÜN III is. Günəş, gün. *Dün burcuğu*. Günəşin batan çağı. Din düşməni alaca atlu kafər...*dün burcuğunda* Qazan ordusına gəldi (42).

DÜNYA is.ər. Dünya, kainat, yer üzü. İmdi qanı bəg ərənlər? *Dünya* mənim deyənlər? ...Gəlimli-gedimli dünya, Son ucı ölümlü *dünya* (93); Bu *dünyayı* ərənlər əqllə bulmuşlardır (88); On ayda *dünyaya* gətirdigim, oğul (52); □ *Dünyayi-aləm*. Yer üzü, kainat. *Dünyayi-aləm* kafərin gözünə qaranqu oldı (48).

DÜNLƏ zərf. Gecə vaqtı. Çaqmaqluca çobanları *dünlə* yügürdən (45); *Dünlə* karvan keçdigin torağay bilür (32).

DÜNLÜK is. Damın üstü. *Dünlügi* altun ban evimin qəbzəsi, oğul (47); Qazan bəgün *dünlügi* altun ban evlərini biz gətürmişüz (49); Baybörə bəgün *dünlügi* altun ban evinə şivən gəldi (57).

DÜRLİ sif. Müxtəlif, maraqlı. Ğaibdən *dürlü* xəbər söylərdi (31).

DÜRTMƏK f. Bir şeyi zorla keçirmək, yerləşdirmək. Oğlım idigin andan biləyim, sırça parmağını qanat, qanını dəstmala *dürtsün*, gözümə sürəyün (66).

DÜRTÜŞMƏK f.qarş.n. Zorla bir yerə girmək. *Dürtüşər-kən* ala göndərin ufanmasun (35).

DÜŞMƏK f. 1) Getmək. Qaraca çoban zərb elədi, qaba ağacı yerlə-yurdla qopardı, arqasına aldı, Qazanın ardına *düşdi* (46); 2) Yıxılmaq. Buğa ayaq üstinə turmadı, *düşdi* (36); 3) Enmək. *Düşdilər*, işrətə məşğul oldılar (90); Qaçmı ilə işarət qılub "Odaya düşün!" - dedi (91).; 4) Haqqı, ixtiyarı olmamaq, cəsarət etməmək. Mərə, qavat oğlı, dəlü qavat, sana *düşərmi* bitəkəllüf bənim üzərimə gələsən? - dedi (64); 5) Xatırlama

mə'nasında. Qara başına *düşəndə* gərəklüdür, - dedi (70); 6) Olmaq mə'nasında. Ana rəhminə *düşüncə*, toğmasa yeg (32).

DÜŞMƏN is.fars. Birinə qarşı mənfi hisslərlə mənfi münasibət bəsləyən şəxs. Əski pambıq bez olmaz. Qarı *düşmən* dost olmaz (31).

# E

EV is. Ev, yaşayış yeri, mənzil. Ozan, *evin* tayağı oldur ki, yazıdan-yabandan *evə* bir qonaq gəlsə, ər adam evdə olmasa, ol anı yedirər, içirər, ağırlar, əzizlər göndərər (32); Altun başlu ban *ev* vergil bu oğlana (36).

EV-EŞİK is.Ev, ev-eşik, mənzil. Ağban *ev-eşigində* şivən qopdı (125).

EVƏRMƏK f. Evləndirmək, ailəli etmək, ailə sahibi etmək. Oğuzda nə gördün? - Nə görəyim, oğlı olan *evərmiş*, qızı olan köçürmüş (55); "Bəli, ağ saqqallu əziz baba, *evərməx* gərək", - dedi (55); Gözüm görərkən, oğul, gəl səni *evərəyim* (85).

EVLƏNMƏK f. Evlənmək, ailə qurmaq. Oğuz zamanında bir yigit ki, *evlənsə*, ox atardı (57).

EVNİK is.top. Qala adı. Türkiyənin Ərzurum vilayətində olan bir qalanın adı. Yarımasın-yarçımasın. *Evnik* qəl'əsinin kafərləri bunları casusladı (53); *Evnik* qalasının beş yüz kafəri üzərimizə qoyıldı (53).

EYİB is. Nöqsan, eyib//ayıb. Bu qara *eyib* bana ya bəndəndür, ya xatundandur (34); ◇ *eyib olmaq* - ayıb olmaq, nöqsanlı olmaq. Oğul üçün ata ölmək *eyib* olur (74); Sormaq *eyib* olmasun, bu otağ kimindür? (54).

EYİBLÜ sif. Qüsurlu, nöqsanlı, eyibli. Mən *eyibliyəm* kim, mana eyib qoşarsan? (65).

EYİBLÜCƏ sif. Çox eyibli, çox qüsurlu, çox nöqsanlı. *Eyiblücə*, xan qızı, ərə varmaq eyib olar (65).

EYİLÜK is. Yaxşılıq. Qara başım sağlığında *eyilüklər* edəm, köpək, sana (45).

EYLƏ əv. Elə, belə. Anlar *eylə* dikəc Atağuzlu Uruz qoca iki dizinin üstünə çökdi (42); *Eylə* olsa, xanım, Beyrəgin qanı qaynadı (54); Bəli, canım baba, *eylə* istərəm (85).



EYLƏMƏK//ELƏMƏK//ETMƏK f. Etmək, eləmək. ◇ *bid'ət eyləmək* - pis hərəkət etmək. Dirsə xanın oğlu böylə *bid'ət eyləmiş* (37); *qəsd eyləmək* - öldürmək. Atasına *qəsd eylədi* (37); *qulluq eyləmək* - kiminsə qulluğunda işləmək, xidmət etmək, "Mənim dəxi oğlum olsa, xan Bayındırın qarşısın alsa-tursa, qulluq *eyləsə*, mən dəxi baqsam sevinsəm", -dedi (52); *dua eyləmək* - alqış eyləmək. Əl qaldırıb *dua eylədilər* (52); *əl eyləmək* - əl ilə işarə edib çağırmaq. Qırq yigidinə dilbənd saldı, *əl eylədi*, qırq yigid bədəvi atın oynatdı, oğlanın üzərinə yığnaq oldı (55); *savaş eləmək* - vuruşmaq, döyüşmək. Dönə-dönə bir zaman yaxşı *savaş elədi* (76); *yalın eləmək* - qılıncı qınından çıxarmaq, siyirmək. Kafərlər üyüşər, qılıcın *yalın elər*, kafərin öginə (öninə - *C.M.*) qatub qovar (91); *tutsaq eləmək* - tutub saxlamaq, həbs etmək. Kiminün boynın urdı, kimini *tutsaq elədi* (41).

EYÜ sif. Yaxşı. Mərə Əzrayıl, mən səni gen yerdə istərdim, tar yerdə *eyü* əlimə girdin (80).

EKİ s. İki Bayındır xanın tövləsindən ol *eki* atı gətürdilər (55); *Eki* rük'ət namaz qıldılar (66); *Eki* oğlancığım vardı (100); Basub *eki* yerdən boğazladı, arqasından *eki* qayış çıqardı, təkurun öginə bıraqdı (90); *eki eləmək* - iki eləmək, qulaq asmamaq, kiminsə sözünə əməl etməmək. Ol zəmanda oğul ata sözün eki eləməzdi, *eki eləsə*, ol oğulu qəbul etməzlərdi (71).

EKİNDÜ zərf. İkindi, günortadan sonrakı vaxt. Mərə qocalar, *ekindü* vəqti munı mana çevirəsiz yiyəm (101).

EL is. El, oba, mahal. Qarşu yatan qara tağlar, Qarısa, otı bitməz, *el* yaylamaz (76); Qalın Oğuz elində yasın tutsun (75); Alubanı kafər *ellərinə* yönələlim (40).

ELƏ əv.Elə, belə. *Elə* sandı kim, yağı basıldı (91); *Elə* olsa, sultanım, Qaraca çoban sapan çatlatdı (48).

ELDƏN-ELƏ z. Ətraf,.hər yer. Qolca qopız gətürüb *eldən-elə*, bəgdən-bəgə ozan gəzər (32).

EL-EV is. Ev-eşik, mənzil. *El-evünüzdən* çalub-ayıdan ozan olsun (32).

EL-GÜN is. El-gün, el-oba. *Eli-güni* köçürün (105).

ELM is.ər. Elm. Yazılıb-düzülüb gögdən endi Tənri *elmi* Qur'an görkli (32).

EMDİ zərf. İndi, bu saat. "Əgrəkdir" - aytdı *emdi* (111); *Emdi* mən varayım, əlin-ayağın bağlayayım, andan siz gələsiz (113); *Emdi*, Qazan bəg, di bizi ög (117).

EMRƏNMƏK f. Əmmək, sovurmaq. Şoqaqına *emrəndügim* sənin qızın, gəlinin (60).

ENMƏK f. Enmək. Yuxarıdan aşağı düşmək, Gəl bu ağac dibində *enəlüm*, yeyəlüm. *Endilər*, çoban tağarcığı çıqardı, yedilər (46); *Enüb* taş başıma düşübən öləm (102).

ERKƏK is. Erkək, oğlan. Ala gözlü görklü həlalım yüklü qodum, *Erkəkmidir*, qızmıdır, anı bilsəm? (97).

ERKƏN zərf. Sübh tezdən. *Erkən* bindilər, av yerinə vardılar (116).

EŞ I is. Dost, yaxın adam, yoldaş, silahdaş, sirdaş. Hey qırq *eşim*, qırq yoldaşım yügrək olsa yarışsam! (87); Hey qırq *eşim*, qırq yoldaşım, niyə ağlarsız? (88); Hey qırq *eşim*, qırq yoldaşım, qurban olsun sizə mənim başım! (90).

EŞ II is. Eşik sözünün kökü, kənar, vətəndan, el-obadan uzaq yer. Gəl yaxşı at bin, yaxşı yigitlər ilə *eş* yört (98).

EŞQ is.ər. Məhəbbət, eşq, sevgi. Qanturalı Sarı tonlu qız *eşqinə* bir "hu" dedi (88); Bəglər, sizin *eşqinizə* çəkəyim yayı, atayım oxı! (63).

EŞƏK//EŞŞƏK is. Eşşək. Ol Nuh peyğəmbərin *eşəgi* əslidir (33); Qara *eşşək* başına üyən ursan, qatır olmaz (31).

EŞİK is. Bayır, həyət, evətrafı sahə. Babanın ağban *eşigində* qaravaşlar inək sağar, görmədinmi? (88); *Eşigin* aldı oturdu (64); *Eşikdəki* inaqlar. Dibdə oturan xas bəglər. Qutlu olsun dövlətünüz (63).

EŞİTMƏK f. Eşitmək, agah olmaq. Qalın Oğuz bəgləri bunı *eşitdilər*(52); Boyu uzun Burla xatun bunı *eşitdi*(46).

## Ə

ƏBUBƏKR xüs.is. Məhəmməd peyğəmbərdən sonra gələn 4 xəlifədən birincisi. Məhəmmədin sağ yanında namaz qılan *Əbubəkr* Siddiq görkli (32).

ƏVVƏL I zərf.ər. Əvvəl, öncə. *Əvvəl* yigirmisi vardı, Dirsə xana bu xəbəri gətürdi...(36); İmdi incinmə, xanım, *əvvəl* onun əlin öpdügimüzə (54); Qızların yolu *əvvəldir*, *əvvəl* sən at (93); Əvvəl-axır. *Əvvəl-axır* uzun yaşın ucı ölüm (95).



ƏVVƏL II. Əvvəl (qoşma). Oğuzın ögincə bundan *əvvəl* kimsə keçməzdi (96).

ƏVƏT. əd. Bəli. "Bu yaxşı yigitlərin canını sənmi alursın?" -dedi: "*Əvət*, mən aluram",- dedi (80); Dəli Domrul aydır: "Mərə, al qanatlu Əzrayil, sənmisən?" dedi: "*Əvət*, mənəm",- dedi (80); *Əvət*, həm mana eki adam verin, yeməgün bənim bişürsün, mən yiyəyim...(99).

ƏVRƏN is. Qəhrəman. Ərənlər *əvrəni* Qaracuq çoban sapapın ayasına taş qodı, atdı (43); Adəmilər *əvrəni* Dəli Domrul əlin-əlinə çaldı, qas-qas güldi (80).

ƏQL is.ər. Ağıl. Bildügin unutmasa, *əql* yaqşı (105); Şundan bəri *əqlim*-usım dərə bilmən (44); ◇ *Əqli başından getmək*. *Ağlı* başından getdi (74); Ah etdilər, *əqlləri* başlarından getdi (57); Başından *əqli* getdi (52); *Əqli şaşmaq*. Ağlı çaşmaq. Ağ saqallu qocalar sənin gedərsə, mənim dəxi içində bir *əqlı şaşmış* biligi yetmiş qoca babam var (41).

ƏQLSİZ sif. Ağılsız. Mərə, dini yoq, *əqlsiz* kafər (49).

ƏDAVƏT is.ər. □ Ədavət eyləmək, düşmənçilik etmək. İttifaqı cəm'i Taş Oğuz bəgləri Qazana gəlmədilər, *ədavət* eylədilər (121); Ədavət bağlamaq. Düşmənçilik etmək. Qazan aydır: *Ədavət* bağladılar həmi? - dedi (123).

ƏDƏB is.ər. Ədəb. Eylə olsa, xanım, Beyrəgin qanı qaynadı. *Ədəblə* yab-yab geri döndi (54).

ƏDƏBLƏNMƏK utanmaq, çəkinmək. Bu otağın üzərinə varmağa *ədəbləndi* (54).

ƏDÜK is. Çəkmə. Basatı öginə qatdı, tutdı...*Ədügінin* quncına soqdı (101); Basatın xəncəri vardı. *Ədügini* yardı, içindən çıqdı (101).

ƏJDƏRHA is.fars. B a x: Əjdaha. Buların hər birisi bir *əjdərhaydı* (85); Yedi başlu *əjdərhaya* yetüb vardım...(117).

ƏJDƏHA is.fars. Əjdaha. *Əjdahalar* ağzından adam alan Dəlü Uran bilə varsun.. (95)

ƏZVAY sif.ər. Qorxu bilməz. *Əzvay* qurd ənügi erkəgində bir köküm var (119).

ƏZƏL zərf.ər. Əvvəl, qabaq. *Əzəldən* yazılmasa, qul başına qəza gəlməz (31).

Ə'ZƏM sif.ər. Çox böyük: □ İsmi-ə'zəm. Allahın adı. *İsmi-ə'zəm* oqıdı (56).

ƏZİZ sif.ər. Əziz. *Əziz* Tən₁ri adına qudbə oqıtdılar (67); Dünya şirin, can *əziz* Canımı qıya bilmən, bəllü bilgil (81).

ƏZİZLƏMƏK f. Əzizləmək. Ol anı yedirər-içirər, ağırlar-*əzizlər*, göndərər (33).

ƏZİM sif.ər.Böyük, çox. Qalın Oğuz bəgləri Beyrək üçün *əzim* yas tutdılar (58); Məgər Trabuzan təkurının bir *əzim* görkli məhbub qızı vardı (85).

ƏZRAYİL xüs.is. Əzrayıl (mələk adı). Ağ köksinin üzərinə *Əzrayil* basub qondı (80); Böylə dikəc *Əzrayilin* acığı tutdı (80).

ƏYAL is.ər. Övlad. Ola kim, bir ağzı dualının alqışı ilə Tən₁ri bizə bir yetman *əyal* verə...(35); Bir ağzı dualının alqışilə Allah-təala bir *əyal* verdi (35).

ƏYƏR is. Yəhər. Şahi-mərdan Əlinin Düldülünin *əyəri* ağac (48); Atlarının *əyərin* alub, geyimlərin çıqardılar (110); ◇ Əyər salmaq. Yəhərləmək. Baba, yelisi qara Qazlıq atuma *əyər* salayım...(86); Kafərin arxasına *əyər saldı*, ağzına uyan urdı (177).

ƏYƏRLƏMƏK f. Yəhərləmək. Uru turdu, tövlədən bir şahbaz at çıxardı, *əyərlədi*, geyimin geydi (112).

ƏKSİK sif. Əksik. Otuz toquz yigidim əmanəti, mərə kafir! Birin *əksik* (bulsam) yerinə on öldürəyim (60).

ƏKSİLMƏK f. Əksilmək, azalmaq. Bir yigid sənin ucından aramızdan *əksildi* (125); Bir yigit aramızdan *əksildi*, sənin yolında baş verdi (128).

ƏKSÜKLÜK is. Əksiklik. Dərsə xan aydur: Bayındır xan bənim nə *əksiklügüm* gördi? (34).

ƏKŞƏŞMƏK. Həyəcanlanmaq, narahat olmaq. Ağca yüzli qızım gəlünim *əkşəşmədin*... Qazan mana yetişsün (128).

ƏGƏR bağ. Əgər. *Əgər* sənin atun mənim atumı keçərsə, onun atını dəxi keçərsən (54).

ƏGİLMƏK f. Əyilmək. Bütünə ola ox toxunsa, *əgilməz* idin (106).

ƏGİN is. Bədən, çiyin. *Əgni* bəg dəmür tonun mana vergil (107); *Əgnimdəki* dəmür tonum ciknüm qısar (108); Ağam Beyrək gedəli bizə Ozan gəldügi yoq. *Əgnümdən* gecəligümüz aldığı yoq (62).

ƏGLƏNMƏK f. Əylənmək, dayanmaq. At üstündə *əglənməyüb* yortan Qazan, Sənin belin olmuş (77); Qoşa bürcdən qayın oqı *əglənmiyən* Yağrıncı oqlı İlalmış səninlə bilə varsun... (95).

ƏGRƏK antr. Əgrək. *Əgrəki* zindandan çıqardılar (119); Yigitləri qırdılar, *Əgrəgi* tutdılar. Tərs Uzamışın sözi *Əgrəgə* kar eylədi (110).

ƏGRİ sif. Əyri. Vallah, billah, toğrı yolı görərikən *əgri* yoldan gəlmiyəyin...(117); Qılıcunı nə ögərsən, mərə kafər, *əgri* başlu çovkanımca gəlməz mana (43).

ƏL is. Əl. Çünki mənim *əlümdən* gögərçin kibi quş oldı, uçdı (80); Gümüş kibi ağ biləgin açdı, *əlin* çıqardı (65); Dəlinin *əli* həqq əmrilə sapasağ oldı (56); ◇ *Əlindən almaq*. Xilas etmək. Qanlu kafər *əlindən* qartaşçuğın tartub aldı (115); Qanlu kafər *əlindən* babasını tartub aldı (122); *Əl qavşırmaq*. Əli sinə qabağında birləşdirmək (tə'zim əlaməti). *Əl qavşırıb*, ol yigidə səlam vergil (111); *Əlindən qurtarmaq*. Xilas olmaq. Yaxşı yigidin canın onun *əlindən qurtaraydım* (80); *Əlinə almaq*, götürmək. Sügüsün *əlinə aldı* (90); Toqanın *əlinə aldı*, ardına düşdi (80); *Əl qaldırmaq*. Qalın Oğuz bəgləri *əl qaldırdılar*, dua eylədilər (52); Əl basmaq (and içmək). Altun xaça mən *əlümi* basaram (68); Əli bağlı. *Əli bağlı*, boynı bağlu yüzi üzərinə salıb aldılar, yürüyü verdilər (71); Xan Qazanın oqlı Uruz bəg, üç yüz igidlən *əli bağlu*, boynı bağlu getdi (43); *Əl eyləmək*. Çağırmaq. Qırq yigidinə dilbənd saldı, *əl eylədi* (41); Ələ girmək//Ələ düşmək. Avazın gedəlmədin, ünim boğulmadın bir atdır, *əlümə girdi*, ilətim, sağlıyayım...(69); *Əlünə girmiş* ikən, mərə kafər, öldür məni... (117); Əl götürmək - əl qaldırmaq. *Əl götürdilər*, hacət dilədilər (35); *Əl urmaq*. Əl atmaq. Oğlan bıçağına *əl urdı* (36); Əl öpmək. *Əl öpmək* (böyüyə hörmət bildirir). Cəmisi atdan enüb, Qazanın *əlin öpdülər* (121); Səgrək daxı aqasının əlin öpdi (121); Əlin-əlinə çalmaq. Əlin-əlinə vurmaq (sevinc və kədərli vaxtı emosiyanı bildirmək). Oğuz bəgləri bunı göricək *əl-ələ çaldılar*, gülüşdülər (63); Övrət *əlin-əlinə* çaldı, qaravaşa söylədi (106); [Qazan] *əlin-əlinə* çaldı, ağladı (68); *Əlü yaqasında olmaq*. Borclu qalmaq. Yarın qiyamət günində mənim *əlüm* Qazan xanın *yaqasında olsun*, mənim qanım Aruza qoarsa...(125).

ƏL qoş. Tərəf, cəhət. Saqım *ələ* baqduğımda qartaşım Qaragünəyi gördim, baş kəsübdür, qan dökipdir (68); Solım *ələ* baqduğında tayım Urızı gördim (69).

ƏLAQİBƏT ər. Nəhayət, ən sonda. *Əlaqibət*, uzun yaşın ucı ölüm, axırı ayrılıq (126).

ƏLAMAN ər. Əlaman. Dəlü Qarcar aydır: "Mədəd, aman *əlaman*" (56).

ƏLBƏTDƏ mod.söz ər. *Əlbətdə*, ol ağam tutulan qəl'əyə varmıyanca olmazam...(123); Çünki dedin *əlbətdə* varsam gərək (86).

ƏLEYK ər. Salam. təkür "*əleyk*" aldı (87); Beyrək "*əleyk*" aldı (124).

ƏLEYKƏS-SƏLAM ər. Əleykəs-səllam. *Əleykəs-səlam* ay azmış, fe'li dönmüş, qadir Allah ağ alnına qada yazmış (56).

ƏLEYHİSSƏLAM ər. Ona salam olsun (müqəddəslərin adlarına əlavə olunan epitet), Rəsul *əleyhissəlam* zəmanına yığın Bayat boyından, Qorqut ata diyərlər, bir ər qopdı (31).

ƏLƏK is. Ələk. Neyləyəyim, bu yıqılacaq evdə un yoq, *ələk* yoq (33).

ƏLƏM is.ər. Bayraq. Qaba *ələm* götürən xanınuz kim? Qaba *ələm* götürən xanımız - Bayındır xan (114).

ƏLƏMLÜ sif. Bayraqlı. Qazan verdi kim, ləşkər öginçə bir ağ-boz atlu, ağ *ələmlü* bəg dəmür tonlu Oğuzun öginçə gəldi (120).

ƏLİ xüs.is. Əli (Məhəmməd peyğəmbərdən sonrakı 4 rəşidi Xəlifənin sonuncusu). Qılıc çaldı, din açdı, Şahi-mərdan *Əli* görkli (32); Şahi-mərdan *Əlinin* Düldülinin əyəri ağac (48).

ƏLİNCƏ top. Əlincə. Yolı *Əlincə* qəl'əsinə uğramışdı (110); Hünərin var isə,. qartaşın *Əlincə* qəl'əsində əsirdir, var, anı qurtar...(111).

ƏL-YÜZ is. Əl-üz. ...*Əlin-yüzin* yumadan obanın ol ucından - bu ucına çarpışdırdı (33); ...*Əlin-yüzin* yumadan toqquz bazlamac ilən bir güvlək yoğurd gəvəzlər (33).

ƏLLİ-ALTMIŞ s. Əlli-altmış. Bir ağacı yerindən qopardı. Atub *əlli-altmış* adam həlak elədi (99).

ƏLLİ YEDİ s. Əlli yeddi. *Əlli yedi* qəl'ənin kəlidini alan İlək qoca oğlı Dönəbilməz Dülək Uran mana deərlər (121).

ƏLÜKLÜ sif. Ləlֿəkli. Avcına sığmayan *əlüklü* oxlı Aruz oqlı xanım Basat, manַa mədəd... (100).

ƏLÜFƏÇİ is. Ordunun ot-yem tədarükçüsü Baş aqçaluq *Əlüfəcilər* yoldaş etdin (95).



ƏLHASİL//ƏLHASİLİ mod.s.ər. Xülasə. *Əlhasil*, ikisi bilə vardılar (126); *Əlhasil*, Oğuz yedi kərrə ürkdi (99); *Əlhasili* ordı bunın ucından qatı incindilər (99).

ƏLHƏMDÜLİLLAH mod.s. ər. Allaha şükr olsun. *Əlhəmdülilah*, mənim oğlancığım ər olmış... (120).

ƏLCÜGƏZ is. Əlciyəz (əl isminin kiçiltmə forması). *Əlcügəzi* qınalı qızcığazları çoq yemişəm, Qarışcuları tutdı ola, gözüm, səni? (108).

ƏMANƏT is.ər. Əmanət. Otuz toquz yigidim *əmanəti* mərə kafər...(60); Yad qızı həlalım var, andan mənim iki oğlancığım var, *əmanətim* var (82).

ƏMDİ sif. Bir anadan süd əmən (süd qardaşı). Dəpəgöz aydır: "*Əmdi* qardaşlar, qıyma mana", -dedi (102).

ƏMƏL is.ər. ◇ Əməli azmaq - yolundan çıxmaq, dönüklük etmək. *Əməlinmi* azdı? Fe'linmi azdı? (56); Əleykəs səlam, ay *əməl* azmış fe'li dönmüş, qadir Allah ağ alnına qada yazmış (56).

ƏMƏN is. antr. Əmən. Sonra *Əmən* deərlərdi, bir kişi altı kərrə varub hasarı alımadı (94); Dayım *Əmən* anı bildi (95).

ƏMZİRMƏK f. Əmizdirmək. Ağ südin toya *əmzirsə*, ana görkli (33); Tolab-tolab ağ südimi *əmzirdigim* oğul (82).

ƏMİRAXUR is.fars. İlxıçıların başçısı, baş mehtər. Allah məni qurtaracaq olarsa, səni *əmiraxur* eyləyin...(46); Qaracıq çobanı *əmiraxur* elədi (50).

ƏMİRAXURBAŞI is. B a x: Əmiraxur. *Əmiraxurbaşı* qarşuladı, endirdi, qonaqladı (53).

ƏMİŞMƏK f. Əmişmək. "Əmmək" fe'linin qarşılıq-müştərək növü. Bir yasdıqda baş qoyub *əmüşdigim*...(83).

ƏMMA bağ.ər. Amma. *Əmma* Taş Oğuz bilə bulınmadı (123); *Əmma* gündə eki adam ilə beş yüz qoyun verəlim (99).

ƏMMƏK f. Əmmək. Bərü gəlgil, ağ südin *əmdigim*, qadınım ana (39).

ƏMMİ is.ər. Əmi. Urızın cilavısın *əmmisi* Qaragünə tutmışdı (121); Əmma *əmminə* adam sal, gəlsün...(119); Adam saldı, *əmmisin* oxudı gəldi (119).

ƏMR is.ər. Allah *əmrilə* ol yigit öldi (79); ◇ Əmr eyləmək//əmr etmək. Gög üzərində al qanatlu Əzrayilə *əmr* elədi, uçub gəldi (81).

ƏMRAN antr. Əmran (şəxs adı). Oğlancuğı *Əmran* bahadır babasına qarşu gəldi (105); Dədəm Qorqud gəlübən şadlıq çaldı. Bu oğuznaməyi düzdi-qoşdı, "Bəkil oğlı *Əmranın* olsun", - dedi (109).

ƏMCƏK is. Əmcək. Oğlanın anası *əmcəgin* bir sıqdı, südi gəlmədi (39); qavradı, qızın bağdamasın aldı. *Əmcəgindən* tutdı (55).

ƏNİK//ƏNÜK is. Aslan balası. Aslan *ənigi* yenə aslandır (106); Əzvay qurd *ənügi* erkəgində bir köküm var...(119)

ƏN,SƏ is. Başın arxa hissəsi, peysər. Altı cəllad *ən,səsinə* gəldilər (89)... Qara bığın yedi yerdə *ən,səsində* dükən Qazan qartaşı Qaragünə çapar yetdi (77); Qara dəvə *ən,səmdən* qarvar gördüm (44).

ƏN,SƏ is. antr. Ənsə. Mənim qırımım *Ən,sə* qoca oğlı Oqçı olsun... (126).

ƏR is. 1) İgid, qəhrəman, döyüşkən. *Ər* yigitlər qarısa, oqlı toqmaz (76); Ol gün cigərində olan *ər* yigitlər bəlürdi (77); Alp *ərə* qorxu verməк eyb olur (86); 2) Kişi ("övrət"in antonimi). *Ərin* sözini qulağına qoymaz (33); Əgər *ərdir*, əgər övrətdir, qorxusı ağac (48); Ögünməklə övrət *ər* olmaz (42); ◇ Ərə varmaq - ərə getmək. *Ərə varalıdan* bərü dəxi qarnım toymadı (33); Mərə, dəli ozan, *ərə varan* qız mənəm...(64).

Ə'RƏFAT is. ər. Ə'rafat (Məkkə şəhəri yaxınlığında qurban kəsilən yerin adı). Əmma *Ə'rafatda* ərkək quzı qurban üçün (71).

ƏRDƏMLİ//ƏRDƏMLÜ sif. Ərdəmli, hünərli. Ağ ayıldan tümən qoyun vergil bu oqlana, şişlik olsun, *ərdəmlidir* (36); Baybörənin oqlı...Çal qaraquş *ərdəmlü*, bir gözəl, bir yigit oldı (53).

ƏRDİL sif. Yekə. *Ərdil* təkə buynuzından qatı yaylı...Aruz oqlı xanım Basat man,a mədəd (100).

ƏRƏBƏ is. Araba. Əlin-ayağın bərk bağladılar, bir *ərəbəyə* yüklətdilər. *Ərəbəyə* möhkəm örğanla sardılar. *Ərəbəyi* çəkdilər, yürüyü verdilər (116).

ƏRƏBİ sif.ər. Ərəbi. Hey ana, *ərəbi* atlar olan yerdə, Bir qulını olmazmı olur (47).

ƏRƏN is. İgid, qəhrəman. Bu dünyaya *ərənlər* əqllə bulmışlardır (88); Alp *ərənlər* qırımından qayurırdı (88); Ol gün cilasun bəg *ərənlər* dönə-dönə savaşdı (71).



ƏRƏN is. Ərən (şəxs adı)...Əlli yeddi qəl'ənin, kəlidin alan...İlək qoca oğlı Alp *Ərən* çapar yetdi (50).

ƏRİNMƏK f. Utanmaq. "Ağac, ağac " dersəm sana *ərinmə*, ağac (47).

ƏRKƏK sif. Erkək. Əmma Ə'rafatda *ərkək* quzı qurban içün (71); *Ərkək* sinəgi üzərimə qondırmıyam (112).

ƏRGƏNLİK is. Qızın nişanlısına göndərdiyi hədiyyə. Adaqlusından *ərgənlik* bir qırmızı qaftan gəldi (57).

ƏRGƏC is. Erkəc (erkək keçi, təkə). Altmış *ərkəc* dərisindən kürk elsə, topuqlarını örtmiyən...At ağuzlu Uruz qoca çapar yetdi (49); Çoban *ərkəcə* Qaqdı ilərü vardı (98); Mərə qoyun başları *ərkəc*, bir-bir gəl, keç (101).

ƏRLİK is. İgidlik, qəhrəmanlıq. Hamidlən Mərdin qəl'əsin dəpüb yıqan, dəmür yaylı Qıpçaq Məlikə qan qusdıran, gəlübən Qazanın qızın *ərliklə* alan...Qaragünə oğlı Qarabudaq çapar yetdi (49); Mərə dayələr, bu qavat oğlı qavat bizə *ərlikli* göstərir? (54); ◇ *Ərlik işləmək* - alicənablıq etmək. Bəg yigit, bizə sən *ərlik işlədin* (53).

ƏRMƏĞAN is.fars. Hədiyyə, bəxşiş. Əmma bizim bir bəgümiz oqlı vardır, bu üç nəsnəyi ana *ərməğan* aparsavuz gərək idi...(53); Yad kafər gəlsə, başın Oğuza *ərməğan* göndərdi (104).

ƏRCƏL sif. Nankor. Yarımasun-yarçumasun, sənin oğlın kür qopdı, *ərcəl* qopdı (37).

ƏRŞ is. Göy, səma. *Ərş* tanıq olsun, kürsi tanıq olsun (83); Qara uran qopdı, Dəpəgöz, *Ərş* yüzində çevirdim, alımadım Basat (100).

ƏSA is.ər. Əsa. Museyi-Kəlimin *əsası* ağac (48).

ƏSƏN sif. Sağ, salamat. Anları *sağ* və *əsən* gördi, Allaha şükr eylədi (67); Alçaq yerdə yapılıbdur Tən,ri evi Məkkə görkli, Ol Məkkəyə sağ varsa, *əsən* gəlsə, sidqi bütün hacı görkli (32); Ol qırq namərd qarşu gəldi, aydır: Oqlın saqdır *əsəndir*, avdadır (38); ◇ Əsən qalmaq - salamat qalmaq. Qadun ana, bəg baba, *əsən qalun* (86); Əsən olmaq. Sağ olmaq. Qaracuq atlar *əsən olsa*, qulun toğar, Qaytabanda qızıl dəvə *əsən olsa*, torum verür, Ağayılda ağca qoyun *əsən olsa*, quzı verür. Bəg ərənlər *əsən olsa*, oqlı toğar, Sən *əsən ol*, anam *əsən olsun* (75).

ƏSİR is.ər. Əsir. Varayın, bolay ki, mana bir *əsir* verəydi, oğlancığım qurtaraydım...(99); Ol xatun kişiyə bir *əsir* verdi (100); Hünərin var isə, qartaşın Əlincə qəl'əsində *əsirdir*, var anı qurtar (11); ✧ *Əsir etmək* - əsir etmək. Aqınçılar kafərin elin-günün urub qızın gəlinin *əsir etdilər* (109); Əsir getmək. Qızım-gəlinüm *əsir getdi* bəllü bilgil (107).

ƏSKİ sif. Köhnə. *Əski* tonın biti, ögsüz oqlanın dili acı olur (110); *Əski* panbuq bez olmaz (31); Bir *əski* qaftan verdigüz, bənim başım beynim aldınuz...(62).

ƏSL sif.ər. Nəsil, kök. Ol, Nuh peyğəmbərin eşşəgi *əslidür* (33); Kəndü *əslim*, kəndü köküm sımağım yoq...(117).

ƏSLƏMƏK Qulaq asmaq, sözünə baxmaq. Aruz, Dəpəgözü dögdi, yasaq eylədi, *əsləmədi* (99); *Əsləmədi*, beləgindən bir tutam ox çıqardı, belinə soqdı (101).

ƏSMƏK Əsmək. Salqum-salqum tan yelləri *əsdigində*... (34).

ƏSRÜK sif. Sərxoş. Ol şərabdan içən *əsrük* olur (80).

ƏT is. Ət. Dəpə kibi *ət* yığ, göl kibi qımız sağdır (35); Qıyma-qıyma ağ *ətindən* çəkün, qara qaurma bişürüb qırq bəg qızına ilətün (46); □ *Ət tuşağı* - ət buxovu (evləndirmək mə'nasında); Ayağına *ət tuşağı* urun (112).

ƏTƏK is. 1) Paltarın ətəyi. *Ətəklərin* qıvırdı (101); Aruz aldı bu oğlanı, *ətəginə* sardı (99); 2) Dağ yamacı. Arqurı yatan ala tağlar *ətəginə* ava vardın (105).

ƏTMƏK is. Çörək. Ağanıuzın *ətməgi* sizə həlal olsun...(60) Yaranmış arpa *ətməgi*, acı soğan eyni, degil, (75); ✧ *Ətmək basmaq*. Namərdlik etmək. Beyrək *ətməgün* basmadı (125)

ƏHD is. ər. Əhd; öhdəsinə alma. Oğuz bəglərindən *əhdim* bozam dərdim (103).

ƏHƏD s. ər. Vahid, bir. Qamu yerdə *əhədsən*, Allahü səmədsən (96)

ƏHL is. ər. Əhl, adam. Dirsə xan dişi *əhlinin* sözilə ulu toy elədi, hacət dilədi (35)

ƏCƏL is. ər. Əcəl. *Əcəl* və'də irməyincə kimsə ölməz (31); Anları dəxi *əcəl* aldı, yer gizlədi, Fani dünya yenə qaldı (41); ✧ *Əcəli gəlmək* - Əcəli çatmaq. *Əcəlinmi* gəldi? Bu aralarda neylərsən? (56).



# Z

ZALIM is.ər. Zalım, insafsız, qəddar. O *zalım* yıqdırdı ola, qardaş (100).

ZARILIQ is. Zarıltı, inilti, sızlayan. *Zarılıq* edər gördüm Bamsı (59); ✧ *Zarılıq qılmaq* - zarıldamaq, ah-zar etmək. Ağlaşdılar, *zarılıq* qıldılar (59); *Zarılıq eyləmək*, zar-zar ağlamaq. "Qara başım qurban olsun bu gün sana", - dedi. *Zarılıq eylədi*, ağladı (38); ✧ Zarılıqlara girmək - ağlaşmaq, şivən eyləmək, zar-zar ağlamaq. Kömləgi göricək bəglər ökür-ökür ağlaşdılar, *zarılıqlara girdilər* (58).

ZARİ-ZARİ zərf.ər. Zar-zar, ah-zar. Ağca tozlu qatı yayım *zari-zari* (108); "Vay qalın Oğuz imrənçisi Beyrək" -deyübən *zari-zari* ağladı (58).

ZƏBUN sif.fars. Qüvvətsiz, taqətsiz, zəif; ✧ *Zəbun olmaq* - taqətsiz olmaq, qüvvətsiz olmaq, qüvvətdən düşmək. Qazanın qardaşı Qaragünə Dəpəgöz əlində *zəbun oldu* (99).

ZƏVAL is.ər. Zaval, bədbəxtlik, pis hadisə. Oğuzun başına *zəval* gətürdün (98).

ZƏLİL zərf.ər. Yazıq, yazıq-yazıq. İki qardaş bəbəgin öldürüb *zəlil* gəzən (121).

ZƏMAN is.ər. Zaman, vaxt, dövr. Rəsul əleyhissəlam *zəmanına* yaqın Bayat boyından Qorqud ata derlər, bir ər qopdı (31); Ol *zəmanda* oğul ata sözün eki eləməzdi (71); Ol *zəmanda* bəglərin alqışı alqış, qarğışı qarğış idi (52).

ZƏMANLA zərf. Bir zaman, bir vaxt. *Zəmanla* Oğuz genə yaylaya köçdi (98).

ZƏNCİR is. Zəncir, dəmirdən hörülmüş ip. Buğanın *zəncirin* aldılar (88); Oxla ol qılıc asılan *zənciri* urdu (102).

ZƏRB is.ər. Zərbə, qüvvə, qüvvət. "Yigitlərin *zərbini* görgil, anadan etgil", - dedi (43); ✧ Zərb eləmək//zərb eyləmək - güc vurmaq, güc sərf etmək. Qaraca çoban *zərb elədi* (46); Üçüncüdə kənduyə *zərb eylədi* (39); Zərb vurmaq - zərbə endirmək, vurmaq, xəsarət yetirmək. Alplarbaşı Qazana *zərb urdu* - dünya başına tar oldu (99).

ZƏRRƏ is.ər. Zərrə, az, azacıq. Aruz Qazanın üzərinə at saldı, Qazanı qılıcladı, *zərrə* qədər kəsdirdi (126); *Zərrə* qədər kəsdirmədi (94).

ZƏXM is.fars. Yara, güclü zərbə ilə bədənə endirilmiş xəsarət. Omuzuna dörd parmaq dəklü *zəxm* urdu (121).

ZƏHMƏT is.ər. Əzab, əziyyət, ağırlıq. Ağır yükün *zəhmətin* qatır bilür (32).

ZİYADƏ sif.ər. Çox, artıq, daha çox, daha artıq. Kafərin güci *ziyadə*, oğlan zənub oldu (109).

ZİYNƏT is.ər. Gözəllik, yaraşıq. Bağ və bostanın *ziynəti* su (44).

ZİNDAN is.fars. Həbsxana, dustaqxana, zindan. Əgrəgi *zindandan* çıxardılar (113).

ZİNDANÇI is. Zindanın qapısında duran gözətçi, həbsxana qapıçısı. Xatun gəlüb *zindançıya* qapuyı açdırdı (116).

ZİR is.fars. Alt, alt təbəqə. ◊ *Zirü zəbər olmaq* - alt-üst olmaq, dağıdılmaq. Dəpəgöz günbədə əlin soqdı, eylə qaxdı kim günbəd *zirü zəbər oldu* (102).

ZİRA bağ.fars. Çünki, o səbəbə ki. "Ol yaxşı bilür, *zira* ol dikibdür, yenə ol tapır", - dedi (58); *Zira* ağlamaqdan gözləri görməz olmış idi (66).

ZÜLFÜQAR is.ər. İkiağızlı qılınc. İki ağzı da kəsən qılınc. *Zülfüqarın* qınilə qəbzəsi ağac (48).

## İ

İS. is. Sahib, yiyə - Bədəvi atlar *issini* görüb oğradıqda...(34).

İBRAHİM xüs.is. İbrahim peyğəmbərin adı. *İbrahimi* tutdurun, Xam gönə çulğadun...(109).

İBRƏT is.ər. Təəccüblü, heyrətli. Bu binarın üzərinə gəldilər. Gördilər kim, bir *ibrət* nəsnə yatur...(98). İbrət almaq - təəccüblənmək, heyrətlənmək. Çoban bu yığnağı görcək *ibrət* aldı (98).

İQLİM is.ər. İqlim, ölkə. Mərə, bazırganlar varın, *iqlim* aran, Beyrəgin ölisi xəbərin gətürib deniz, ölimidir? (58).

İQRAR sif.ər. Təsdiq, iqrar eyləmək, təsdiq etmək. Üç kərrə ağzından *iqrar* eylədi (56).

İZ is. İz. Ayru-ayru yollar *izin* dəvə bilür (32).

İZZƏT is.ər. Hörmət, izzət, qədr, qiymət. "...Ola kim, öldürə, genə bizim *izzətimiz*-hörmətimiz onun, babası yanında xoş ola, artıq ola..." (36)



İZLƏMƏK f. İzləmək, İzinə düşmək. Bozladı. Kafərin *izin izlədi* (74).

İYƏ is. Yiyə, sahib. Bir gün Ulaş oğlı Tülü quşun, yavrısı, bizə miskin umudı, Amid soyının aslanı, Qaracuğın qaplanı, Qonur atın *iyəsi*, xan Uruzın ağası, Bayındır xanın göygüsi, Qalın Oğızın dövləti, qalmış yigit arxası Salur Qazan yerindən turmuşdı (42).

İYƏGÜLÜ sif. Yiyəli, yiyəsi olan, sahibi olan. *İyəgülü* ulalur, qabırqalu böyür (110).

İKƏN bağ. İkən (zaman, yaxud hal-vəziyyət bildirir). Son var *ikən* av avladı, quş quşladı (37).

İKİ s. İki. Oğul atanın yetiridir, *iki* gözinin biridir (31).

İL is. El, camaat. Çadırın *ildən*-ögdin dikdi (120).

İLALMIŞ antr. Qoşa bürcdən qayın oqı əklənmiyən Yağrıncı oğlı *İlalmış* səninlə bilə varsun,-dedi (95).

İLQI is. İlxıçı, Oğuz xanın *ilqısı* gəlüb xəbər gətürdi (98).

İLĞIMAQ f. Yığmaq, toplamaq. *İlğıuban* qara tağım yıqan Qazan (77).

İLDIZ is. Ulduz. *İldız* kibi parlayıb gələn kafərin cidasıdır (70).

İLDİRMƏK f. Yerinə çatdırmaq. Qarı cida oynadanlar *ildirmədi* (100).

İLDIRIM is. İldırım. Gögdən *ildırım* ağban evim üzərinə şaqır gördüm (44).

İLƏ qoş. İlə. Dilək *ilə* bir oğul güclə buldum (38).

İLƏK antr. *İlək* qoca oğlı Sarı Qalmaş Qazan bəgün evi üzərinə şəhid oldı (43).

İLƏN qoş. Baqdı gördi Oğuzın ucında bir ala sayvan dikilmiş, bir imirzə xub yigit qırq yigid *ilən* sağında və solında oturırlar (53).

İLƏRÜ zərf. İrəli. *İlərü* vardı, pay dilədi (54).

İLƏTMƏK f. Çatdırmaq. Qıyma-qıyma ağ ətindən çəkün, Qara qaurma bişürüb, qırq bəg qızına ilətün (46); Vardılar, kömləgi Banıçiçəgə *ilətdilər* (58).

İLTİFAT is.ər. Mehribanlıq, dostluq. Kimsəyə *iltifat* eyləməzdi (110).

İLHAM is.ər. İlham. Həq-təala anın könlinə *ilham* edərdi (31).

İMAN is.ər. İman. Axır-sonı *arı* imandan ayırmasun (78).

İMARƏT is.ər. İmarət, tikili. Ulu yollar üzərinə *imarətlər* yapayım sənin, içün (83).
İMDİ zərf. İndi. *İmdi* qanı dedigim bəg ərənlər? Dünya mənim deyənlər (78).
İMƏK f. Olmaq. Tənri verən canın, seyranda *imiş* indi, dəxi (39); "Qazan, oğlan avda *idügin* andan biləyin kim, yorğun atunla, güdəlmiş cidanla ardına", -dedi (74). Dərsə xan oğlancuğı *idüyin* bilmədi, qarşu gəldi; soylar, görəlim, xanım, nə soylar (40).
İMİRZƏ sif. Yaraşığlı, göyçək. Baqdı gördi Oğuzun ucında bir ala sayvan dikilmiş, bir *imirzə* xub yigit qırq yigid ilən sağında və solında otururlar (53).
İMRƏNÇİ is. Sevimli. Parasarın Boyburd hasarından parlayıb uçan, at alaca gərdəginə qarşu gələn Qalın Oğuz *imrənçisi,* Qazan bəgin, yınağı Boz ayğurlu Beyrək çapar yetdi: "Çal qılıncın, xanım Qazan, yetdim",-dedi (77).
İMRƏNCİ. B a x: İmrənçi. Vay, Qalın Oğuzun, *imrəncisi* Beyrək (58).
İNAĞ is. Dost, yoldaş, tərəfdaş. "Bəglər, Beyrək bizdən qız almışdır, Güyəgümizdir. Əmma Qazanın *inağıdır...*" (124).
İNAYƏT is.ər. Qayğı, kömək. "Allahın *inayəti,* ərənlərin himməti oldı; qızı aldım", -dedi (56).
İNƏK is. İnək. Babanın ağban eşigində qaravaşlar *inək* sağar görmədinmi? (88).
İNƏG. B a x: İnək. "Buğa, buğa" dedikləri qara *inəg* buzağısı degilmidir? (88).
İNLƏMƏK f. İnləmək. Bir gecə döşəgində qatı-qatı *inlədi,* ah etdi (106).
İNCƏ sif. İncə, zərif. Qatlanmalı, qırx *incə* qızı boyına aldı (38); Yalab-yalab yalabıyan *incə* tonlum (93).
İNCİNMƏK f. İncimək. *İncinib* acı sözlər söyləmə (35).
İNŞALLAH ara söz, ər. İnşallah. "Allah qoysa". "*İnşallah,* bunun dəxi başın kəsəyim", - dedi (89).
İP is. İp. On altı bin, *ip* üzəngili, keçə börkli, azğun dinli, quzğun dilli kafər çıqa gəldi (69).
İPƏK is. İpək. Ala sayvan gög yüzinə aşanmışdı. Bin pərdə *ipək* xalicəsi döşənmişdi (52).
İPƏG. B a x: İpək. Bin yerdə *ipək* xalicəsi döşənmişdi (34).



İRMƏK f. Olmaq, yetişmək. Ol ögdigim yuca Tənri dost oluban mədəd *irsin,* xanım hey.(33) ...Əcəl və'də *irməyincə* kimsə ölməz (31).
İRAQ zərf. Uzaq. Bərə çoban, *irağından* - yaqınından bəri gəlgil (43).
İRİŞİ GƏLMƏK f. Çatmaq, yetişmək. Otağın ögində *irişi* gəldi, keyiki sinirlədi (54).
İRGÜRMƏK Yetişmək, çatmaq. Muradilə məqsuda *irgürəm,* derdim. Murada yetürmədin, məni (73).
İSMİ-Ə'ZƏM ər. Allahın müqəddəs adları. Dədə Qorqudun ardından Dəli Qarçar irdi. Dədənin anısı anıtdı Tənriyə sığındı. *İsmi-ə'zəm* oqıdı (56).
İSSİZ sif. Eki həsrət bir-birinə bulaşdılar. *İssüz* yerin qurdı kibi ulaşdılar (97).
İSTANBUL xüs.is. Türkiyədə şəhər. Bazırganlar dəxi gecə-gündüz yola girdilər. *İstanbula* gəldilər (52).
İSTƏMƏK f. İstəmək. Dərsə xan *istədi* kim, oğlancuğın üstilə görəlib düşəydi (37).
İT is. İt. Arqırı söyləmə, mərə *itüs* kafər (43).
İTİ sif. Tünd (içki haqqında). Al şərabın *itisindən* içərlərdi (40).
İTTİFAQ is. ər. Birləşmə, birlik; sözü bir etmə; *İttifaqla* tanışlıq qıldılar (119); *İttifaqı* cəmi Taş Oğuz bəgləri Qazana gəlmədilər, ədavət eylədilər (123).
İÇ is. İç tərəf, iç. İç Oğuzun, Taş Oğuzun, bəglərin üstünə yığnaq etgil (35); Basatın xəncəri vardı. Ədügini yardı, *içindən* çıqdı (101).
İÇƏRÜ zərf. İçəri, içəriyə. *İçərü* söhbətə girdi (111).
İÇƏT is. Bulaq, içməli su. Souq sularını sorar anam, *içət* kimün?
İÇİN zərf. (iç sözünün halət halı). Gizlincə. Qanturalının, atını *için* tutdı, geydirdi. Kəndü dəxi *için* tutdı, geyindi (90).
İÇMƏK f. İçmək. Adam *içməyən* acı sular sızınca sızmasa yek (32).
İÇÜN qoş. Üçün. Mənim *içün* ağlamıyasan.
İŞ is. İş. Allah-allah dimiyincə *işlər* onmaz (31).
İŞARƏT is.ər. Qaş, göz, əl və s. ilə anlatma. Qarındaşı Qaragünəyə *işarət* etdi: "Başın kəs", - dedi (126).

İŞDƏ əd. Budur, bax. "...Osman nəslidir. *İşdə* sürilib gidəyürir" (31).

İŞLƏMƏK f. İş görmək. Hər nə iş olsa, Qorqut ataya tanışınca *işləməzlərdi* (31).

İŞRƏT is.ər. Kef, kef çəkmə. Düşdilər, *işrətə* məşğul oldılar (90).

İŞUĞ is. İşıq. Alın-başa qunt *işuğım* urardım (124).

# Y

YA 1) Bağ. Bölgü və ehtimal mə'nalarını bildirir. *Ya* varmıyam? *Ya* gələm, ya gəlməyəm (86); Bu qara eyib banıa *ya* bəndəndür, ya xatundandır, -dedi (34); 2) Nida. Dədə, *ya* qanı mənim birələrim? (57); Qanturalı aydır: *Ya* necə varar, baba dedi (85); *Ya* qadir Allah, birligin varlığın haqıçün, Əzrayıli mənim gözümə göstərgil, savaşayım, çəkişəyim, dürişəyim, yaxşı yigitin canın qurtarayım (79).

YAB-YAB zərf. Yavaş-yavaş. Beyrəgin qanı qaynadi, ədəblə *yab-yab* geri döndi (77).

YABAN is. Çöl, səhra, insan yaşamayan yer. Mərə çobanlar! Bu kişi yolda taş bulsa, *yabanə* atər (101).

YAVRI is. Oğul, uşaq, körpə bala. Bir gün Ulaş oğlı Tülü quşun *yavrısı*, bizə miskin umudı, ...Salur Qazan yenidən turmuşdi (42); İki vardın, bir gəlürsən, *yavrum* qanı? (38).

YAVUQLI sif. Adaxlı, nişanlı. Mənim qızım Baybörə bəg oğlınə beşikkərtmə *yavuqlı* olsun, - dedi (51); Ataya-anaya, qauma-qardaşa həsrətəm və həm bir qara gözlü *yauqlım* vardı...(59); *Yavuqlı olmaq* - nişanlanmaq, adaxlı olmaq. Mənim qızım Baybörə bəgin oğlunə beşikkərtmə *yavuqlı* olsun, dedi (51).

YAVUZ is. Yaman, pis. *Yavuz* yerlərə yeltəndin, qayıda döngil (86).

YAQA is. Paltarın boyuna keçən hissəsi, bu hissəyə tikilən və boyunu əhatə edən parça zolağı. Tartdı, *yaqasın* yırtdı (57); ◇ *Yaqa yırtmaq* - paltarın yaxasını cırmaq: Tartdı, *yaqasın yırtdı* (57); *Yaqadan sancmaq* - bir şeyi yaxaya keçirmək, qılıncı, bıçağı yaxaya sancmaq. Uruz gen yaqadan sügüsünı sancdı, turdı (71); *Yaqa tutmaq* - yaxasından tutmaq. Babasilə Yegnək gizlü *yaqa tutuban* yiləşdilər (97); *Yaqa tutıb* kafərlə uğraşayım, sənin üçün (70).

YAQA is.məc. Tərəf. Qarşı *yaqadan* kafərlər baqışurlar, aydırlar: Kürəşdilər, olamı? (115).

YAQIN zərf. Yaxın. Rəsul əleyhissəlam zamanına *yaqın* Boyat boyından, Qorqut ata diyərlər, bir ər qopdı (31); Mərə çoban, irağından-*yaqınından* bərü gəlgil (43).

YAQMAQ f. Yaxmaq, yandırmaq. 1) Yandırmaq. Kafərlər leşindən bir böyük dəpə yığdı, çaqmaq çaqub od *yaqdı* (44); 2) məc. Sarı tonlu Selcan xatun köşkdən baqar, kiməsə baqar, eşqilə oda *yaqar*! (89).

YAĞ is.Ev heyvanlarının südündən hasil edilən, asan əriyən, yeyilən və xörək bişirmək üçün işlədilən maddə. *Yağ* töküləndə bol ne'mətlü (95).

YAĞLAMAQ f. Yağ çəkmək, yağ sürtmək. Şöylə-çalayım səni mağara divarına kim, quyruğın mağarayı *yağlasun*? -dedi (101).

YAĞI is. Düşmən. Ol gəldi ki, *yağı* basılmışdı (74); ◇ *Yağı basılmaq* - düşmənin basılması. Elə sandı ki, *yağı basıldı* (71); Elə yağı yoxkən səninı babanın üstinə *yağı* gəldi (40); *Yağıya girmək* - düşmən ordusunun içinə daxil olmaq. *Yağıya girüb* baş kəsmədinı (71); *Yağı yormaq* - düşməni yormaq. *Yağı yordı* əlündə qıl kişlim, ayğır malı (63); *Yağı yetmək* - düşmənin çatması. *Yağı yetdi*, düşmən irdi (31).

YAĞILIQ is. Düşmənlik. And iç kim, bizim elümüzə *yağılığa* gəlməyəsən (117).

YAĞMA is. Oğurluq, başqasının malını, varidatını gizli yolla mənimsəmək, götürmək. Qaçan Qazan evin *yağmalatsa*, halalınını əlin alur, tışra çıqar, andan *yağma* edərdi (123); Yağma etmək ...tışra çıqar, andan *yağma edərdi* (123).

YAĞMALAMAQ f. Oğurlamaq, talan etmək. Bəzirganlar yatur ikən ğafillə beş yüz kafər qoyuldılar, çapdılar, *yağmaladılar* (53); Altun axçasın *yağmalamışuz* (43).

YAZIQ sif. Dinc, aciz, fağır. Yigit sana *yazığı* yoq, döngil gerü! - dedi (41); Bəgligə toymadın özümə *yazıx* (48).

YAZILMAQ f.məc.n. Ol Qur'an *yazıldi*, düzildi, üləmalar öyrənincə göyündi (35); *Yazılıb*-düzilib gögdən endi Tənri elmi Qur'an görkli (32).

YAZMAQ f. Yazmaq. Qadir sənin alnuna qada *yazsun* çoban (45).
YAY is. 1) Oxun yayı. Dərsə xan Qorqut sinirli qatı *yayın* əlinə aldı (37); Ağ tozluca qatı *yayın* vergil mana (26); ◇ Yay çəkmək. *Yay çəkmədün,* ox atmadın, (69); 2) Oxun yayına bənzətmə, müqayisə edilən, məc. Gözəlin qaşına işarə. Yay kimi əyriliyə bənzətmə. Qurulu *yaya bənzər* çatma qaşlım (35).
YAYAQ zərf. Piyada, miniksiz. Kafirin yanınca yayaq yürür deyəyinmi? (75); Kəndülər atlu, baban,ı *yayaq* yüritdilər (40).
YAYAN f. sif. Gizlənən, qaçan. *Yayan* ərin, umurı olmaz (57).
YAYQANMAQ f. Silkələnmək, ləpələnmək. Dəniz kimi *yayqandı* (65); Qara dən,iz kibi *yayqanıb* gələn kafərin ləşgəridür (69); Toz yarıldı, gün kibi şıladı, dən,iz kibi *yayqandı,* meşə kibi qarardı (69).
YAYLA is. Yaylaq. Zəmanlə Oğuz yenə *yaylaya* köçdi (98).
YAYLAQ is. Sərinliyə görə yay istirahəti üçün əlverişli olan dağ yeri. Qarşu yatan qara tağlar san,a *yaylaq* olsun (66); Qarşu yatan qara tağı sorar olsam, *yaylaq* kimün? (61)
YAYLAMAQ f. Yay günlərini keçirmək, istirahət etmək. Qarşu yatan qara tağlar istər olsa, el *yaylar* (75).
YAYLAM is. Yaylaq yeri. *Yaylamında* Oğuz elin qondurmadı (99).
YAYLI sif. Yaylı silah. Hamidlən, Mərdin qəl'əsin döpüb yıqan, dəmür *yaylı* Qıpçaq Məlikə qan qusdıran, gəlübən Qazanın qızın ərliklə alan...Qaragünə oğlı Qarabudaq çapar yetdi (49).
YAYILMAQ f.məc.n. Əhatə etmək, genişlənmək. Böylə dikəc qırq incə qız *yayıldılar* (39); Otuz iki dişdən çıqan bütün orduya *yayıldı* (106).
YAYXAN is. antr. *Yayxan* keşiş oğlindən oğli toğar (49); San,a verməziz, *Yayxan* keşiş oğlına verəriz (49).
YALAB sif. Parıldayan, işıldayan. Köksindən *yalab* dəq ötə keçdi (126); *Yalab-yalab* yalabıyan incə tonlum (93).
YALABIMAQ f. İşım-işım işıldamaq. Yalab-yalab *yalabıyan* incə tonlum (93).



YALAQ is. İtə yem tökmək üçün çuxur qab və yer. İtüm ilə bir *yalaqda* yundum içən azğun kafir (43).
YALAN//YƏLAN sif. 1) Aldatmaq məqsədilə deyilən söz, e'tibarsız, gerçək olmayan. *Yalan* dünya başına tar oldı (94); *Yalan* söz bu dünyada olunca, olmasa yeg (41); 2) Mod. s. *Yalansa* bu sözlərin gerçək ola gəlincigim (60).
YALANÇI sif. Yalan danışan adam. Yarumasun, yarçumasun *Yalançı* oğlı Yalıncıq aydır (48).
YALQUZ sif. Tək, kimsəsiz, tək-tənha. Muradinə *yalquz* bir oğula yarəb, noldi (70).
YALVARMAQ f. Birinin könlünü yumşaldıb bir şeyə razı etmək. Əzrayıl aydır: Mərə qavat, man,a nə *yalvararsan,* Allahtəalaya yalvar (80).
YALIN sif. Çılpaq, ayağında çəkməsi olmayan. Qırq yigitlən oğlın Uruz başı açuq *yalın* ayaq (45); ◇ *Yalın eyləmək* - qılıncı qınından çıxarmaq. Kafərlər üyüşər, qılıcın *yalın elər,* kafəri ögінə qatub qovar (91).
YALINCIQ is. Lüt, paltarsız. *Yalıncıq* görsən, tonatğıl (35); Ac görsəm toyurdım, *yalıncıq* görsəm tonatdım (38); Dəli Qarçarı *yalıncıq* eylədi, ağıla qoydu. Birələr Dəli Qarcara üyişdilər (57).
YALISI//YELİSİ is. Beli. Yalı. ....altmış bin kafərə qan qusdıran, ağ-boz atın, yalısı üzərində qar tutdıran Ğəflət qoca oğlı Şir Şəmsəddin çapar yetdi (49); *Yelisi* qara Qazlıq atın bütün bindi (38).
YALN,IZ//YALN,UZ sif. Tək. *Yaln,ız* oğul yollarından dönməyəyim (114); *Yaln,uz* oğul xəbərin, a Dərsə xan, degil mana! (38); Üç yerdə yaralandım, qara başım bunaldı, *yaln,uz* qaldım (46).
YALNUZCA is. Təkcə, birсə. *Yalnuzca* oğul görünməz, bağrım yanar (38).
YAMAN sif. Pis. Çıqsun mənim kor gözüm, a Dərsə xan, *yaman* səgrir (38); On otuz yaşında tolsun, həq sizə *yaman* götürməsin (31).
YAMAC is. Yan tərəf, bayır tərəf. Məgər bir gün göprisinin *yamacında* bir bölük oba qonmuş idi (79).
YAN is. 1) Tərəf, ətraf. Ban ala *yanında* dikilsə gərdək görkli (33); Üç kişi sağ *yanında,* üç kişi sol *yanından* dəmür zəncirlə buğayı tutmışlardı (36); 2) Dəfə. Bu *yana* yigit bəglər

gördilər kim, ev bozulmış: hər biri evli-evinə gəldi (106); ◇*Yanına almaq*. Özi ilə bərabər aparmaq. Oğlancığın *yanına alub* qırq yigidin boyina saldı, ava çıqdı (37); *Yanına gəlmək*. Dəli Domrul sürdi, babası *yanına gəldi* (81); *Yanını qılıncla-maq*. Sağ *yanını qılıcladı* yerə saldı (50); *Yanına varmaq*. Şimdi qızlar *yanına varmaq* istər (63).

YANAQ is. Üzün almacıq sümüyündən çənəyə qədər olan qismi. Güz alması kibi al *yanaqın* tutdı, yırtdı (47).

YANAŞMAQ f. Yaxınına, yanına gəlmək, yaxınlaşmaq. *Yanaşub* yola girəndə qara buğır görkli (33).

YANDIRMAQ f.ic.n. Yandırmaq. Kafiri od oluban *yandı-rayım* (75).

YANIQ sif. Yanmış şey. Yumru-yumru ağladı, *yanıq* ci-gərcigin tağladı (48).

YANILMAQ f.qay.n. Bir işi düz görməmək, yanlışlığa, səhvə yol vermək. Usandı, *yanıldı* (83); Qayırı ərən qılağuzsız yol *yanılsa*, Qılağuzsuz yol başaran Qazan ər idim (117).

YANINCA zərf. Yan tərəfində. Kafər *yanınca* yayaq yü-rür, deyəyinmi? (75).

YANGÜLƏNMƏK f. Yanmaq, alovlanmaq. Şöylə nərə urdu, hayqırdı kim, tağ və taş *yangüləndi* (101).

YANLIŞ sif. Doğru olmayan, səhv. Babası aydır: *Yanlış* xəbərdir, oğul. Qaçan, gedən sənin, ağan degil, ayrıdır (111).

YANMIŞ f.s. Yanıb qurtarmış. *Yanmış* arpa ətməgi, acı soğan eyni degil! (75).

YAPA-YAPA sif. Yumru-yumru, quşbaşı qar, lopa-lopa. dənələri. *Yapa-yapa* qarlar yağsa, yaza qalmaz (31).

YAPAĞLU sif. Güllü-çiçəkli. *Yapağlu* gögcə çəmən güzə qalmaz (31).

YAPDIRMAQ f.ic.n. Tikdirmək, düzəltdirmək. Məgər qız meydanda bir köşk *yapdırmış* idi (91).

YAPILAN f.s. Tikilmiş. Atlasda *yapılanda* göy seyvanlu (63).

YAPILMAQ f.ic.n. Tikilmiş. Alçaq yerdə *yapılubdır* Tənri evi Məkkə görkli (32).

YAPINMAQ f.qay.n. Yapışmaq. Qalqan *yapındılar*, gürz-lərin umuzlarına urdılar (120).



YAPIŞMAQ f. Bitişmək. Mən aşağa qulpa *yapışuram*, sən yuqarı qulpa *yapışursan* (91); Ol qız sözi ilə *yapışdi* deyirlər (96).

YAPUĞ is. Yerlik. Qaradərə ağzında qarabuğa dərisindən beşiginin, *yapuğı* olan, acığı tutanda qara taşı kül eyləyən ...Qa-ragünə çapar yetdi (49).

YAR is. Sevgili, dost. Qadir Allah bilür, mən sana muni-səm, *yaram* qıyma mana dedi (92).

YARA is. Yara. Bədən orqanlarının hər hansı bərk şeylə zədələnməsi və bu zədənin yeri. Oğlanın, qırq gündə *yarası* önəldi (19); Üç qatla *yarasın* əlilə sığadı (39).

YARAQ is. Yaraq, silah. Ağır dügin *yarağın* gördi (57); ◇*Yaraq görmək*. Silah görmək. Bəzirganlar *yaraq gördilər* (58).

YARADAN is. Yaradan, Allah, Tanrı. Heç kimə bənzəmə-yən, bütün aləmləri *yaradan* Tanrıya - Allaha əhsən (131); Qa-musına bənzəmədi cümlə aləmləri *yaradan* (33).

YARALANMAQ f. Yaralanmaq. Güllə və kəsən və s. ilə bədənin bir yerində yara açılması, zədələnməsi. *Yaralanıb* Qazlıq atından enməyincə (38); Üç yerdən *yaralandım*, qara ba-şım bükildi (32).

YARAMAQ f. Bir işi, ehtiyacı, tələbi tə'min edə bilmək, bir işi görə bilmək. Yığılsun oğuz elləri man,a *yarar* qız bulay-mədim (92); Aydır: Canım baba man,a yarar qız buldınmı? (86); *Yarar* qocaları yanına cəm elədi (94).

YARANLAR is. İgidlər, yoldaşlar, dostlar. *Yaranlar* çünki məni göndərirsiz, bilirsiz kim, Dəlü Qarcar qız qardaşını diləyəni öldürər (55); *Yaranlar*, atam öldi mən qaldım (85).

YARƏB is. ər. Ey Allahım, ilahi. Yaln,uz bir oğula, *yarəb* noldı? (72).

YARIM is. 1) Kəsik. Yedi bin qaftanının ardı yırtıxlu, *yarı-mından* qara saclu, sası dinlü, din düşməni alaca atlu kafər bin-di, yılğadı, dün burcuğında Qazan bəgin, ordısına gəldi (42); 2) Bütövün 0,5 hissəsi, say. *Yarım* kərpic yastıqlı (119).

YARIQ sif. Bir şey üzərində uzununa kəsik. Qarnı *yarıq* balığı qarşu tutdın (96).

YARILMAQ f.qay.n. Parçalanmaq, kəsilmək. Toz *yarıldı*, gün kibi şıladı, dəniz kibi yayqandı, meşə kibi qarardı (69); De-

di həman dəm *günbəd yarıldı*, yedi yerdən qapu açıldı (102); Bu yığnaq *yarıldı* (99).

YARIMAQ f. Bir işə lazım olmaq, gərək olmaq, fayda vermək. *Yarımasun*-yarçumasun sənin oğlın kür qopdı, ərcəl qopdı (36).

YARIN zərf. Sabalı. Bu gün bən geydim, *yarın* naibim geysün (57); Təkur önün,ə gəldi, ayıtdı: - *Yarın* qızını man,a vergil, - dedi (89); Bu gün, *yarın* qanda isə, gəlür (38).

YARINKİ zərf. Sabahkı gün. *Yarınki* gün mən öləm, oğlım qala (85).

YARIŞ is. Yarış. Bir işdə üstün gəlmək, birinciliyi qazanmaq üçün bir-birini keçməyə çalışmaq. Yügrək olsa *yarışsam* (101).

YARMAQ f. Bir şeyi zərbə ilə vurub ortadan ikiyə bölmək, sındırmaq. Beyrək qızın oxunu *yardı* (49); Ox atanda mən sənin oxuni *yarmadımmı*? (70); Ol kafərin içün atub birin *yarmaz* aqçası olur (70).

YARÇIMAMAQ f. Yarımamaq (Qarğış). Yarımasun-*yarçumasın*, sənin oğlın kür qopdı, ərcəl qopdı (36); Yarımasun-*yarçımasun* kafərin casusı bunları casusladı (57).

YAS is. Yas, matəm. ◇ Yas tutmaq. Yas saxlamaq. Qalın Oğuz bəgləri Beyrək üçün əzim *yas tutdilər* (50); Qalın oğuz elində (mənim) *yasim tutsun* (80).

YASAQ sif. Qadağa. Aruz, Dəpəgözi dökdi-sökdi, *yasaq* eylədi (99); ◇ Yasaq eyləmək. Qadağan eyləmək. *Yasaq eyləmişlərdi* (94).

YASDUQ is. Yastıq, balış. Göz açuban gördigin, kön,ül ilə sevdigim, bir *yasduqda* baş qoyduğım (58).

YASİN is.ər. Ölü üçün oxunan Qur'an surələrindən birinin adı. Hecəsinləyin düz oqınsa, *yasin* görkli (32).

YASSANMAQ f. Hərtərəfli hazırlıqla hücum etmək. *Yasınuban* üzərinə yağı yetdi (192).

YATAQ is. Yatmaq üçün yer. Basatı ögino qatdı, tutdı. Boğazdan salındırdı. *Yatağına* gətürdi (101).

YATA-YATA zərf. Çox yatmaq. *Yata-yata* yanımız ağrıdı (42).

YATACAQ is. Yaşamaq üçün yer, məkan. *Yatacaq* yermi buldın? (36); Ölməgə, yitməgə gətməmişdim, *yatacaq* yerim



genə bu xərab olasıydı. Noleydi, bənim evimə bir ləhzə baqaydın,ız! (33).

YATMAQ f. 1) Yuxuda olmaq. Bəzirganlar *yatur* ikən ğafillə beş yüz kafər qoyuldılar, çapdılar, yağmaladılar (52); Baqsa, görsə oğlancığı alca-qana bulaşmış *yatur* (39); 2) Bir şeyin yerdə olması. Gördi kim, yüzik genə Dəpəgözin ayağı altında *yatur* (101); 3) Qarşıdakı. Qarşı *yatan* Alə Tağdən bir oğul uçurdunsə degil man,a (38).

YAXŞI sif. 1) Müsbət keyfiyyətlərə malik olmaq. Ol ağacın dibində *yaxşı* binar vardı (53); Ol obadə bir *yaxşı* xub yigit sayru düşmiş idi (79); Valah, *yaxşı* yigit, mürüvvətlü yigit dedilər (53); 2) Zərf mə'nasında. Ol *yaxşı* bilür (49).

YAŞ I. is. Yaşadığı ömr. Adını mən verdim, *yaşını* Allah versin dedi (36); On otuz on *yaşında* tolsın, həq sizə yaman gətürməsin (32); ◇ Yaş yaşlamaq, ömür sürmək. On altı il *yaş* yaşladın (69); Dəli Domrul yüz qırq yıl dəki yoldaşıyla *yaş* yaşadı (83).

YAŞ II f.1) Yaşarmaq. Heybətindən sol gözüm *yaşarı* (118); 2) Ağlamaq. Oğlan böylə degəc bıldır-bıldır gözinin *yaşı* rəvan oldi (47); Qara qıyma gözləri qan-*yaş* toldı (121).

YAŞARMAQ f. Göyərmək, ağacın göyərməsi. Vəba ağacın qurumışdı, *yaşardı* axir (60).

YAŞIL sif. Ot rəngində olan. Boz atlu *yaşıl* ton,lu Xızır (İlyas) hazır oldı (23,38).

YAŞIRMAQ f. Gizlətmək. Alp ərən ərdən adın *yaşırmaq* eyb olur (102).

YAŞAMAQ f. Ömür sürmək, yaşamaq. Xanım bunı man,a verin oğlum Basatla *yaşlıyayın*, - dedi (99).

YAŞMAQ is. Yad kişilərdən yaşınmaq üçün qadınların gözdən aşağı hissəsinin örtüyü. Xatunları qas-qas *yaşmaqları* altından gülüşdülər (58); Ayağım başmaq, yüzim *yaşmaq* görmədi (33).

YAŞMAQLANMAQ f. Üzünü örtmək. Banıçiçək *yaşmaqlandı*, xəbər sordi (54).

YEDİ s. Yeddi. Qaradərə ağzında qara buğa dərisindən beşigin yapuğı olan, acığı tutanda qara taşı kül eyləyən, bığın ənsəsindən *yedi* yerdə dügən, ərənlər əvrəni, Qazan bəgin qartaşı Qaragünə çapar yetdi (49); *Yedi* gün, *yedi* gecə yemə-içmə oldı (78).

YEDİ AĞAC s. 1) Ölçü vahidi. Kafirlər *yedi ağac* yer qarşı gəldilər (91); 2) Yedi qat. s. Numerativlə ölçü vahidi. *Yedi qat* meydani tolandi gəldi (91).

YEDİRMƏK f. Yeməyə məcbur etmək, yeməyə sövq etmək. Talı sazın aslanına *yedirdinmi*? (72); Umanına-usmanına aş *yedirdim* (73).

YEDMƏK f. Yedəkləmək. Həm ölülərin$_1$ izin$_1$ yorğasın binərəm, kahillərin *yedərəm*, - dedi (116).

YEZİDİLƏR is.ər. Yezidilərin dünyanın yaradılmasında iblisin qüdrətinin üstün olacağı əqidəsinə mənsub məzhəb. Kərbəla yazısında *yezidilər* əlində şəhid oldı - Həsənlə Hüseyn iki qardaş bilə - görkli (32).

YEYİN zərf. Yeyinlik, itilik. Ərin$_1$ ağzın *yeynisin* at bilür (32).

YEKƏ sif. Böyük. Gördi kim, oğrı köpək *yekə* tana evini bir-birinə qatmış, tauq komasına, sığır tamına dönmüş (33).

YEG sif. Yaxşı. Əgini *yeg* dəmür tonum saqlardım (66); Böylə ağıl olmaqdan olmamaq *yegdir* (36); Çala bilən yigidə oqla qılıcdan bir çomaq *yeg* (32).

YEGNƏK is. antr. Oğul. *Yegnək* qandı gedərsən? -dedi, söylədi (95).

YEGRƏK zərf. Yaxşıraq. Məndən *yegrək* qadir sizə oğul verər (75).

YEL is. Külək. Yavuz yerlərə *yel* topdin qayidə döngil (90); Salqum-salqum tan *yelləri* əsdigində (37).

YELƏK 1) numer.söz. Saylarla işlənir. Ölçü vahidi. Dədəyi qoa-qoa Dəli Qarcar on *yelək* yer aşurdı (56); 2) Qanad, lələk. Ağ *yeləgli* ötgün oxdan qayıqlıyən (94).

YELƏKLİ sif. Qanadlı, lələkli. Üç *yeləkli* qayın oqlar atıldı, dəmrəni düşdi (50).

YELƏM sif. Pişikotu, yapışqan. Qazılıq qoca anı gördigin-ləyin yel kibi yetdi, *yeləm* kibi yapışdı (94).

YELİ is. Arxa, dal. *Yelisi* qara Qazlıq atun$_1$ binmədin$_1$mi? (88); Qaftanın altından ayağın bərk sardı, [at] var qüvvətilə atının$_1$ *yelisinə* düşdi (108).

YELƏTMƏ is. Oyun havasının adı, gəlin havası. Ozan gəldi, *yelətmə* çaldı (90).

YELKƏN is. Dar ağacına bənd edilən və içinə yel dolduğu zaman gəmini, qayığı hərəkət etdirən xüsusi biçimli qalın,



möhkəm bez parçası. Gəmi yapub, kömləgim çıqardım, *yelkən* qurdım (95).

YELTƏNMƏK f. Məskən salmaq, yerə çatıb dayanmaq. Yavuz yerlərə *yeltəndin$_1$* qayıda döngil (86).

YEMƏK I is. Qida: Ağam Qazan, bu ağac ol ağacdır kim, sən kafəri basarsan, qarnın acıqar, mən san$_1$a bu ağacla *yemək* bişürəm, - dedi (46); Qızlar vardılar *yemək* gətirdilər (54); Sultanım, məni qosan$_1$ da şülən *yeməgin* yanına varsam (69).

YEMƏK II. f. Oğuzdan dəxi adam *yeməgə* başladı (99); Hər biri *yeməkdə*, içməkdə idi (49).

YEMƏKCƏ is. Yeməyə gərək olan qədər zaman, müddət. Oğlan-uşaq yemək *yeməkcə* gəlməz [bana], -dedi (71).

YEN$_1$ is. Paltarda qolun ağzı, aşağı tərəfi. *Yen$_1$ümlə* alınum qanın$_1$ bən siləyin (26); Günü gəldi, *yen$_1$*-yaqalar dikdürəyim səninçün (70); Əllərini *yen$_1$inə* çəkdi (65).

YENƏ zərf. Təkrar, bir daha, təzədən. *Yenə* Bayındır xandan adam gəldi (104); *Yenə* toy edib atdan ayğır, dəvədən buğra, qoyundan toğanın qıram, derdim (103).

YENİDƏN zərf. Bir də, təzədən, təkrarən. *Yenidən* toğanın qıram, derdim (103).

YEN$_1$MƏK f. Enmək, üstün gəlmək. Çoq çalışdılar: nə buğa yenər, nə Qanturalı *yen$_1$ər* (88); Nə oğlan *yen$_1$ər*, nə buğa *yen$_1$ər* (36).

YEN$_1$İLMƏK f. icb.növ. Əyilmək. Gördilər ki, namus içün *yenilməz*, ayıtdılar (87).

YEN$_1$İMƏK f. Təzələmək. Yenə uyxusın *yeniməyüb*, yerinə varub yatdı-uyıdı (113); Bəkil at cilavısın *yenimədi*, bilə uçdı (105).

YENGƏ is. 1) Gəlin köçürülən zaman onun yanınca gedən qadın. Qısırca *yengə* derlər, bir xatun vardı. İlərü vardı, pay dilədi (54); 2) Qardaşın, əminin və dayının arvadı. Ağca yüzlü *yengəmi* tul eyləmişsən (103).

YER is. Yer. *Yerdə* isə, oğulı çıqarayım, gögdə isə endirəyim (74); Ağ birçəklü anan$_1$ *yeri* behişt olsun (67); Şami günligi *yer* yüzinə tikdirmişdi (71); ...bir *yerə* ağ otaq, bir *yerə* qızıl otaq, bir *yerə* qara otaq dikdirmiş (35); ◊ *Yer gözətmək*. Yer göstərmək, hörmət etmək. Ol gün namərdlər, müxənnətlər san$_1$a *yer* gözətdi (71); Yerin tutmaq, əvəzini tutmaq. Səndən yekrək qadir bizə oğul verməz. [Versə] dəxi sənin$_1$ *yerin* tuta

bilməz (76); Yer gizləmək, məc. Basdırılmaq. Ölüb torpağa basdırılmaq. Əcəl aldı, *yer* gizlədi. Fani dünya kimə qaldı (78); *Yer öpmək.* Baş əymək. Gəlin *yer* öpdi, aydır (98). *Yerə* urmaq. Yerə vurmaq, məğlub etmək, heçə çıxarmaq. Dəli Domrulı götürdi, *yerə* urdı (80); *Yerə qoymaq.* Yerə, torpağa hörmətlə səcdə etmək, namaz qılmaq. Ağ alınların *yerə qoydılar* (50); *Yerə düşmək.* Atdan enmək. Bədəvi atının boynın qucaqladı, *yerə düşdi* (37); *Yerə dökmək.* Yerə tökmək. Sədəqindən toqsan oxun *yerə dökdi* (101); *Yerə enmək.* 1) Olduğu adi vəziyyətdən tam əksinə olmaq. Sən gedəli ağılmağım gögdə ikən *yerə endi* (75); 2) *Yerə düşmək.* Qonur atından *yerə endi,* aqub gedən arı sudan abdəst aldı (76); *Yerə gəlmək,* mənzil başına, istədiyi yerə çatmaq. Qoa-qoa bir *yerə gəldi* (54); *Yerə salmaq.* Endirmək. Aşağı endirmək. Şökli Məligi bögirdibəni Qazan bəg atdan *yerə saldı* (66); Quyruğından üç kərə götürüb yerə saldı (66); *Yerə çalmaq.* Yerə zərblə atmaq. Altun ayağı əlindən *yerə çaldı* (53); *Yeri uçmaq olmaq.* Yeri behişt olmaq. Ağ saqqallu baban *yeri uçmaq olsun* (67); *Yerində oturmaq.* Vardı *yerində oturdı* (63). Yerindən turmaq. Ayağa durmaq. Xan qızı gördi kim, Qazan gəlür, *yumurlanıb yerindən* urı *turdı* (72); Bir gün Ulaş oğlı Qazan bəg *yerindən turmışdı* (68); Ərə varan *yerindən tura,* bən qopuz çalam (63); Yerindən qalxmaq. Bir qoç *yerindən qalqdı* görinüb sündi. Dəfi Basat qoçı basub boğazladı, dərisini yüzdi (101).

YERİNDİRMƏ f. Utandırma, xəcalət etmə, rədd etmə. Sevindirdin *yerindirmə,* ozan, məni, - dedi (62).

YERİNƏ is. Əvəzinə. Əzrayıl aydır. Mərə Dəli Dömrul, Allah-təalanın əmri böylə oldı kim, Dəli Domrul canı *yerinə* can bulsun, onun canı azad olsun, - dedi (81).

YERİTMƏK f. Yürütmək, yeritmək. Özləri atlı, atanı piyada *yeritdilər* (40).

YERLÜ sif. Eyni yerdən olan, bu yerdə yerləşən dağ, dərə, su və s. *Yerlü* qara tağlarun yıqılmasun (98).

YESİR is. Əsir. Boyı uzun Burla xatun *yesir* getdi (43); ◇ *Yesir etmək.* Qaza bənzər qız-gəlini biz *yesir* etmişüz (43); *Yesir olmaq.* Əsir olmaq. Qırq incə bellü qızla Burla xatunı götürüb durursan, sənə *yesir* olsın (48).

YETƏR is. antr. *Yetər,* Zəlihə, Zübeydə, Üriydə can, qızcan (33).



YETİRİ is. Yetirməsi. Oğul atanın *yetiridir,* iki gözinin, biridir (31).

YETMAN f. sif. Ağıllı, yetgin. Səndənmidir, bəndənmidir, Tənri təala bizə bir *yetman* oğıl verməz, nədəndir? (35).

YETMİŞ f. sif. Bilikli, tədbirli. Biligi *yetmiş* qoca babam var, Qomağım yoq qırq namərdə! - dedi (41).

YONALMAQ f. Bir şeyi başqa bir kəsə və ya yerə çatdırmaq. İkisini bir yerdə kafər ellərinə *yonalalım* deyü Dərsə xanı tutdılar (40).

YƏQİN zərf. fars. Şəksiz, şübhəsiz. *Yə'qin* bildi kim, oğlı kafərə tutsaqdır, ağladı (74).

YƏYLADMAQ f. Yaylamaq. Ağam Beyrək gedəli *yəyladım* yox (53).

YƏYQƏNMƏK f. B a x: Yayxanmaq. *Yəyqəndiğində* yağ tökülən bol ismətlü (57).

YƏLAB is. Alov. Kösündən *yəlab* dəq ötə keçdi (126).

YƏLAB-YƏLAB zərf. Par-par parıldayan. *Yəlab-yəlab* yəlabiyan incə tonlim (93).

YƏLABIMAQ f. Parıldamaq. Yəlab-yəlab *yəlabıyan* incə tonlum (93).

YƏLAQ is. İtin yal yediyi, içdiyi çuxur qab. İtümlə bir *yəlaqda* yundun içən azğun kafər (43).

YƏLVARMAQ f. Minnət etmək. Birinin könlini yumşaltmaq üçün öz nəfsini alçaldaraq, tə'kidlə xahiş etmək. Mərə dəli Qavat manıa niyə *yalvarırsan*? (82).

YƏMAC köm.s. Yanına. Boyi uzun Burla xatun oğlının *yəmacinə* gəldi (47).

YƏXNİ is. Ətdən hazırlanan xörək. Qara tonuz ətindən *yəxni* qılan aşbazı olur (70); Kəsə-kəsə yeməgə *yəxni* yaxşı (96); Qara qoyun ətindən *yəxni* gətirin, yersə-yesün, yeməzsə, tursun getsün (35).

YİGİRMİ s. İyirmi. Vardı bu qırq yigidin *yigirmisi* bir yana, *yigirmisi* dəxi bir yana oldı (36).

YİGİT//YİGİD is. İgid, qoçaq. Bir *yigidin* qara tağ yumrısınca malı olsa, yığar-dərər (31); Ol qırq *yigitə* həsəd eylədilər (36); Baba, içində bəg *yigitlər* öldürsələr, qan sorularmı? (69).

YİGİTLİK is. Qoçaqlıq, qəhrəmanlıq. Götürcək olursan *yigitligün* səni tutsun ağac (47); *Yigitlikləri* tutdı ola gözüm, səni (103).

YİGİTCİK is. Cavan igid, qoçaq. Pəs Qazılıq qoca oğlı Yegnək - taza *yigitcik* yaradan Allaha sığındı (96); Bığcığı qararmış *yigitciklərі* çox yemişəm (103).

YİL is.İl. Xanlar xanı xan Bayındır *yildə* bir kərrə toy edib. Oğuz bəglərin qonaqlardı (34); Bir *yildə* gəlməzsən, iki yil baqam (112).

YİLƏMƏK f. İylətmək, öpüşmək. Gizlü yaqa tutuban *yiləşdilər* (93).

YİLMƏK f. Minmək, ata minmək. Qaraqucda Qazlıq atına çox *yilmişəm* (124).

YİTMƏK f. İtmək. Ölmişmiydin$_{ı}$, *yitmişmiydin$_{ı}$*, a Qazan? (45).

YIQANMAQ f. Yuyunmaq. Arqıç qırda *yıqanır* Əmman dənizində (118); *Yıqandığında* yağ dökülən bol ne'mətlü (63).

YIQMAQ B a x: Yıxmaq. Kafərin kəlisasın *yıqdılar*, yerinə məscid yapdılar (67); Qoyun diməz sapanın ayasına qor atar, kafəri *yıqar* (44).

YIQILMAQ I. f. qay.n. B a x: Yıxılmaq. Öz ağırlığı ilə yerə enmək, düşmək. Qarşu yatan qara tağım *yıqılıbdur* (62); Oğlan anda *yıqıldıqda* boz atlu Xızır oğlana hazır oldı (38); Qara tağların *yıqılmasun*! (67); Bir dəxi urdı, dəvə ayağı üzərinə turımadı, *yıqıldı* (90).

YIQILMAQ II f.məc.n. Bir yerə toplaşmaq, cəmləşmək. *Yığılsun* Oğuz elləri man$_{ı}$a yarar qız bulaymədin baba dedi (85); Gördüm ki, atun-axça *yığılmış*, baqaraq gəndözin$_{ı}$ unıtdı (101).

YIĞICI f.s. Yıxan. Qalın oğuz bəglərini bir-bir atından *yığıcı*. Qazlıq qoca oğlı bəg Yegnək çapar yetdi (49).

YIĞIŞDIRMAQ f. icb.n. Bir yerə yığmaq, fikirlərini bir yerə toplamaq. *Yığışdırsın*, dürüşdürsün günahlarını adı görklü Məhəmməd Mustafa yüzü suyinə bağışlasun (35); Ol ikicə sünicigin uzun olmış *yığışdır*, axı!...(39).

YIĞIŞMAQ f. Bir yerə toplaşmaq. On ikicə sügüciyin örnək olmuş, *yığışır* axi (35).

YIĞMAQ f. Bir yerə toplamaq. Dəpə kibi ət *yığdı*, göl kibi qımız sağdırdı (35); Oğul sən mala becid ol *yığ*, mən san$_{ı}$a qız arayı gedəyim dedi (85); Kafərlər leşindən bir böyük dəpə *yığdı* (44).

YIĞNAQ//YIĞANAQ is. Yığıncaq, yığılmış, toplanmış adamlar. Qazanın bəkləri həp gəlüb yetdi, üzərinə *yığnaq* oldı (79); Gördi kim, *yığanaq* yatur, yıldır-yıldır yıldırır (98); ◇ *Yığnaq eyləmək*. 1) Yığılıb vuruş eyləmək. İç Oğuz, Taş Oğuz bəglərin üstinə *yığnaq* etdi (35); 2) *Yığanaq yarılmaq* - yığanağın parçalanması, dağılması. Bu *yığanaq* yarıldı, içindən bir oğlan çıqdı (99); 3) *Yığnaq olmaq* - adamları bir yerə toplamaq, yığmaq. Qazanın bəgləri gəlüb yetdi, üzərinə *yığnaq oldi* (79); Üç, Boz oq *yığnaq olsa*, ol vəqt Qazan evin yağma edərdi (123); Oğuz bəgləri birin gəlüb, *yığnaq olmağa* başladı (34).

YIL is. İl. On altı *yıldır* kim, babanın$_{ı}$ tutsaqıyim (59); Bunın$_{ı}$ üzərinə on altı *yıl* keçdi (58).

YILABUDAQ sif. Azacıq. Başın qaldırdı, *yılabıdaq* gözin açdı (39).

YILADAĞ is. İlədək. Üç *yıladağ* taşı düşdigi yerin otı bitməzdi (48).

YILAMAQ f. Qaçmaq. Yigirmi bin ər yağı gördümsə *yılamadım* (117).

YILAN is.İlan. Sarı *yılan* soqmadın ağca tənüm şişər (38).

YILĞAMAQ f. Gətmək. Yedi bin qaftanının ardı yırtıxlu yağrımından qara saçlu, sası dinlü, din düşməni alaca atlu kafər bindi, *yılğadı* (42).

YILDIR-YILDIR sif. Parıltı, işıltı. Gördi kim, bir yığanaq yatur, *yıldır-yıldır* yıldırır (98).

YILDIRMAQ f. Parıldamaq, işıldamaq. Gördi kim, bir yığanaq yatur, yıldır-yıldır *yıldırır* (98).

YILLIQ is. İllik. Ağ çadır dikdilər, ala qalı döşədilər, ağca qoyun qırdılar, yedi *yıllıq* al şərab içürdilər (87); On altı *yıllıq* həsrətin oğlın Beyrək gəldi, axır (66).

YIRĞAMAQ f. Qoparmaq, ayırmaq. Ağ qovanın budağından *yırğayuban* keçmişsən (63).

YIRTICUQ is. Şəxs adı. Yalançı oğlı *Yırtıcuğa* varır gördüm (59).

YIRTILMAQ f. Cırılmaq, kəsilmək. Pəs varasan, bir cicibici türkman qızını alasan, nagahandan tayanın, üzərinə düşəm, qarnı *yırtıla*, - dedi (85).

YIRTMAQ f. 1) Cırmaq. Güz alması kibi al yanağın *yırtdığını* qız (55); Güz alması kibi al yan,ağım *yırtdığım* çoq (65); 2) Öldürmək. Şimdi yigidi atar, yıqar sərər, *yırtar* (93).

YIRTIXLU sif. Yırtıq, cırıq. Yedi bin qaftanının ardı *yırtıxlu*, yarımından qara saçlu sası din,lü, din düşməni alaca atlu kafər bindi yılğadı (42).

YIXILMAQ f. Müvazinətini itirərək aşağıya düşmək. At *yıxıldı* (71).

YOŞAN is. Yovşan. *Yoşan* kibi bərk olmaz (108).

YOQ//YOX əd. Xəbər mə'nasında. Bir şeyin hazırda olmadığını bildirir. And içmişəm, qısır qısrağa bindigim *yoq* (64); Kimün ki, oğlı-qızı *yoq*, qara otağa qondırın, qara keçə altına döşən, qara qoyun yəxnisindən ögină gətirün (34); Dirsə xan derlərdi, bir bəgün, oğlı-qızı *yoxdı* (34).

YOQDUR xəbər. Yoxdur ("vardır"ın əksi). Tən,rinin, birliginə *yoqdur* güman (89).

YOĞRAMAQ f. Yoğramaq, əzişdirmək. Qaba çomaq, altında *yoğradəyim* sənin içün (129); Güni gəldi qaba çomaq altında *yoğradım* sənin içün (70).

YOĞRUD is. Yoğurt, qatıq. Yüzin yumadan toquz bazlamac ilən bir güvlək *yoğrud* güvəzlər (72).

YOĞURMAQ f. Ovmaq. Buğa dizin çəkdi, buynuzilə bir mərmər taşı *yoğurdı*, penir kibi ditdi (87).

YOL I is. Gediş-gəliş üçün yer. Sanasan ki, tar *yoldə* toli düşdi (37); *Yolın,a* qurban olayım gəlincigim (66); Ayrı-ayrı *yollar* izin dəvə bilir (53); ◊ *Yol azmaq. Yoldan çıxmaq* - yolunu itirmək. Qaran,u dün içində *yol azsan* umun nədir? (102); *Yola düşmək. Yola çıxmaq* - getmək. Kafir keçdiyi *yola düşdi*, getdi (44); *Yola girmək* - getmək. İkisi bilə *yola girdi* (46); Dəxi Qonır atın mindi, ön,cələdi, *yola girdi*. Evinə gəldi (72).

YOL II is. Hörmət mə'nasında. Qızların *yolı* əvvəldir, əvvəl sən at! - dedi (93). ◊ *Yola getmək*. Yaxşı rəftar etmək, dinc hərəkət etmək. Köpək çəkildi, gəldügi *yola getdi* (45); Yol yarağın görmək. Yola hazırlaşmaq. Bir dəxi altı pərli gürz aldılar. Yol yarağın *gördilər* (52).

YOLDAŞ is. 1) Həyat yoldaşı. Adəmilər əvrəni *yoldaşına* qıyamadı (83). Dəli Domrul yüz qırq il dəxi *yoldaşilə* yaş yaşladı (109); 2) Yaxın adam. Ol qırq namərd babanın, *yoldaşları*, babani tutdilər (40); Beyrək yayı gördigində *yoldaşların,* andı anladı (62); *Yoldaşların,ı* sorub, oğlan burada söyləmiş, görəlim, xanım, nə soylamış (105).

YOLDAŞLIQ is. Dostluq, yoldaşlar arasındakı yaxınlıq. Bayındır xan yigirmi dört bəhadır sancaq bəgini Yegnəyə *yoldaşlığa* belə qoşdı (95).

YOLMAQ f. Dartıb qoparmaq. Qarğu kibi qara saçın, *yolarmısan*, ana? - dedi (82); Qarğu kibi qara saçın, *yoldi* (47).

YOLÇI is. Diləncì, yolçu. Şunda bir dəlü yigit *yolçının* yolaqçının, çobanın,-çolağın, ətməgin alur (113).

YONALMAQ f. Getmək. Gəlün Dərsə xanı tutalım, ağ əllərin ardına bağlayayım, qıl sicim ağ boynına taqalım, alubanı kafər ellərinə *yonalalım*, - deyü Dərsə xanı tutdılar (40).

YONMA sif. Yonulmuş. *Yonma* ağac tən,rili köpəgim kafər (119).

YONMAQ f. Bir şeyi naziltmək məqsədilə xüsusi kəsici, yaxud yonucu alətlə üstünü götürmək. Xan qızına tırnaq *yonun,* (65).

YORĞA is. Sakit yerişli, rahat yeriyən. Həm ölülərin,in, yorğasın binərəm, kahillərin yedərəm, - dedi (116).

YORĞAN is. İçi yunla və ya pambıqla düzəlmiş örtük. Ala *yorğan* içində səninlə tolaşmadım (92).

YORĞUN sif. Çox işləmək, yerimək və ya hərəkət etmək nəticəsində yorulmuş. Yorğun adam. *Yorğun* at Qazan, oğlan avda idigin anan biləyin kim, *yorğun* atunla güdəlim (74).

YORMAQ f. 1) Yorulmasına səbəb olmaq, taqətdən salmaq. Yağı *yordı* əlümdə qıl kişlim ayğur malı (63); 2) Yozmaq. Özü istədiyi kimi mə'na vermək, izah etmək. Xanım qardaş, mənim düşimni *yorğıl* mana - dedi (44).

YORTMAQ f. Keçib getmək. Dolamac yollarını qadir qoursa, dünlə *yortam* (86); Gəldügi yolı əlinə alub *yortdı* (74); Gecə-gündüz *yortdılar* (90); ◊ *Yortub getmək*. At kimi yerimək. Babasının ardınca *yortub* getdi (40); Yort eyləmək. At yerişi yerimək. Dün qatdı, *yort eylədi* (113).

YORTUŞMAQ f. Birlikdə getmək. Tatlu dəmağ verübən soruşdılar, ağboz atlar binübən *yortuşdılar*, bəg babası yanına irişdilər (93).

YORULMAQ f. Yorulmaq. Toqlı başlu Turı ayğır *yoruldı* (56).

YORULTMAQ f.ic.növ. Atı qaçmağa məcbur etmək. Qonıur atım *yorultmışam* sənin içün (75); Ağ-boz atlar *yorultmuşam* qartaş içün (114).

YOXSƏ bağ. Əks surətdə, əks təqdirdə, belə olmasa. Nə qaqarsan bana ağam Qazan? *Yoxsa*, köksündə yoqmıdır iman? (45); Nə biləyin, oğul, arslandanmı oldı, *yoxsa* qaplandanmı oldıq (39).

YÖN is. Tərəf, yan tərəf, böyür tərəfi. Nə gəlürsə, bənim sağrıma gəlsün, deyü əlini urur, *yönin* anıaru sağrısın ərinə döndərür (33); ◇ *Yan almaq* - istiqamət almaq. Alıbanı kafir ellərinə *yan aldılar* (40).

YUVA is. Quşların yumurtlayıb bala çıxarmaq və onları saxlayıb böyütmək üçün çör-çöpdən və s.-dən düzəltdikləri yer. Qab qayalar başında *yuva* tutan (89).

YUQARI zərf. Yuxarı. Üst, üstdə olan. *Yuqarıdan* aşağa kafər oğlanı qatı urdı (108); Dəli Qarcarın əli *yuqarıda* asılu qaldı (56).

YUDMAQ f. Udmaq. Qanlu quyruq üzüb çap-çap *yudan* (45).

YULAR is. Noxta, atın noxtası. Həsud kafərlər bağlamadılar, *yuların* sıyırıb salı verdilər (89).

YUM is. Xeyir-dua. ◇ *Yum vermək*. Xeyir-dua vermək. Ol ökdüyüm yucə Tanri dust olubən mədəd irsün! *Yum* verəyin, xanım (41).

YUMAQ f. Su ilə təmizləmək. Əllərini yumaq və s. Gəldinı ol kim soldıran soydır, capadanca yerindən uru turar. Əlin-yüzin *yumadan* toqquz bozlaməc ilən bir güvlək yoğurd gəvəzlər (33); Gəldin, ol kim toldıran toydır, dəpdincə yerindən uru turdı, əlin-yüzin *yumadan* obanını ol ucından bu ucına, çarpışdırdı (33).

YUMRU-YUMRU zərf. Hönkür-hönkür ağlamaq, yana-yana ağlamaq. Yumru-yumru ağladı, yanıq cigərcigin tağladı (48).

YUMRUQ is. Yumulmuş əl, əlin yumulmuş vəziyyəti. Buğanın alnına bir *yumruq* eylə urdı kim, buğayı göti üzərinə çökürdi (88); Oğlan bu qatla buğanın alnına *yumruğını* tayadı, sürdi meydanın başına çıqardı (36).

YUMRULANMAQ f. Özünü yığışdırmaq. Xan qızı gördi kim, Qazan gəlür, *yumrulanıb* yerindən uru turdı (72).



YUMUŞ sif. Yumşaq təbiətli, xasiyyətcə həlim, mülayim. Mən dəxi bir *yumuş* oğlanıyam, - dedi (80).

YUND is. 1. At, day. Qaz-alaca *yundını* turğurmayıl (118); Qılıc çəküb altı kafər dəplədi, tolanbaz urıb *yundları* ürkitdi (113); 2. Yal. İtim ilə bir yalaqda *yundum* içən azğun kafər (43).

YURD//YURT is. 1) İnsanın doğulub böyüdüyü yaşayış yeri. Bir gün ola düşəm, yerimdə-*yurdumda* kimsə qalmıya, - dedi (51); Gördilər kim, uçarda quzğun qalmış, tazı tolaşmış *yurtda* qalmış (57); ◇ *Yurdına qonmaq*. Vətəninə gəlmək. Oğuz genə əyyamda gəlüb, *yurdına* qondı (98); 2) Torpaq, yer. Qaraca çoban zərb eylədi, qaba ağacı *yerilə*-yurdilə *qopardı*, arxasına aldı Qazanını ardına düşdi (46).

YUCA sif. Uca, böyük, ulu. Ol ögdigim *yuca* Tənıri dost olubanı mədəd irsün (41); Beyrək *yuca* çartağdan baqdı, bazırganları gördi (58); Alçaqlardan *yuca* yerlərə çapub çıqdı (38); ◇ *Yuca tutmaq* - üstün tutmaq. Könlin *yuca* tutan ərdə dövlət olmaz (31).

YUCALMAQ f. Ucalmaq. Qalxmaq. Arğab-arğab qara tağın yığılmışdı, *yucaldi* axır! (58).

YÜZİQARALIQ is.məc. Üzü qaralıq, üzü qara olmaq, xəcalətli olmaq. Həqsuzə *yüziqaralığı* dəgə (55).

YÜZSUYİ is.məc. Üz suyu. Abır, həya, abırlı üz. Yığışdırsun, dürüşdürsün günahlarını Məhəmməd Mustafa *yüzisuyinə* bağışlasın (33).

YÜZ I say. Doxsan doqquzdan sonra gələn rəqəm - 100. Altı *yüz* kafər dəxi mənim üzərimə gəldi (45).

YÜZ II is. üz, sifət, sima. Gərək başına qaxınc, *yüzinə* toxunc olmasun (120); Oğlanın *yüzinə baxdı* (68); Yalabudaq gözin açdı, anasının *yüzinə baqdı* (34); ◇ *Yüzi gülmək*. Sevincli olmaq. Ərə varalıdan bəri dəxi qarnım toymadı, *yüzim gülmədi* (33); Yüzi dönmək. *Yüzi dönməz* qılıcum ələ aldım (117); Yüz binı ər gördümsə, yüzüm dönmədi (117).

YÜZDÜRMƏK f. Üzməyə məcbur etmək; məc. Süzdürmək. Kafərləri it ardına burağıb xorlıyan, eldən çıqub Ayğırgözlü suyından at *yüzdürən*, əlli yedi qələninı kəlidin alan... qoca oğlı Alb Ərən çapar yetdi (50); Gözlər *yüzdürən*, əlli yedi qəl'ənin kəlidin alan İlək qoca oğlı Dülək Uran bilə varsun! - dedi (95).

YÜZİK is. Üzük. Əsasən qızıldan qayrılan bəzək üçün və ya evlilik rəmzi. Məgər göygüsünün *yüziginə* nişan atarlardı (62); Oğlan *yüzigin* alub taqdınmı? (101); Beyrək oqla *yüzigi* urdı, paraladı (63).

YÜZLÜ sif. İnsan üzünün rənginə, quruluşuna görə müəyyənlik. Ağca *yüzlü* anamı sızlatdın ola qardaş! (100)

YÜK is. Bir şeyi götürmək, daşımaq. Ağır *yüklər* zəhmin qatır bilür (32); □ Göz yükü. Baxmaq qayğısı. Heç yigidə verməsün qadir Tənri göz *yükini* (103).

YÜKƏLTMƏK f. Yüklər. Fir'on şişlər *yükəlib* yerdən çıqsa, Qaba öncəmlə pərçin qılan Qazan ər idim (117).

YÜKLƏT is. Yüksəltmək. Qatar-qatar dəvələrim götürüb durursan, sana *yüklət* olsun (48); Sənin, də içində *yüklətin* varsa, yigit, degil mana! (40); ◇ *Yüklət olmaq*. Yüklənmiş olmaq. Qaytabandan qızıl dəvə vergil bu oğlana *yüklət* olsun, hünərlidir (36).

YÜKLƏTMƏK f. Yükləmə işini gördürmək. Tez cəbbəxanəyi *yüklətsünlər* (126).

YÜKLÜ sif. Hamilə, boğaz. Ala gözlü görklü halalım *yüklü* qodum. Erkəkmidir, qızmıdır, anı bilsəm (97); Qaytabanın mayasını *yüklət* qodum (97).

YÜKSƏK sif. Uca, hündür. Qara tağım *yüksəgi* oğul (74); Qara tağım *yüksəgi* qartaş! (111); *Yüksək-yüksək* qara tağlarım (82).

YÜGRƏK zərf. Yüyrək, iti gedən, bərk qaçan, qaçağan. Qalın aqan *yügrək* sudan, bir oğul uçurdınsa, degil mana (73). Barı Bayındır xanın tövləsindən iki şahbaz *yügrək* at götürsün (55).

YÜGÜRDMƏK f. Yüyürməyə məcbur etmək. Yügrək atın *yügürdüb* Qanturalı Gürzin gögə atar, enüb yerə düşmədin qarvar tutar (87); Çaqmaqluca çobanları dünlə *yügürdən* (45).

YÜRƏK is. Ürək. Bağrımla *yürəgim* nə tağlarsan!? (106).

YÜRƏKLÜ sif.məc. □ Quş yürəkli. Ürəksiz, qorxaq. Oğlan quş *yürəkli* olur (71).

YÜRÜMƏK f. 1) Yerimək. Dərsə xan yayan, bunlar atlu yüridilər (40).

YÜRÜTMƏK f. 1) Yeritmək, getməyə məcbur etmək, sövq etmək. Kafər ögincə *yüritdinmi*? (72); 2) Adı doğrultmaq. Ata adın *yürütmiyən* xoyrad oğul (32).



YÜRÜŞ is. Yürüş, hücum. Qalın Oğuzun üstünə *yüriş* etdi (36); Aprul-apul *yürüşindən*, Aslan kibi turişindən (62).

## K

KAĞID is. Kağız. Burada məktub. Beyrəgə *kağıd* göndərdilər (124).

KAR is. fars. ◇ Kar qılmaq - tə'sir etmək, tə'sirini göstərmək. Oğuz Dəpəgözə *kar qılmadı*, ürkdi, qaçdı (99); *Kar eləmək* - tə'sir etmək, tə'sirini göstərmək. Tərs Uzılmışın sözi Əgrəgə *kar eylədi* (110).

KAFƏR sif.ər. Müsəlman olmayan, islam dininə e'tiqad etməyən. Burada isim: Qara tonlu azğun dinlü *kafərlərə* bir oğul aldınsa, degil mana (38).

KAHİL sif.ər. Tənbəl. Burada isim: Həm ölülərinizin yorğasın binərəm, *kahillərin* yedərəm (116).

KEYİK is. Dağ keçisi, cüyür. Getdikdə yerin otlaqların *keyik* bilür (32).

KEÇƏ is. Qalın yun parça. Qara *keçə* altına döşən, qara qoyun yəxnisindən öginə gətürün (34).

KEÇƏR is. Aygır adı (növü). Bir keçi başlu *Keçər aygırı*, bir tonlu başlu Turı aygırı (55).

KEÇİ is. Keçi. Ala başlu *keçincə* gəlməz bana (43).

KEÇİM is. Geyim-keçim. Geyimini-*keçimini* toğradı (96).

KEÇİT is. Yol. Qərə ölüm gəldigində *keçit* versün (41).

KEÇMƏK f. 1) İrəliləmək, yer dəyişmək: Aqan turı sulardan xəbər *keçə*, arqurı yatan Ala tağdan təbər aşa, xanlar xanı Bayındıra xəbər vara (37); Anlar dəxi bu dünyaya gəldi, *keçdi* (41); 2) Vaxtı keçirmək: Yeyəlim, içəlim, xoş *keçəlim* (42).

KEÇMİŞ f.sif. Ötən, keçən: *Keçmiş* mənim günümi də andırarsan? (47).

KEÇÜRMƏK f. Taxmaq, geydirmək: Üç öpüb bir dişləyüb, altun yüzigi barmağına *keçürmədinmi*? (48).

KEŞİŞ is. Xristianlarda müəyyən rütbə daşıyan ruhani: Beyrək Boz aygırına bindi. Qonur atlu Qazana "*keşiş*" deyən bəg Yegnəg turı aygırına bindi (42); *Keşişlər* bəklərdi (119).

KƏBİN is. ◇ Kəbin kəsmək, evlənməyi qanuni hala salmaq: Həq təala atamın, göglinə rəhmət eləsə, *kəbin* kəsüb məni ol yigidə verə (87).

KƏKLİK is. Çöl quşu: Qanturalı baqdı gördi bu qonduğı yerdə qu quşları, turnalar, turaclar, *kəkliklər* uçarlar (90).
KƏLBCÜGƏZ is. Ov iti: Oğlanın iki *kəlbcügəzi* vardı, qarğayı-quzğunı qoardı, qondarmazdı (39-40).
KƏLİD is.fars. Qıfıl: Əlli yedi qəl'ənin *kəlidin* alan...İlək qoca oğlı Alb Ərən çapar yetdi (50).
KƏLİSA is.əsl.yunan. Xristian ibadətgahı: Kafərin *kəlisasın* yıqdılar, yerinə məscid yapdılar (67).
KƏLİCƏ is. Düşüncə: Bəkil gördi, xatun kişinin əqli - *kəlicəsi* eyüdür (105).
KƏLMƏ is.ər. Söz. Ağ alnunda beş *kəlmə* dua qıldıq, qəbul olsun (51).
KƏMAL is.ər. Kamillik, yetkinlik: Qanturalı cəmal və *kəmal* yiyəsi yigit idi (87).
KƏNAR is.fars. Qıraq: Qara dəniz *kənarında* idi (94).
KƏNDÜ//KƏNDÖZİ əv. Öz: Oğul, sən qız diləməzsən, *kəndünə* bir hampa istərmişsən (55); *Kəndözin* yer yüzində gördi (60)
KƏNƏZ zərf. Uzaq: *Kənəz* yerlər çəmənlərin qulan bilür (32).
KƏPƏNƏK is. Yapıncı: Dəxi *kəpənəgindən* qurumsı edüb yarasına basdı (44).
KƏRBƏLA is. ər. İraqda müsəlmanların müqəddəs saydıqları yer: *Kərbəla* yazısında yəzidilər əlində şəhid oldi (32).
KƏRVAN//KARVAN) is. fars. Karvan: Dünlə *kərvan* keçdigin turğay bilür (32).
KƏRƏM is.ər. Mərhəmət: *Kərəmi* çoq qadir Tənıri, -dedi (83); ◇ *Kərəm eyləmək* - rəhm göstərmək: Mədəd, Dədə. *Kərəm eylə* (57).
KƏRPİC is. Gildən hazırlanmış tikinti materialı: *Kərpic* yasdıqlı, yonma ağac tənrili köpəgim kafər (119).
KƏRRƏ zərf.(ər.). Dəfə: Xanlar xanı xan Bayındır yildə bir *kərrə* toy edib Oğuz bəglərini qonaqlardı (34).
KƏRTLƏMƏK//KƏRTİLƏMƏK f.Kəsici alətlə deşik açmaq, oymaq: Yer kibi *kərtləyin*, topraq kibi savrılayın (59); Ayıtdı kim, yer kibi *kərtiləyin*, topraq kibi savrılayın (90).
KƏSDİRMƏMƏK f. Burada qorxmamaq, ehtiyat etməmək. Qazanı qılıcladı, zərrə qədər *kəsdirmədi*, ötə keçdi (126).



KƏSƏR GÜNÜ is. Döyüş günü: *Kəsər gündə* sərçəşmə yügrək yaxşı (96).
KƏSİM is. Hissə. *Kəsim* verəlim, derlər (99).
KƏSMƏK f. Kəsən alətlə ayırmaq: Buğanın başını *kəsdi* (36); Çalub-*kəsər* uz qılıcı müxənnətlər çalınca, çalmasa, yek (32); ◇ *Yol kəsmək* - qabağını almaq, qarət etmək: *Yol kəsdi*, adam aldı, böyük hərami oldı (99).
KƏTAN is.ər. Bitki növü: Qanturalı altunlu incə *kətan* bezin belinə sardı (87).
KƏFƏN is.ər. Meyiti sarımaq üçün ağ: Altun ağcan xərcləyür olsam, mənim *kəfənim* olsun (83).
Kİ//KİM bağ. Ozan, evin tayağı oldur *ki*, yazıdan-yabandan evə bir qonaq gəlsə, ər adam evdə olmasa ol anı yedirər, içirər (33); Bənim suçum nə oldı *kim*, qara otağa qondurdı? - dedi (34).
KİBİ (kimi) qoş.: Anın *kibinin*, xanım, bəbəkləri bitməsün, ocağına buncılayın övrət gəlməsün (33).
KİM əv. Oğul *kimdən* oldığın ana bilür (32).
KİMİ əv. *Kiminün* boynın urdı, *kimini* tutsaq elədi (41).
KİMSƏ əv. Bir gün ola, düşəm öləm, yerimdə-yurdımda *kimsə* qalmıya, - dedi (52).
KİMSƏNƏ əv. Axır zomanda xanlıq gerü - Qayıya dəgə, *kimsənə* əllərindən almıya (31).
KİR is. Çirk: Ağ tonuma *kir* əgləndi sənünçün (75).
KİRİŞ is. Ox-yayın ipi: Ayğır verüb alduğım, tozlu, qatı yayım, Buğa verüb alduğım boğma *kirişim* (63).
KİÇİ sif. Kiçik, balaca. Burada isim: Bazırganın ulusı tutıldı, *kiçisi* qaçaraq Oğuza gəldi (63).
KİŞ is. Yay düzəltmək üçün möhkəm ip: Yedi *kiş* ilə qurulurdı mənim yayım (95).
KİŞİ is. Adam: Oğuzın ol *kişi* təmam bilicisiydi, - nə diyərsə, olurdı (31).
KİŞLİ cif. İpli: Yağı yordı əlümdə qıl *kişlim*, ayğır malı (63).
KİŞNƏMƏK f. Kişnərti səsi çıxarmaq: Boz ayğır dəxi Beyrəgi görüb, tayandı, iki ayağının üzərinə turdı, *kişnədi* (60).
KİŞNƏŞDİRMƏK f. Kişnətmək: Qaraquc atları *kişnəşdirən*, qara başım qurban olsun, qurdım, sana, -dedi (45).

KOMA is. Ev, daxma. Gördi kim, oğrı köpək, yekə tana evini bir-birinə qatmış - tauq *komasına*, sığır tanına dönmüş (33).
KOR sif. Kor: Çıqsun bənim *kor* gözüm, a Dərsə xan, yaman səgrir (38).
KÖB is. Köp: Dəpəgən *köbini* süsəgən yırtar (113).
KÖS is. Zərb aləti: Borı çalındı, *kos* uruldı (126).
KÖZ is. Od yandıqdan sonra qalan qızmar kömür: Dövlətlü oğul qopsa, ocağının *közidir* (31).
KÖYGÜ//GÖYGİ is. Kürəkən. B a x: Güyəgü: Bayındır xanın *köygüsi*, Qalın Oğuzın dövləti...Salur Qazan yerindən turmışdı (42); Xan babamın *göygisi*, Qadın anamın sevgisi (38).
GÖYMƏK f. Ölçmək: Ol Qur'anı yazdı-düzdi, üləmalar ögrənincə *göydi*-biçdi (32).
KÖK is. Nəsl, soy: Kəndü əslim, kəndü *kökün* saçmağım yoq, -dedi (117); Aq qayanın erkəgində bir *köküm* var (118); *Kökünü kəsmək* - nəslini qırmaq. Varmazuz, *kökümüz* kəsər, həpümiz qırar, -dedilər (113).
KÖKS is. Sinə: *Köksi* gözəl qaya tağlara gün dəgəndə (34).
KÖLGƏ is. Kölgə: Dünlügi altun ban evlərimi gətürüb durursan, sana *kölgə* olsun (48).
KÖLGƏLİCƏ sif. Kölgəli: *Kölgəlicə* qaba ağacım kəsilübdür.
KÖMƏC is. Çörəyin bir növü: Qara saqac altında *köməcdən* nə var? (62)
KÖMLƏK//KÖNLƏK is. Köynək: Məgər Beyrək buna bir *kömlək* bağışlamış idi (58); Vardı, *könləgi* qana-quna baturdu (58).
KÖMÜLMƏK f. Basdırılmaq, quyulanmaq: Qılıc yerə düşdi, *kömüldi* (102).
KÖNDƏR is. Nizə: Dürtü şərkən ala *köndərin* ufanmasın (41), Altmış tutam *köndərini* nə ögərsən, mırdar kafər? (43).
KÖNÜL is. Qəlb, məc. ürək: Həq təala anın könlinə ilham edərdi (31); ◇ *Könül vermək* - sevmək, aşiq olmaq: *Könül verib* sevdigim, a Dərsə xan (38).
KÖPƏK is. İt. Köpək: Bin də quyrıqsız-qulaqsız *köpək* gətürün (56).



KÖPRİ is. Körpü: Bir quru çayın üzərinə bir *köpri* yandırmışdı (79).
KÖPÜK is. Maye üzərində qabarcıqlar: İki talusının üstinə buğanın *köpük* turdı (36).
KÖPÜKLƏNDİRMƏK f. məc.: bərk, sür'ətlə çapmaq: Dəlü Qarçar ağın *köpükləndirdi* (55).
KÖPÜKLƏNMƏK f. Köpüklənmək. Ağzı *köpükləndi* (88).
KÖPÜR-KÖPÜR z. Gumbur-gumbur: *Köpür-köpür* tavıllar, nəqaralar çalındı (120).
KÖRƏLMƏK f. Kövrəlmək. Dərsə xan istədi kim, oğlancuğın üstinə *körəlib* düşə (37).
KÖT is. Dal, arxa, oturacaq: Buğanın alnına bir yumruq eylə urdı ki, buğayı *köti* üzərinə çökürdi (88).
KÖHNƏ sif. Köhnə, xarab olmuş: Ağanızın başı yə gözi sədəqəsi, *köhnə* qaftanınuz var isə, geyəyin, dügünə varayın (62).
KÖÇ is. Köç. ◇ Köç eləmək. Bir yerdən başqa yerə getmək: Oğuzdan *köç elədi* (104)
KÖÇƏR is. Burada: köçmək həvəsi: Qaralu göglü otağı sorar olsan, Ağam Beyrəgindir. Ağam Beyrək gedəli *köçərim* yox (61).
KÖÇMƏK f. Bir yerdən başqa yerə yığışıb getmək, köçmək: Karvan kibi qopdı *köçdi* (41).
KÖÇÜRMƏK f. 1) Yaşayış yerini dəyişmək, bir yerdən başqa yerə daşımaq; Eli-güni *köçürün*, toquz tümən Gürcüstana gedəlim (105); 2) Ərə vermək: Nə görəyim, oğlı olan evərimiş, qızı olan *köçürmiş* (55).
KÖŞƏK is. Dəvə balası: Qızıl dəvələr olan yerdə, Bir *köşəgi* olmazmı olur? (47)
KÖŞK is. Alaçıq: Məgər qız meydanda bir *köşk* yapdırmış idi (87).
KÜBƏLİ//KÜPƏLİ is. Sırğalı: qulağı altun *kübəli*...Qazlıq qoca oğlı bəg Yegnək çapar yetdi (49); Qulağı altun-altun *küpəli*... Boz ayğırlu Beyrək çapar yetdi (77).
KÜVLƏK is. Bardaq: Əlin-yüzin yumadan toquz bozlamac ilən bir *küvlək* yağurd gəvəzlər (33).
KÜKRƏMƏK f. Özündən çıxmaq, coşmaq: Dəvə kibi *kükrədi* (76).

KÜL is. Kül: *Kül* təpəcik olmaz (31); ◇ *Kül eyləmək* - külə döndərmək: Acığı tutanda qara daşı *kül eyləyən*...Qazan qartaşı Qaragünə çapar yetdi (77).
KÜLAH is. fars. Papaq: Altı ögən dərisindən *külah* etsə, qulağlarını örtməyən... At ağızlu Uruz qoca çapar yetdi (49-50).
KÜLÜK sif. İti, cəld. At ayağı *külük*, ozan dili çevik olur.(36).
KÜLÜNG is. Daşçapma işində istifadə olunan alət: Bir oğul uçurdınsa, degil mana, *külünglə* yıqdırayım (75).
KÜR sif. Qışqırıqçı, hay-küyçü: Bəglər, Tanrı bizə bir *kür* oğul vermiş (72).
KÜRƏŞ is. Küləş idman növü: *Kürəşdə* mən səni basmadınmı? (65); ◇ *Kürəş tutmaq* - güləşmək. İmdi gəl, səninlə *kürəş* tutalım, - dedi (55).
KÜRK is. Dəridən tikilən isti qış geyimi: Altmış ərgəc dərisindən *kürk* eləsə, topuqlarını örtmiyən...At ağızlu. Uruz qoca çapar yetdi (50).
KÜRSİ is. Masa, kürsü: Ərş tanığ olsun, *kürsi* tanığ olsun (83).
KÜRÜM is. Nəsl: Qaytabanlar qarısa, *kürüm* verməz (76).
KÜSMƏK f. İncimək, küsmək: Xana *küsdi*, Divandan çıqdı (105).
KÜT-KÜT zərf. Yavaş-yavaş: *Küt-küt* buğa solmağa başladı (88).
KÜFR sif. Günah: *Küfr* söz söylədim - həq təalaya xoş gəlmədi (81).
KÜÇİCİK sif. Kiçicik: Qazanı *küçicik* ölüm tutdı, uyıdı (116).

# G

GAH bağ. Gördi kim, bir dərənin içində toz *gah* dərilür, *gah* tavılur (91).
GEDİRMƏK//GEYDİRMƏK f. Taxmaq, yerləşdirmək. Burada vurmaq: Oğlan buğanın alnından yumruğın *gedirdi* (36); Qanturalının atını için tutdı, *geydirdi* (90).
GEYƏSİ is. Geyim, paltar: Gəldi *geyəsini* geydi (57).
GEYİM is. Paltar, libas: Mərə, *geyimim* gətürüm, oğlum geysin (107).



GEYİM-GEÇİM is. Paltar: *Geymini-keçimini* toqradı (96).
GEYİNMƏK f. Paltarını geyinmək: Kəndü dəxi için tutdı, *geyindi* (90).
GEYİRMƏK f. Geyindirmək. Beyrəgə dayələr qaftan *geyürib* tonatdılar (65).
GEYİN is. Əyin-baş, paltar: Nə dedigimi yetirün *geyünimlən* mənim şahbaz atımı gətürün (53).
GEYMƏK//GİYMƏK f. Geyinmək: Çigin quşlı cübbə ton vergil bu oğlana, *geyər olsun*, hünərlidir (36); Ağ çıqarıb qara *giyən* qızlar (62); ◇ *Qara geymək*: yas saxlamaq: Banıçiçək *qaralar geydi*, ağ qaftanını çıqardı (58).
GEN I sif. Enli, geniş: Güni gəldi, qaba qarın *gen* göksdə oynadam sənin içün (70); Mərə Əzrayil, mən səni *gen* yerdə istərdim. tar yerdə eyü əlimə girdin (80).
GEN II zərf. Uzaq: Sıçradı, *gen* yerdə turdı (101).
GENƏ zərf. Yenə, bir daha: *Genə* toy edib atdan-ayğırdan, dəvədən buğra, qoyundan qoç qırdırmışdı (34).
GERÜ zərf. Arxa, geri: Axır zamanda xanlıq *gerü* - Qayıya dəgən, kimsənə əllərindən alınmıya (31).
GERÇƏK sif. Doğru, həqiqət: Yalan söz bu dünyada olınca, olmasa, yeg, *Gerçəklərin* üç otuz on yaşını toldırsa, yeg (32).
GETMƏK f. Yerimək, hərəkət etmək: *Getdikdə* yerin otlaqların keyik bilür (32); ◇ *Əqli getmək* - bayılmaq: Çoban böylə dikəc Qazan alı etdi, *əqli* başından *getdi* (45).
GECƏ zərf. Gecə: Məgər, xanım, ol *gecə* Qalın Oğuzın dövləti, Bayındır xanın göygüsi, Ulaş oğlı Salur Qazan qara qayğılu vaqeə gördi (44).
GECƏ-GÜNDÜZ zərf. Bazırganlar dəxi *gecə-gündüz* yola girdilər (52).
GECƏLİK sif. Çadır, gecə sığınacağı, daldanacaq: Başımızdan *gecəligümiz* alduğı yoq (62).
GƏVƏZLƏMƏK f. Ağzından tökülə-tökülə yemək, içmək: Əlin-yüzin yumadan toquz baznamac ilən bir küvlək yoğurd *kəvəzlər* (33).
GƏZ I zərf. Dəfə: Sudan keçdi, bir *gəz* bir qurda tuş oldı (45).
GƏZ II is. Bez, parça: Həman biləgindən *gəz* çıqarub atının tərkilərini tartdı (105).

GƏZMƏK f. Dolaşmaq, gəzmək: Qolça qopız götürüb eldən-elə, bəgdən-bəgə ozan *gəzər* (?).
GƏLİ-GƏLİ f.bağ. Gələ-gələ: *Gəli-gəli* yurdının üzərinə gəldi (44).
GƏLİB-GETMƏK mür.f. Dəfələrlə keçmək, var-gəl etmək: Oğlan keyiki qovarkən babasının ögindən *gəlüb-gedərdi* (37).
GƏLİMLİ-GEDİMLİ sif. Ölüm-itimli: *Gəlimli-gedimli* dünya, Axirət-son ucı ölümli dünya (78).
GƏLİN is. Gəlin: Gördü *gəlin* at üzərində geyinmiş, sügüsi əlində (91).
GƏLİNCİK is. Gəlin, əzizləmə mə'nasında: Yolına qurban olayın, *gəlincigüm* (66).
GƏLİŞ is. Gəlmək işi, gəlmə: Yigit, *gəlişin* qandan? (54).
GƏLMƏK I f. Kəndüyi dəlüligə bıraqdı, sürdi dügünə *gəldi* (63).
GƏLMƏK II f. Münasib olmaq, uyğun olmaq: Ala başlu keçimcə *gəlməz* man,a. Ala qollı sapanımca *gəlməz* man,a (43).
GƏMİ is. Gəmi: Ağac *gəmiləri* oynadan su (44).
GƏNƏŞMƏK f. Məsləhət üçün müraciət etmək: Qövmlü qövmilə *gənəşdimi*? (105).
GƏNC is. Cavan, yeniyetmə: Toqsan tümən *gənc*, oğuz söhbətinə dərilmişdi (68).
GƏNCƏ is. Şəhər adı: Bərdəyə, *Gəncəyə* varub vətən tutdı (104).
GƏRDƏK is. Toyda gəlin üçün ayrılmış xüsusi yer: Oxı yerdə düşsə, anda *gərdək* dikərdi (57).
GƏRDUN is.fars. Dövran, zəmanə: Qara *gərdunda* bulduğum oğul, qanı? (38)
GƏRƏK I bağ. Ya-ya: Mənim əlümi şenin, qolça qopıçım əlümə verin, ol yigidi döndərəyim. *Gərək* bəni öldürün, *gərək* dirgörün, qoyu verin, - dedi (40).
GƏRƏK II Lazımlı, ehtiyacı duyulan: Bizim evdə *gərək* idin, ağac (48); Disə, bişmiş ətməgün bəqası olmaz, yemək *gərəkdir* (33).
GƏRƏKLÜ sif. Lazımlı. Qara başına düşəndə *gərəklüdür*, - dedi (70).



GƏRİNMƏK f. Gəməşmək: Gedərkən ərəbə çığırdısından Qazan oyandı, *gərindi*, bu əlindəki orğanları həb qırdı (116).
GƏTÜRMƏK f. Gətirmək: Qızlar vardılar, yemək *gətürdilər* (62); Mən qırıma varmadın ol mana baş *gətürmək* gərək (55).
GİDƏ-YÜRİMƏK f. Ömür sürmək: Axır zəman olıb qiyamət qopınca bu didügi Osman nəslidir. İşdə sürilib *gidə-yürir* (31).
GİZLƏMƏK f. Gizlətmək: Anları dəxi əcəl altı, yer *gizlədi* (41).
GİZLÜ zərf. Gizli: *Gizlü* yaqa tutuban yiləşdilər (93).
GİRMƏK f. Daxil olmaq, girmək: Qırq incə bellü qızun içinə *girdi*, ögüt verdi (46).
GOR is. fars. Qəbir, məzar: Baybican qızı Banıçiçək evdəmi, arğış, yoxsa, *gordamı*, arğış (59).
GÖDƏK sif. Qısa, gödək: Qara polad uz qılıcı *gödək* oğlan (107).
GÖDƏLMƏK f. Qısalmaq, gödəlmək: Avazım *gödəlmədin*, ünim boğulmadın bir atdır (60).
GÖDƏN is. Burada bədən: Ol *gödəndə* canın varsa, oğul, xəbər mana (39).
GÖZ is. Göz: Oğul atanın yetiridir, iki *gözinin* biridir (31); ◇ *Göz qalmaq* - gözü qalmaq: *Göz qaluban* könül alan anun görklisi olur (86); *Göz qaçmaq* - oğrun baxmaq: *Göz qaçuban* könül alan görklüsinin boynın öpəm (86); *Göz gəzdirmək* - diqqətlə ətrafa baxmaq: Sağlən solına *göz gəzdirdi*, oğlancuğını görmədi (38); *Gözə turmaq* - gözü tutulmaq: Mən Qazanın ne'mətini çoq yemişəm, Bilməzsəm, *gözümə tursun* (124); *Gözü qararmaq* - gözü qaralmaq: Qarnın acıqmamışkən, *gözün qararmamış* ikən bu ağacı qoparı gör (46); *Gözü tutmaq* - xoşuna gəlmək, ürəyicə olmaq: *Gözün* kimi *tutarsa*, könlün kimi sevərsə, ana varğıl (112).
GÖZƏL I is. Gözəl adam: Nə yerdə *gözəl* qopdısa, çəküb aldı (37).
GÖZƏL II sif. Göyçək, yaraşıqlı: Köksi *gözəl* qaya tağlara gün dəgəndə (34).
GÖZƏTMƏK I f. Gözləmək: Hər biri bir qırım *gözətdi* (126).

GÖZƏTMƏK II f. Göstərmək: Ol gün namərdlər, müxənnətlər bana yer *gözətdi* (71).

GÖZƏTMƏK III f. Tuşlamaq: Aslanın alnın *gözədüb* bir yumruq eylə urdı kim, yumruq çənəsinə toqundı, ovatdı (89).

GÖZLƏMƏK f. Diqqətlə baxmaq, keşik çəkmək: Sügüsin əlinə aldı, bir yüksək yerə çıxdı, *gözlədi* (90).

GÖZÜNMƏK f. Görünmək, gözə çarpmaq: Əllərin yeni-nə çəkdi, *gözükməsün* deyü oyuna girdi (65).

GÖZÇİ is. Keşikçi, gözətçi: *Gözçi* gözlədi. Gördi kim, at Bəkilin Bəkil üzərində degil, əmma bir quş dəklü oğlandır (107).

GÖZCÜGƏZ//GÖZCİGƏZ is. Əzizləmə mə'nasında. Göz: *Gözcügəzi* çöngə qoca (80); Eki şəbçırağa bənzər sənin *gözcigəzin* (60).

GÖYNƏMƏK f. Sızıldamaq, ağrımaq. Sərimsaq otın yemədin, Qazan, içüm *göynər* (72); Yandı bağrım, *göynədi* içim (61).

GÖG I sif. Rəng-göy (burada yaşıl): Gördi *gög* çayırın yanında bir qırmızı otağ dikilmiş (54); ◇ *Gög geyinmək* - yasa batmaq: Anam sənin üçün *gög geyib*, qara sarınsun (75); *Gög sarınmaq* - yasa batmaq: Qırq əlli yigit qara geyüb *gög sarındılar* (125).

GÖG II is. Səma, qübbə. Yazılıb-düzilib *gögdən* endi Tənqri elmi Qur'an görkli (32); □ *Gög alan* - səmaya çatan, hündür: Qazan *gög alan* çəmənə çadır dikdirdi (126); *Gög yüzi* - səma, qübbə: Ara iyvanı *gög yüzinə* aşanmışdı (34).

GÖGƏRÇİN is. Quş adı: Əzrayıl bir *gögərçin* oldı, pəncərədən uçdı-getdi (80).

GÖGLÜ sif. Gömgöy: Qaralu-*göglü* otağı sorar olsam, kölgə kimün? (61).

GÖGCƏ sif. Yamyaşıl çəmən: Yapağlu *gögcə* çəmən güzə qalmaz (31).

GÖGÇƏK sif. Göyçək, gözəl: Qızın *gögçəgini*, xanlar xanı Bayındıra rəncyek çıqardılar (67).

GÖGCƏ is. Göl adı: Kafər sərhəddinə Cızıqlara Ağlağana, *Gögcə* tava aluban çıqayın (69).

GÖL is. Göl, su hövzəsi: Dəpə kibi ət yığ, *göl* kibi qımız sağdır (35).



GÖN is. Heyvanın işlənmiş dərisi, gön: Sarı *gönlər* görübən, taylar basan (88).

GÖNDƏRMƏK f. Yollamaq. Ozan, evin tayağı oldır ki, yazıdan-yabandan evə bir qonaq gəlsə, ər adam evdə olmasa, ol anı yedirər, içirər, ağırlar, əzizlər, *göndərər* (33).

GÖRƏ qoş. Səbəb bildirir: Necə məsləhət görərlərsə, ana *görə* iş edəlim (55).

GÖRƏR f. sif. Görən: *Görər* gözüm aydını, oğul (66).

GÖRKLİ sif. Burada qiymətli: Yazılıb-düzilib gögdən endi Tənri elmi Qur'an *görkli* (32); Ol Məkkəyə sağ varsa, əsən gəlsə, sidqi bitün Hacı *görkli* (32).

GÖRMƏK f. 1) Gözləri ilə qavramaq: *Gördü* kim, oğrı, yekə tana evini bir-birinə qatmış (33); 2) Hazırlamaq: Yol yarağın *gördilər* (53); 3) Nümunə götürmək, mənimsəmək: Qız anadan *görməyincə* ögit almaz (31).

GÖRÜŞMƏK f. Salamlaşmaq: Quca-quca ata ilə oğul *görüşdi* (78).

GÖSTƏK is. Ümid: Dədə Qorqud *göstəgi* üzdi (56).

GÖSTƏRMƏK f. Görsətmək: Əzrayili mənim gözümə *göstərgil* (79).

GÖTİN-GÖTİN zərf. Dala, arxaya, geriyə: Buğa *götin-götin* getdi (36).

GÖTÜRMƏK f. Əlinə almaq: Qolça qopız *götürib* eldənelə, bəgdən-bəgə ozan gəzər (32); Qara qoyun yəxnisindən ögünə *götürdilər* (34).

GU-GU Səs təqlidi: *Gu-gu etmək* - səs təqlidi: İt kibi *gu-gu* edən çərkəz xırslı (119).

GUMBIR-GUMBIR Səs təqlidi: *Gumbır-gumbır* nəqarələr dögüldi (50).

GURLAMAQ f. Gurultu salmaq, nə'rə çəkmək. Kafərin üzərinə *gurlıyalım* (76).

GÜVƏNMƏK f. Bel bağlamaq, özünə arxa bilmək: Baban dedi keyikləri qovsun gətürsün, bənim ögimdə dəpələsün, oğlumın at səgirdişi, qılıc çalışın, ox atışın görəyim, sevinəyim, qıvanayım - *güvənəyim* - dedi, - dedilər (37).

GÜVƏNSƏMƏK f. Güvənmək, arxalanmaq: Mənim dəxi oğlım olsa...mən dəxi baqsam, sevinsəm, *güvənsəyim*, - dedi (52).

GÜVƏNC is. Ərk, arxa: *Güvəncimlə* gətürdigin gəlincügin o zalım səndən ayırdı ola, qardaş (100).

GÜDƏLMƏK I f. Kütləşmək: Qazan, oğlan avda idügin andan bilәyin kim, yorğun atunla, *güdəlmiş* cidanla ardına düşəsən,- dedi (74).

GÜDƏLMƏK II f. Gödəlmək, qısalmaq: Çalışanda qara polat uz qılıcın *güdəlməsün* (41).

GÜDMƏK f. Gözdən qoymamaq, pusmaq: Gördi kim, ilqıçı kafərlər yund *güdərlər* (113).

GÜZ is. Payız: Yana-yana qarlar yağsa, yaza qalmaz, Yaprağlu göğçə çəmən *güzə* qalmaz (31).

GÜZİN is. Payızlıq: Bir yazın, bir *güzin* buğayla buğrayı savaşdırarlardı (36).

GÜYƏGÜ is. Kürəkən. B a x: Göygü: Kül təpəcik olmaz. *Güyəgü* oğul olmaz (31).

GÜLMƏK f. Gülmək, sevinmək: Köpəkləri göricək qasqas *güldi* (57).

GÜLÜŞMƏK f.qar.növ. Birlikdə gülmək: Oğuz bəgləri bunı göricək əl-ələ çaldılar, *gülüşdülər* (63).

GÜMAN is.fars. Zənn, ehtimal: Tənrinin birliginə yoxdur *güman* (40).

GÜMÜŞ is. Qiymətli, nəcib metal: *Gümüş* kibi ağ biləgin açdı (65).

GÜN I is. Günəş: Köksi gözəl qaya tağlara *gün* dəgəndə (34).

GÜN II is. 24 saatlıq müddət: Savaş günində ayna görkli, *ayna güni* oqıyanda qutbə görkli (32); Günlərdə bir gün. Günlərin birində, bir dəfə: *Günlərdə bir gün* Düzmürd qəl'əsinə gəldi (94).

GÜN III is. Yurd: Alca qanın yer yüzinə dökün. Elin-*günün* çapın (106).

GÜNAH is.fars. Suç, təqsir: Qazlı tağının suyının *günahı* yoqdur (39).

GÜNBƏND is.fars. Binanın yarımdairəvi damı, günbəz: Dəpəgöz aydır: "Oğlan, şol *günbəndi* gördünmi?" (101).

GÜNLİ zərf. Gündüzlü: Üç gün dünli-*günli* yortdı. Dərəşam ucından keçdi, ol qardaşı tutılan qorıya gəldi (113).



GÜNLİG//GÜNLÜG is. Çadır, alaçıq: Şami *günligini* yer yüzinə dikdirmişdi (34); Altunlıca *günlügin* dikib, Qanturalı gərdəginə girüb, muradına, məqsudına irindi (93).

GÜNORTAC is. Yer adı: Qalarda-qoparda, yigit, yerin nə yerdir?...Qalarda-qoparda yerim *Günortac* (102).

GÜRBİZ sif. Müdrik: Oğuz zəmanında Qanlı qoca derlərdi, bir *gürbiz* ər vardı (85).

GÜRƏŞMƏK f. B a x: Küröşmək: Məni keçərsən, anı dəxi keçərsən və həm səninlə *güreşəlim* (55).

GÜRZ is. Ağır çəkili silah növü: Bir dəxi altı pərli *gürz* aldılar (52).

GÜRCÜSTAN is. Ölkə adı. Ağam Qazan, sası dinlü *Gürcüstan* ağzında oturarsan, ordun üstinə kimi qorsan? (42).

GÜC is. Qüvvə: Altun-aqça *gücinə* salubanı səni qurtaraydım, oğul (82).

GÜCLƏ zərf. Çətinliklə: Dilək ilə bir oğul *güclə* buldum (38).

GÜCLİ sif. Qüvvətli: Məndən dəli, məndən *gücli* ər varmıdır? (70)

## L

LAİLAHƏ ər. Qur'andakı "la-ilahə-illəllah" ifadəsinin qısaldılmış forması: allahdan başqa allah yoxdur. Basatın dilinə bu gəldi kim, "*Lailahə* illallah, Məhəmməd rəsulallah", - dedi.

LAYİQ sif. ər. Uyğun, oxşar, layiq. Banıçiçək baxdı gördü ki, bu bir sultana *layiq*, kök sığın keyikdir (152).

LAKİN bağ. fars. *Lakin* mənə həm də iki adam verin, yeməyimi bişirsin, mən yeyim (197).

LAP əd. Bəyləri aşağı başda qoyub, Qazanın *lap* önündə oturardu.

LƏLƏK is. Lələk (quş ləlәyi): Üç *lələkli* qayın oxlar atıldı, dəmir uğluğu düşdü.

LƏ'NƏT ər.fars. Lə'nət etmək. Qarğımaq, lə'nətləmək. Şeytana *lə'nət* etdi (194).

LEŞ is. Ölmüş cəsəd. Dərələrdə, təpələrdə kafərə qırğun girdi, *leşinə* quzğun üyüşdi.

LƏŞKƏR is.fars. Qoşun, ordu. Kafər *ləşkəri* Qazanın üzərinə yığıldı (120); *Ləşkər* dərildi, gəldi (119); *Ləşkər* ver, məni

babam putsaq olduğu qəl'əyə göndər, - dedi (95); Qazan gördi kim, *ləşkər* ogincə bir ağ-boz atlu, ağ ələmlü bəg dəmür toplu Oğuzun ogincə gəldi (120).

LOVĞALANMAQ f. Lovğalanmaq, özünü tə'rifləmək. *Lovğalanmaq* arvad üçün nöqsandır (190).

LOPA-LOPA is. Parça-parça (qar.) *Lopa-lopa qarlar* yağsa, yaza qalmaz (129).

# M

MAVILMAQ f. Zəif düşmək, haldan düşmək. Taraqlığı boşaldı, gedisi *mavıldı* (87).

MAĞARA is. ər. ("məqarə"dən). Dağ və qayanın içinə doğru uzanan yaxud yeraltında olan oyuq. Dəpəgöz bildi kim, Basat *mağaradadır*; *Mağaranın* qapusın alub, bir ayağın qapunın bir yanına, birin dəxi bir yanına qodı (101); Şol *mağarayı* gördünmü?.. Basat *mağara* qapusuna vardı (102).

MAYA is. fars. Dişi dəvə. Qaytabanın *mayasını* yüklü qodım, Nərmidir, *mayamıdır*, anı bilsəm (97).

MAL is. Var - dövlət, sərvət. *Malımızı*, rizqimizi yağmaladılar, gerü döndülər (53); Ər *malına* qıymayınca adı çıxmaz; Baba *malından* nə faidə, başda dövlət olmasa... (31); Əgər sənin oğlın olmasaydı, bizim *malımız* Gürcüstanda getmişdi (54).

MAL - RİZQ is. ər. Xərc - xərac; pul xərcləmək, xərc çəkmək; ◇ *Mal - rizq vermək*. Xərcləmək, xərc çəkmək. Qanlı qoca aydır-oğul, qız görmək səndən, *mal - rizq* vermək bəndən! (85).

MAMAQ ant. Şəxs adı. Dəmür Tonlı *Mamaq* əlində həlak oldu (99).

MANA əvəz. Qədim və orta əsr yazılı mənbələrində mən şəxs əvəzliyinin yönlük hal forması. Aruz oğlı xanım Basat, *man,a* Mədəd! - dedi: Yalnız oğul xəbərin, a Dirsə xan, degil *man,a*! Qarşu yatan ala tağdan bir oğul uçırdınsa, degil *man,a*! Qamın aqan yükrək sudan bir oğul aqıtdınsa, degil *man,a*! (100, 38).

MANCILAQ is. Dəzgah, qurğu. *Mancılağı* ağır taşdan ğızıldayub qatı enən; Ağır *mancılaq* taşla atam, - derdim (90, 109).



MAHMIZ//MAHMUZ is.ər. (mahmuzdan). Çəkmənin dabanına vurulmuş şişdişli kiçicik dəmir çarx (minik heyvanını vurmaq üçün). Qonur atın *mahmuzladı*, Qazan bəg yola getdi; *Mahmuz urmaq*. Mahmuzlamaq. Atına *mahmuz* urdı (91);

MEYDAN is. fars. Açıq və geniş, düz sahə: Bir qiyamət savaş oldı, *meydan* tolu baş oldı; Ağ *meydanın* ortasında baxdı, turdı; Oğlan bu qatla buğanın alnına yumruğını tayadı, sürdü *meydanın* başına çıqardı; Bayındır xanın ağ *meydanında* bu oğlan cəng etmişdi; Qanturalıyı alub *meydana* gətürdilər (87); Oğuz bəgləri at çapanda *meydan* qalmış (77, 36, 44); ◇ *Meydana girmək*. Döyüşə hazır olmaq. *Meydana girdi*, ər dilədi (94); El ürkmədin oğlum *meydana varsun*, girsün (107).

MEYXANƏ is. fars. Şərab içilən yer. *Meyxanədə* beş gün yemə - içmə oldı. (110).

MEŞƏ is. Meşə, çoxlu və müxtəlif ağaclar bitmiş geniş sahə. Toz yarıldı, gün kibi işıladı, dəniz kibi yayqandı, *meşə* kibi qarardı (69).

MƏQSUD is. ər. İstənilən, arzu edilən şey; niyyət, qəsd. Mərə, dəlü ozan, ya *məqsudun* nədir? Aydır:- Xanım, *məqsudım* oldur ki, ərə varan qız qalqa oynaya, mən qopuz çalam, - dedi (64; 73); Qazan aydır: - *Məqsudun*, bumıdır, Bayböri bəg? (52).

MƏĞMUN sif. ər. (məğbun). Aldanmış, zərər çəkmiş, uduzmuş, gözlədiyi şeydən əli çıxmış, məhrum olmuş. Hey, şu dəlü *məğmun* mənə də şayəd ancılayın olmaz sözlər, - dedi (64).

MƏDƏD is. ər. Kömək, yardım, imdad; ◇ *Mədəd irmək* I) Kömək olmaq. Ol ögdügim yuca Tanrı dost oluban *mədəd irsün*, xanım hey (33); 2) Nida. Həmən bəni qapudan tişarı eylə, *mədəd*! - dedi (57).

MƏDİNƏ is. top. Məkkə ilə *Mədinənin* qapusı ağac! (47).

MƏKKƏ is. top. Səudiyyə Ərəbistanında şəhər, müsəlmanların ziyarətgahı. Alçaq yerdə yapılubdır Tanrı evi *Məkkə* görklü. Ol *Məkkəyə* sağ varsa, əsən gəlsə, sidqi bitün Hacı görklü (32).

MƏGƏR əd. fars. 1) Səbəb bildirən "çünki" mə'nasında: *Məgər* xanım, Trabuzan təkuri bəglərbəgi olan xan Qazana bir şahin göndərmişdi (116); *Məgər* göyginin yüzigine nişan atarlardı (63); 2) "ancaq", "fəqət" köməkçi sözləri mə'nasında. *Mə-*

*gər* sultanım, genə yazın buğayı saraydan çıxardılar (36); *Məgər* Dirsə xan derlərdi, bir bəgün, oğlı-qızı yoxdu (34).

MƏLƏK antr. Dini təsəvvürlərə görə Allahın ən yaxın xidmətçiləri olan fövqəltəbii bir məxluq. Burada şəxs adı. Qonşularına çağırar ki, Yetər, Zəlikə! Zübeydə! Üruydə can, qız can! Paşa! *Ayna Mələk*! *Qutlu Mələk*! Ölməkə-yitməkə getməmişdim, yatacaq yerim genə bu xərab alasıydı (33).

MƏLİK antr. ər. Padşah, hökmdar; burada şəxs adı. Vardı kafərlər arğunı *Şəkli Məlikə* xəbər verdi (42).

MƏL'UN sif.ər. Lə'nətə gəlmiş. Ol *məl'un* dəxi qəl'ədən tışa gəlüb, bunlara müqabil oldı, ər dilədi (96).

MƏLHƏM is. ər. Yaraya və ya ağrıyan yerə sürtülən yağlı dərman. Tağ çiçəgi anan südi ilə sənin yarana *məlhəmdir*, - dedi, ğaib oldi (39).

MƏN əvəz. 1-ci şəxsin təkini göstərən əvəzlik. Sən aradan çıqğıl, *mən* Allah təala bilə xəbərləşim, - dedi (81, 89); Qazan aydır: - Üç yüz yigidlən oğlum Uruz *mənim* evim üstünə tursun; *Mənim* üçün gəldünsə, oğlancuğum öldürmüşəm (42, 41).

MƏNLİK is. Öz ləyaqətini dərketmə, öz şəxsiyyətinin qiymətini bilmə. Burada "təkəbbürlük" mə'nasında. Mənim ulu dərgahımda gəzə, *mənlik* eyləyə? - dedi (79).

MƏNıRİ is. (əsli yunanca "mənganə" sıxıb saxlama"dan) sıxıb saxlamaq. Quzucığım aldırmışam, *mənıriyəyinmi*?

MƏNıRİŞMƏK f. Qoruyub saxlamaq. Ağca qoyunlarım *mənırişmədin*, Ağca yüzlü qızım-gəlünim əkşəşmədin...(125).

MƏRƏ (X. K. Baranov: mərrə// mərə: "ötən", "keçən") f. sif. ə. "müraciət" mə'nasında "ötən", "keçən"; "ay ötən". *Mərə*, qavat oğlu qavat! Mən aşağı qulpa yapuşuram, sən yuqarı qulpa yapuşursan; Başındağı tulğulğanı nə öyərsən, *mərə* kafər? Qazan aydır: - *Mərə* çoban, bu ağac nə ağacdır? - dedi (92, 43, 46), *Mərə*, sabah şahinləri al, xəlvətcə ava binəlim! - dedi (116).

MƏRMƏR is. (lat: mramor) müxtəlif rəngli kristallik dağ süxuru, möhkəm daş. Buğa dizin çökdi, buynuzı ilə bir *mərmər* taşı yoğurdı, penir kibi ditdi (87).

MƏSLƏHƏT is. ər. Yaxşılıq və xeyir üçün göstərilən yol, tədbir. Qazan aydır: - *Məsləhətdi* (120); ◇ *Məsləhət görmək* - vacib bilmək. *Məsləhət gördülər* ki, Dədə Qorqut varsun; Necə *məsləhət görərlərsə*, ana görə iş edəlim, - dedi (54, 55).



MƏSCİD is. ər. Müsəlmanların ibadətgahı. Kəlisasın yıqub, yerinə *məscid* yapdım, ban banlatdım (118).

MƏHBUB sif. ər. Sevgili, sevilmiş. Məgər Trabuzan təkurunun bir əzim görklü *məhbub* qızı vardı (84).

MƏHƏL is. ər. Zaman, vaxt. Bu *məhəldə* ərənlərin meydanı arslanı, pəhləvanların qaplanı Boz oğlan yetdi (53); Bu *məhəldə*, sultanım, Salur Qazanla Qaraca çoban çapar yetdi (48).

MƏHƏMMƏD is. ər. Bəyənilmiş, mədh edilmiş, müsəlmanların Allah tərəfindən tə'yin edilmiş peyğəmbəri, Allahın rəsulu. *Məhəmmədin* sağ yanında namaz qılan Əbubəkr siddiq görklü! Adı görklü *Məhəmmədə* salavat götürdilər (50); Tanrı dostı, din sərvəri *Məhəmməd* görklü! (32); ◇ *Məhəmməd Mustafaya* bağışlamaq. Peyğəmbərin xatirinə günahından keçmək, bağışlamaq. Günahınızı *Məhəmməd Mustafaya* bağışlasun! Xanım, hey! (126); Məhəmmədi yad gətürmək. *Məhəmmədi* yada salmaq, xatırlamaq. Adı görklü *Məhəmmədi yad gətürdilər* (66).

MƏŞĞUL is. ər. Bir iş görən; ◇ *Məşğul olmaq*. Başı qarışmaq. Düşdülər işrətə *məşğul oldular* (90).

MƏŞRƏBƏ is. ər. Su qabı, parç, kasa.... ◇ *Məşrəbə almaq* - Su qabı almaq, götürmək. *Məşrəbə almış*, suya varmış.- Biləgindən on parmağını souq almış (65).

MİNARƏ is. ər. Azan vermək üçün məscidlərin yanında və ya üstündə ucalan qüllə. *Minarədə* banlayanda fəqih görklü (33).

MİZ B a x: Biz.

MİNMƏK f. At və ya başqa minik vasitəsinə qalxmaq. Haman qız sıçradı, ata *mindi*, Beyrəgin atasına-anasına muştuluğa çapar getdi (65).

MÖ'MİN sif. ər. İnandığı dinin (əsasən islam dini) ehkamlarına ciddi surətdə əməl edən adam. Sən xud *mö'minlər* könlündəsən (81).

MÖHKƏM sif. ər. Böyük, ağır. Ol yigit üzərinə *möhkəm* qara şivən oldı (79).

MÖHTAC sif. ər. Bir şeyə ehtiyacı olan. Qadir səni namərdə *möhtac* etməsün! (93).

MÖHÜB is. ər. Arzu-istək. Mənim *möhüblərim* çoxdur (90).

MİNNƏT is. ər. Borcluluq hissi, özünü borclu bilmə; yalvarma. Bunda *minnətlə* almaqdan isə, anda babam yanında *minnətsiz* almaq yegdir! - dedi (53).

MİSKİN sif. ər. Yazıq. Bir gün Ulaş oğlı tülü quşun yavrısı, bizə *miskin* umudı, Amit soyının aslanı, Qaracuğın qaplanı... yerindən turmışdı (42); □ *Miskin yigit* - Yazıq igid, kimsəsiz. Qardaşsız *miskin yigit* ənısəsinə yumruq toqunsa, Aqlayuban dört yanınıa baqar olur (112).

MIRDAR (murdar) sif. fars. İyrənc, təmiz sayılmayan, pak olmayan. Altmış tutam köndərini nə öyərsən, *mırdar* kafər? (43).

MIRLAMAQ s. təq. f. Buğanın səsi. Baya (ğ) *mırlardı*, şimdi xırlamağa başladı (20).

MÜDBƏQ is. ər. Mətbəx, xörək bişirmək üçün hər cür imkanı olan yer. Ağayılda ağca qoyunım gərəksə, Qara *mudbaq* altında anun şüləni olsun! (81).

MUNıA əvəz. "Bu" işarə əvəzliyinin yönlük halında işlənmiş forması. Basat aydır: - Mən *munıa* bitəgəllük yapışmayım, - deyüb kəndü qılıcın çıxardı, tutdı (102); Aruz aydır: - Xanım, *munı* mana verin, oğlum Basatla yaşlıyayın! - dedi (99).

MUNİS sif. ər. Yaxın adam, mehriban dost. Qadir allah bilür, mən sana *munisəm*, yaram, qıyma mana! - dedi (92).

MURAD is. ər. Arzu, məqsəd, istək, niyyət, kam. Sən onlarun, yanına varğıl, *Muradını* anlar verər, bəllü bilgil! (64); Qazan bəg aydır: - Gəl *muradınıa* yetiş! (66); ◇ *Muradına yetürmək*. Arzu, istəyinə çatmaq. Əri *muradına yetürər* sənin, gəzcigəzin (60); *Muradınıa-məqsudınıa irməmək*. Arzu-kamına yetişməmək. *Muradınıa - məqsudınıa* irməyən yalnuz qardaş! - deyib ağlaşdılar-bögürişdilər (58).

MUSA is. ər. Musa peyğəmbər, xristianların peyğəmbəri; □ *Museyi - Kəlimin əsası* Ağac! Böyük-böyük suların köprisi ağac! (48).

MUSTAFA is. ər. Məhəmməd peyğəmbərin ikinci adı. Adı görklü *Məhəmməd Mustafa* yüzi suyına bağışlasun, xanım, hey! (67); Ömri vəqti gəldügində arı imandan ayırmasun! Günahınızı adı görklü *Məhəmməd Mustafaya* bağışlasun, xanım, hey (103).



MUŞTLAMAQ f. Xoş xəbər gətirmək, gözaydınlığı vermək. Həm oğlın gəldi, deyü Aruza *muştladı* (100).

MUŞTULUQ is. Xoş xəbər, müjdə, gözaydınlığı. Atasına Basatın sevinc verdi: "*Muştuluq*! Oğlun Dəpəgözi dəplədi!" - dedi (103); Uşun qocaya çapar gəldi, "*Muştuluq*! Gözün aydın! (115).

MUŞTÇI is. Xoş xəbərçi, muştuluqçu, şad xəbərçi. Beyrəgə və anasına və qız qardaşlarına *muştçı gəldi* (56).

MÜBARƏK sif. ər. Uğurlu, xoş. Qurd yüzi *mübarəkdir*, qurdlər xəbərləşəyim, - dedi (45); Ğəza *mübarək* oldı (78).

MÜQABİL is. ər. Qarşı-qarşıya, qarşı tərəf, üz-üzə. Ol məl'un dəxi qəl'ədən tışagəlüb, bunlara *müqabil* oldı, ər dilədi (96).

MÜDARA is. fars. Dolanmaq, necə rəftar etmək? Təkur bəgləri cəm' eylədi bunlarla nə *müdara qılalum*? - dedi; Bunın *müdarası* oldur kim, Qazanı çıqaravuz, onlara bərabər edəvüz (120).

MÜRƏSSƏ is. ər. Qiymətli daş-qaşla bəzədilmiş, cəvahiratla zinətlənmiş; □ *Mürəssə tonlu* - Qaş-daş və cəvahiratla bəzədilmiş paltar geyinmiş. Üç yüz *mürəssə tonlu* yigit soyladı, boyına aldı (69).

MÜSƏLMAN is. ər. İslam dininə tapınınlar. ◇ Aydır: - Sözüm dinlə, Bayböre bəg! Allah-təala sana bir oğul vermiş, tuta versün! Ağır sancaq götürəndə *müsəlmanlar arxası olsun*! (54); *Müsəlman olmaq* - İslam dinini qəbul etmək. Parmaq götürüb, şəhadət gətürüb *müsəlman oldı* (109).

MÜSHƏF is. ər. Kitab, Qur'an. ◇ *Müshəf gətirmək* - Andiçmə mərasiminə Qur'anı gətirmə. *Müshəf gətürəndə* sən dəxi and iç! - dedilər; Bilmədik, yemə - içmə arasında *müshəf gətürdilər* (124, 125).

MÜTİ' sif. ər. İtaət edən, tabe olan; ◇ *Müti' olmaq* - tabe olmaq. Deyəlüm, gətürəlüm: - bizə *müti'* olursa, xoş! (124); Müshəf gətürdilər, biz Qazana ası olduq, sən dəxi bizə *müti'* ol! - dedilər; Anlara *müti'* olmadı (125).

MÜXƏNNƏT sif. ər. Namərd, e'tibarsız. Ol gün namərdlər *müxənnətlər* sanıa yer gözətdi (71).

MÜŞKÜL sif. ər. Çətin, ağır. Qorqud ata Oğuz qovminin *müşkülini* həll edərdi (31).

NAGAHAN zərf. fars. Gözlənilməz, gözlənilmədən. *Nagahandan* Dəli Domrul çapar yetdi; aydır (79); *Nagahandan* Oğuzun üzərinə bir sürdi, geyik gəldi (54).

NAGAH zərf. fars. Qəfildən, bilmədən. *Nagah* gözi qapağına qılıc toqundı (76).

NAGAHANDAN. zərf. fars. Qəfildən, bilmədən. *Nagahandan* qoyun ürkdi (98).

NAMAZ/NƏMAZ is. fars. Müsəlmanların gündə beş dəfə müəyyən qaydalar üzrə icra etməli olduqları ibadət. Tənri dostı, din sərvəri Məhəmməd görkli! Məhəmmədin sağ yanında *namaz* qılan Əbubəkr siddiq görkli! (32); *Nəmaz* qıldı, ağladı (76); İki rigət *nəmaz* qıldılar (77).

NAMƏRD sif. fars. Alçaq, nakişi, müxənnəs. Ol qırq *namərd* qarşu gəldi, aydır: ... Oğlın sağdır-əsəndir, avdadır (38); Ol gün *namərdlər* sapa yer gözətdi (77); Qadir-tənri səni *namərdə* möhtac etməsün! (84).

NAMUS is. ər. İnsanın öz şəxsi və ictimai davranışını tə'yin edən mə'nəvi və əxlaqi prinsiplərin məcmusu. Şərəf, qeyrət, heysiyyət. Ağan Qazanın *namusını* sındırayınmı? (47).

NE'MƏT is. ər. Yaşamaq üçün lazım olan şeylərin məcmusu. Burada çörək. Mən Qazanın *ne'mətini* çoq yemişəm (124).

NERƏ əvəz. Hara, nə yerdə. Nə biləyin, oğul, bu qəzalar sana *nerədən* gəldi? (39); Qanda gəzərdin *nerədəydin* a Qazan? (45); Qoun *nerəyə* gedərsə-getsün, neylərsə eyləsün" - dedi (64).

NECƏ I sual əvəz. Nə təhər? nə cür? Qanturalı aydır: "ya *necə* varar baba", - dedi (85); Nafər gəlüb oğlana soylamış, görəlim, *necə* soylamış; aydır (108); Aydır: "Mərə qavat, muxannatlıq ilə ər öldürmək *necə* olur, mən sana göstərəyim!" - dedi (126). Necə kim, necə ki. *Necə kim* bu duşi gördüm, şundan bərü əqlim-usım dərə bilmən (44).

NECƏ II ədat. Bən bu suyla xəbərləşim, - dedi. Görəlim, xanım *necə* xəbərləşdi (44).

NƏ sual əvəz. Baba *nə* söylərsən, *nə* aydarsan? (107); Qalqubanı yerindən turan yigit, *nə* yigitsən? (91); Görürmisin *nələr* oldı? Xan qızı, səbəbi *nədir*, degil mana: Səndənmidir, bəndənmidir, Tənri-təala bizə bir yetmən oğıl verməz, *nədəndir*? (35). *Nədir* halın? - dedi (106); *Nə* bilim - deyə bilmərəm. Oğlandır, *nə* bilsün? (37); Hər *nə ki*, buyursa, qəbul edərlərdi. Sözin tutub təmam edərlərdi (3); *Nə eyləyim* - övrət aydar: "*Neyləyim*, bu yığılacaq evdə un yoq, ələk yoq (33); Bulursam, buldım; bulmaz isəm, Tənri verdi, Tənri aldı, *neyliyəyin*? (74); Qoun, nerəyə gedərsə-getsün, *neylərsə* eyləsün (64); *Nə etmək* - birbirinə söz atışdılar. Budaq aydar: "Burada laf urub *nedirsən*? (94).

NƏVƏ is. Oğlun və ya qızın uşağı. Əlinin oğulları - peyğəmbər *nəvələri*. Kərbəla yazısında yəzidilər əlində şəhid oldı. (32).

NƏQARƏ//NAĞARA is. musiqi aləti. Gumbır-gumbır *nəqarələr* dögildi (55).

NƏZƏR is. ər. Diqqət xanımızın *nəzəri* bizdən dönmüş gördüm (105).

NƏZİR is. ər. İstək və arzu edilən bir şeyin yerinə yetirilməsi üçün yoxsullara verilən hər hansı bir pay, yaxud pul. Qara tonlı dərvişlərə *nəzirlər* verdim. Ac görsəm toyırdım, yalınçıq görsəm, tonatdım (38).

NƏR is. fars. Erkək. Qaytabanın mayasını yüklü qoydum; *Nərmidir*, mayamıdır, anı bilsəm (97).

NƏSİ sual əvəz. Kimi, kimisən. Sən Bəkilün *nəsisən*, oğlan, degil mizə! - dedi (108).

NƏSİB is. ər. Qismət, pay. Bir yigidin qara tağ yumrısınca malı olsa, yığar, dərər, tələb eylər, *nəsibindən* artuğın yeyə bilməz (31).

NƏSNƏ is. Əşya, hər hansı bir şey. Əmma bizim bir bəgümiz oğblı vardır, bu üç *nəsnəyi* ana ərməğam aparsavuz gərək idi! - dedilər (53); Əgər bu dedigim *nəsnələri* gətirərsin üz xoş verdim (56); Gördilər kim, bir ibrət *nəsnə* yatur (98); Üstümüzə yağı-*nəsnə* gəlmədi (123).

NİQAB is. ər. Keçmişdə döyüşçülərin, cəngavərlərin tanınmaması və qorunması üçün taxdıqları üz zirehi. Oğuzda dört yigit *niqabla* gəzərdi (87).

NİYƏ sual əvəz. Bən bunın alnına *niyə* tayaq olubən tururbən, - dedi (36); Aydır: "Baybörə bəg, *niyə* ağlayub bozlarsan? (36); Xanım, *niyə* səxt olursan? - dedi (104).

NİGARLI sif. fars. Gözəl, qəşəng. Toquz qara gözlü, xub yüzlü, saçı ardına urulu, köksi qızıl dükməli, əlləri biləgindən qınalı, barmaqları *nigarlı* məhbub kafər qızları Qalın oğuz bəglərinə sağraq sürüb içərlərdi (42).

NİŞAN is. fars. 1) Hədəf, nöqtə, nişanə: Nişan atmaq, hədəfə vurmaq, hədəfə tuşlamaq. Məgər göyginin yüzigine *nişan* atarlardı (63).

NİŞANLI sif. 2) Nişanlı. Adaxlı, nişanlanmış, ad edilmiş, deyikli. Sənin də içində *nişanlın* varsa, yigit, degil mana! (40); Mənim dəxi içində *nişanlım* var; Qomağım yoq qırq namərdə! (41).

NOLA. "Nə ola", "Nə olaydı" sözünün ixtisar olunmuş klassik forması. Beyrək dəxi - "*Nola*, xanım, baş üzərinə!" - dedi (55); *Noldun*, böylə bunaldın? (57); Deyər: "Ah, *noleydi*, bu öleydi, birinə dəxi varaydım" (33).

NÖKƏR is. Ev xidmətçisi (oğlan). Bəg nökərlərindən, *nökər* bəgindən ayrıldı (50).

NUH: Nuh peyğəmbər. Ol, *Nuh* peyğəmbərin eşəgi, əslidür. Andan dəxi sizi, xanım, Allah saqlasun (33).

# O

OVAMAQ f. Əzmək, kiçik hissələrə parçalanmaq . Gürzlə dögişdilər, qara polad üz qılıc ilə tartışdılar, sərpə-sərpə meydanda qılıclaşdılar, çiginləri toğrandı, qılıcları *ovandı*, bir-birin alımadı (109); Aslanın alnın gözədüb bir yumruq eylə urdı kim, yumruq çənəsinə toqundu, *ovatdı* (89).

OQ/OX is. Yayla atılan itiuclu və ya ucuna iti dəmir keçirilmiş mil. Bölükdə toqsan *oqını* nə ögərsən, mərə kafər? (43); Sadağında səksən *oqın* vergil mana (46); Bitəkəllüf kafərlər at dəpdilər, *ox* səpdilər (43).

OĞLAN is. Erkək uşaq. Kəsilsün *oğlan* əmən süd tamarım yaman sızlar (38); *Oğlan* - uşaq yemək yeməkcə gəlməz (bən$_{1}$ə), - dedi (71); Məgər sultanım, *oğlan* orada yığılmışdı (38).

OĞRI is. Oğru. Gördi kim, *oğrı* köpək, yekə tana evini birbirinə qatılmış - tauq komasına, sığır tamına dönmüş (33); *Oğul* atadan görməyincə ögit almaz. *Oğul* atanın yetiridir, iki gözünin biridir (31); Qarşu yatan ala tağdan bir *oğul* uçurdunsa, degil bana. Qamın aqan yügrək sudan bir *oğul* aqıtdınsa, degil mana (38).

OĞUZ is. Türk tayfasının adı. Xanlar xanı xan Bayandır yildə bir kərə toy edib, *Oğuz* bəglərin qonaqlardı (34); *Oğuzun*, ol kişi tamam bilicisiydi, nə deyərsə olurdu (31).

OĞUZNAMƏ is. Oğuzlar haqqında əsər, Dədəm Qorqut boy boyladı, soy soyladı, bu *Oğuznaməyi* düzdi-qoşdı, böylə dedi (41); Bu *Oğuznaməyi* düzdi-qoşdı, böylə dedi (50).

OĞRAMAQ f. Başqasına məxsus əşyanı gizlincə götürüb mənimsəmək. Bədəvi atlar issin görüb *oğradıqda*, uzun tat əri banladıqda (37).

OD is. Atəş, od. *Od* kibi şılayıb, yıldız kibi parlayub, gələn nədir (69); Mərə, *od* gətirin. ◊ Od düşmək - həyəcanlanmaq. Selcan xatun bunı böylə gördi, içinə *od* düşdü (91); *Od urmaq* - yandırmaq. Ala yıla sökməz ormanını Çoqmaq çaqub *oda urmaq* (86); *Oda yaxmaq* - yandırmaq. Sarı tonlı Selcan xatun göşkdən baqar, kimə baqsa, eşqilə *oda yaqar* (90); Kafirlər leşindən bir böyük dənə yığdı, çaqmaq çaqub *od yaqdı* (44).

ODA is. Otaq. Savaşalım, dögüşəlim, ölənimiz olsun, diri qalanımız *odaya* gəlsin (91); Qılıcının balçağı qan *odaya* gəldi (91); Sənin də içində *odan* varsa, yigit, degil mana (40).

OYARMAQ f. Oyatmaq. *Oyarmaq* bəndən, savaşuban hünər göstərmək səndən (91).

OYLIĞ // OYLUĞ is. Tarın, kamanın bir hissəsi. Sağ *oylığı* qayaya toqındı, sındı (105); Sağ *oyluğu* sındı (106).

OYNANMAQ f. Tərpənmək. Sarı qayalar *oynanmadı*, yer oyruldu (40);

OYNAR OLMAQ f. Oynamaq. Oğlancıqlarla *oynar oldı* (99).

OYNAMAQ f. 1) Rəqs etmək. Mərə, Qısırğa yengə, tur sən *oyna* nə bilir dəli ozan (64); 2) Titrəmək (ürəyi oynamaq): Qara bağrı sarsıldı. Düm yürəgi *oynadı* (38).

OYNATMAQ f. Qırq yigit bədəvi *atın oynatdı*, oğlanın üzərinə yığnaq oldu (41); Qonur atın *oynatdı* (74).

OYRULMAQ f. Ayrılmaq, aralanmaq. Sarp qayalar oynanmadı, yer *oyruldı* (40).

OYUN GÖSTƏRMƏK f. Güləşmək. Canvərlər sərvəri aslandır, onunla dəxi *oyun göstərsün*, qızı ondan sonra verəlüm (45).

OL işarə əvəzliyi O. *Ol* iki həlala yüz qırq yıl ömr verdim (83); *Ol* yigit üzərinə möhkəm qara şivən oldı (79); *Ol* gün qara polat uz qılıclar çalındı. *Ol* gün qarğu dillü qaim oxlar atıldı (94); Məgər, xanım, *ol* necə Qalın Oğuzın dövləti Bayındır xanın göygüsü, Ulaş oğlı Salur Qazan qara qayğılu vaqiə gördi, sərmərdi urı turdı (44); Məgər *ol* dəm Bayındır xan bəglər ilə seyrana yetişmişlərdi (98).

OMUZ is. Çiyin. Çomağı *omuzına* bıraqdı (104).

ON s. Gerçəklərin üç otuz *on* yaşını toldırsa yeg (32); Biləgümdən *on* barmağımı qanda gördüm (44).

ON ALTI s. *On altı* yıllıq həsrətin - oğlun Beyrək gəldi axır (66); *On altı* yıldır ki, Oğuz içindən getmiş idik (53).

ON BİN s. Qazanın qapulu Dərvəndə *on beş* qoyunı vardır (43).

ON İKİ s. Hər atandı *on iki* batman taş atardı (48).

ORĞAN is. Örkən. Ağ boynunda qıl *orğan* taqılu, dcyəyinmi? (76); Qıl *orğan* ağ boynuna tağdılar (71); Qazan oğlı Uruzı həbsdən çıqarun, boğazından *orğanla* asun (47).

ORDU is. Yaşadığı yer, kənd, mahal. Otuz iki dişdən çıqan bütün *orduya* yayıldı. "Bəkil atdan düşmüş ayağı sınmış" - deyü (106); Atının cilovlasın döndərdi *ordusuna* gəlür oldı (37); Oğlanı atə bindirdilər, alubanı *ordısına* gətdilər (39).

ORTA zərf. Başını *ortaya* gətirdilər (105); Dəpəgözün başını *ortaya* gətirdilər.

ORTAC is. Ortaq. Oğulda *ortacım* yoq, qartaşda qədərim yoq (52).

OT is. Ot, çəmən. Bitər sənin *otların* Qazlıq Tağı (39).

OTAQ // OTAĞ is. Ev. Xəbəri yoq ki, alacağı ala gözlü qızın *otağı* olsa gərək (54); Gördi gög çayırın üzərinə bir qırmızı *otağ* dikilmiş (54); Bir yerə ağ otağ, bir yerə qızıl *otağ*, bir yerə də qara otağ qurdırmışdı (34); Av ovlıyalım, quş şuşlıyalım, saqın keyik yıkalum, qayıdalım *otağıma* düşəlim (42).

OTUZ s. Gerçəklərin üç *otuz* on yaşını toldırsa, yeg (32).

OTUZ TOQUZ s. Beyrək *otuz toquz* yigidin üzərinə gəldi (66).

OTUZ ÜÇ s. Keçənindən *otuz üç* aqça olurdı, keçmiyənindən dögə-dögə qırq aqça olurdu (79).

OTURMAQ // OTIRMAQ f. Əyləşmək. Dəli Domrul qırq yigid yeyib-içüb *oturarkən* nagahandan Əzrayil çıqa gəldi (79); Günlərdə bir gün Yegnək *oturub* bəglər ilə söhbət edərkən Qaragünə oğlu Budağilə uz düşmədi (94); Sağ yanında qardaşı Qaragünə *otırmışdı*. Sol yanında tayısı Uruz *otırmışdı* (68); Bəy, bu zəvala gələcək dəlü bəni görmiş gibi söylər, - dedi. Vardı yerində *oturdı* (64).

OX is. *Ox atmaq*. Ox atanda mən sənin oxını yarmadımmı? (65); Yay çəkmədün, *ox atmadın* (69); *Ox otdığım* yerləri, qılıc çalub baş kəsdügüm yerləri göstərəyim (69); *Ox səpmək*. Bitəkəllüf kafərlər at dəpdilər, *ox səpdilər* (43).

OXLAMAQ f. Oxla nişan almaq. Üzərinə gəldi, gördü kim, Qanturalının atını *oxlamışlır* (34).

OCAQ is. 1) Xörək bişirmək, su qızdırmaq üçün daşdan, kərpicdən hörülmüş kiçik tikili: Mərə qocalar sügiligi *ocağa* qour qızsun (101); 2) Ev-eşik, yurd. *Ocağınıza* buncılayın övrət gəlməsün (33); *Ocağına* buncılayın övrət gəlsün (33); Oğul, *ocağın* issüz qoma, kərəm eylə, varma (101).

OXLANMAQ f. Oxla vurmaq. Bədəvi atı oğlanın *oxlanmış* yatur.

OXŞAMAQ f. Tumarlamaq. Oğlancıqları qarşu gəldi, *oxşamadı* (105).

OXIMAQ // OXUMAQ f. Çağırmaq. Oğul, Qalın Oğuz bəglərini odamıza *oxıyalım*, necə məsləhət görərlərsə, ona görə iş edəlim (55); Bayböre bəg bazırganlarını yanına *oxıdı*, buyuruq etdi (52); Sağış günində ayna görklü, ayna güni *oqıyanda* qütbə görklü (32).

## Ö

ÖVRƏT is. Arvad, qadın. Anun kibinin, *xanım*, bəbəkləri bitməsün, otağına bunğılayın övrət gəlməsün (133).

ÖD is. ◇ Ödi yarılmaq. Qorxmaq. Oğlı Qıyan Səlcügin *ödi yarıldı* (199).

ÖYGƏ is. Yuqarısından *öygə* ilə həmlə qıldı (156).

ÖYLƏ iş. əv. Elə. Ol *öylə* adam degildir kim, sana görinə (154); Xoş *öylə* olsun! (99).

ÖG zərf. Ön, qabaq. Baban, dedi, keyikləri qovsun gətürsün, bənim *ögimdə* dəpələsün, oğlumın at səgirdişin, oq atışın görəyim, sevinəyim. Kimün ki oğlı-qızı yoq, qara otağa qondu-

rın, qara keçə altına döşən, qara qoyun yəxnisindən *ögnə* gətürün (34).

ÖGİT is. Öyüd, nəsihət. Qız anadan görmiyincə *ögit* almaz, oğul atanın yetiridir, iki gözinin biridir (31).

ÖGMƏK f. Tə'rifləmək. Altundağı alaca atun nə *ögərsən*? (43); Ol *ögdigim* yuca Tənri dost olubanı mədəd irsün (41); Ağız açub *ögər* olsam, üstimizdə Tənri görklü (32).

ÖGRƏNMƏK f. Öyrənmək. Qur'anı yazdı-düzdü, üləmalər *ögrənincə* göydi-biçdi (32).

ÖGÜT is. *Ögüt vermək.* Öyüd vermək, nəsihət vermək. Qırq incə bellü qızun içinə girdi, *ögüt verdi* (46).

ÖLMƏK f. Məhv olmaq. *Ölmişmiydin*, yitmişmiydin, a Qazan! (45); Oğul dəki neyləsün, baba *ölüb* mal qalmasa (38); Ah, noleydi, bu *öleydi*, birinə dəxi vareydim (33).

ÖLÜMLİ sif. Gəlimli, gedimli dünya, Sonucu *ölümli* dünya (93).

ÖLDÜRMƏK f. Məhv etmək. Əgər böylə *öldürməzsən* bir dürlü dəxi *öldürəməzsən*, bəllü bilgil (37).

ÖMÜR is. Dövlətlü xanım *ömri* uzun olsun (58).

ÖNCƏLƏMƏK f. Qara bağrı sarsıldı. Qonur atını *öncələdi*, kafər keçəgi yola düşdi, getdi (44).

ÖPMƏK f. Beyrək üç *öpdi*, bir dişlədi (55).

ÖTƏ f. bağ. Ötərək. Dədəm Qorqud *ötədən* bəri gəldi (55).

ÖTƏGİ zərf. Arxadakı. *Ötəgi* qara tağın bir yanında altı başı balqar bir ər gördüm (95).

ÖTGÜN f.sif. İti, sür'ətli. Ağ yeləklü *ötkün* oxın mana vergil (107).

ÖTMƏK f. Keçmək. Tan *ötdi*, gün toqdı (57).

# P

PADŞAH is.fars. Hökmdar, imperator, dövlət başçısı. *Padşah* Qazan xan oğlı Uruzın sağ yanında ana yer göstərdi (109); Beyrək *padşahlar padşahı* həqqinə vasil oldı, bəllü bilsün! - dedi (125); ◇ *Padşahına asi olmaq.* Böyüyünün sözünü qəbul etməmək. *Padşahına asi olanın* işi rast gəlməz (105).

PAY is. Pay, bir tikə qismət. Qısırca yengə deyərlər bır xatun vardı, *pay* dilədi (54); ◇ *Pay vermək.* Yediyin bir şeydən və s. başqasına da bir qismət vermək: - Hay bəg yigit, bizə dəki bu keyikdən *pay ver*! - dedi (54).

PAYƏNDƏ sif.fars. Həmişəlik, durumlu. ◇ *Payəndə olmaq* - Həmişə, daimi möhkəm və var olmaq. On otuz on yaşında tolsun, həq sizə yaman gətirməsin, dövlətiniz *payəndə olsun*, xanım, hey (32).

PANBUQ is. Qozalarının içindəki liflərindən iplik hazırlanan kolşəkilli birillik cənub bitkisi. □ (Əsgi) *panbuq* bez olmaz (31).

PARA sif. Bütöv olmayan, paralanmış, sınmış. ◇ *Para olmaq* - sınmaq. Qəbzəsindən yay iki *para oldı* (63); Anı dəxi iki para eylədi (102); *Para-para olmaq* - sınıb dağılmaq: *Para-para oldı*, ovandı (121).

PARALAMAQ//PARALANMAQ f. ("para" sifətindən). Diri-diri qılınclayıb öldürmək. *Dağıdılmaq* (burada). Gərdək *paralanmış*, naib şəhid olmuş (57).

PARASAR qəd.top. *Parasarın* Bayburd hasarından parlayıb uçan ap-alaca gərdəginə qarşu gələn, yedi qızın umudı Qalın Oğuz imrəncisi, Qazan bəgin yınağı boz ayğırlu Beyrək çapar yetdi (49).

PARLAMAQ f. İşıldamaq, işıq saçmaq. Od kibi şılayub, ıldız kibi *parlayıb* gələn nədir? (69).

PARMAQ is. B a x: Barmaq.

PASNİK top. Qədim Dərbənd ətrafında böyük qala adı. *Pasnik* qara Dərvənd ağzına düş vermiş idik (53).

PAŞA is. Keçmiş sultan Türkiyəsində, Misir və bə'zi başqa müsəlman ölkələrində ali hərbi vəzifə tutan şəxs və mülki mə'murlara verilən fəxri ünvan, titul və s.: Çün iyanət Tənrimdən oldı, bəgün, *paşanın* himməti Qanturalıya oldı (89).

PEYĞƏMBƏR is.fars. Müxtəlif dini e'tiqadlara görə Allahın əmrlərini yerinə yetirən, xəbər verən, şərh edən şəxs. Tənrinin buyruğu ilə, *peyğəmbərin* qovmü ilə Aydan arı, gündən görklü qız qardaşın Banıçiçəgi Bamsı Beyrəgə diləməgə gəlmişəm! - dedi (56); *Peyğəmbərin nəvələri* Kərbəla yazısında yezidilər əlində şəhid oldı (32).

PENİR is.fars. Pendir. Maya vurulmuş süddən xüsusi hazırlanmış bərk və ya yarıbərk kütlə şəklində qida məhsulu: Südü, *peniri* bol, qaymaqlu çoban (43); Buynuzı ilə bir taşı yoğurdı, *penir* kibi ditdi (87).

PƏNCYEK is.fars. Beşdə bir. ✧ *Pəncyek çıxarmaq* (məc.) - hədiyyə: Quşun ala qatını, qumaşun arusını, qızın gökçəgini, toğuzlama çırğab çuxa xanlar xanı Bayındıra *pəncyek* çıxardılar (67).

PƏNCƏRƏ is. İşıq və hava gəlmək üçün evin və s. divarında xüsusi şəkildə qoyulmuş nəfəslik; □ *Pəncərədən uçmaq.* Gözə görünmədən *pəncərədən* uçmaq. Əzrail bir gögərçin oldı, *pəncərədən uçdı,* getdi (80).

PƏRDƏ is.fars. Qapı, pəncərə və s. asılan örtük və ya bir yeri iki hissəyə ayırmaq üçün asılan iri parça, tül: Bin *pərdə,* ipək xaliçəsi döşənmişdi (52).

PƏRİ is.fars. Əsatirdə cinlərin çox gözəl və cazibəli qadın şəklində təsəvvür olunan qismi: Ol binara *pərilər* qonmışdı (93); □ *Pəri qızı.* Pərilərdən biri: *Pəri qızı* qanat urub uçdı (98).

PƏRLÜ//PƏRLİ düz.sif.fars.az. Qanadlı. Bir dəxi altı *pərli* gürz aldılar (53); ✧ *Pərlü gürz* (məc.) - *qanadlı gürz. Pərlü gürzini* əlinə alub Qazanı çaldı (120-121).

PƏHLƏVAN is.fars. Güclü, qüvvətli adam; ✧ Pəhləvan olmaq. İki *pəhləvan* olub, bir-birinə sarmaşdılar (55); □ *Pəhləvanlar(ın) qaplanı* - Pəhləvanların pəhləvanı, qaplan kimi güclü: Bu məhəldə ərənlərin meydanı, arslanı, *pəhləvanların qaplanı* Boz Oğlan yetdi (53).

PƏHLU z. fars. Yanaşı (burada); ✧ *Pəhlu urmaq.* Göglə yanaşı olmağa can atan. Göglə *pəhlu* uran qəl'ələrin Qadir qoursa, yalam-yığam (86).

PƏRÇİN sif.fars. *Pərçin qılmaq.* Qaba öncəmlə *pərçin qılan* Qazan əridim (117).

PƏS zərf.fars. Sonra. Bəli: *pəs* əvət, ağ saqqallu əziz baba, mənim dəxi istədügim oldur (55); *Pəs* ol Təkur qəl'əsindən taşra çıqdı (94).

PİLON is. Keşişlərin üstdən geydikləri paltar. *Pilon* geyən kişinin əlin öpərəm (68).

PİR is.fars. Qoca. Qoca saqqalu *pir-qocalar* yanına bıraqdı (85).



PİŞİRMƏK//BİŞİRMƏK f. Bişirmək, hazırlamaq: Bunlu qoca ilə Yapaqlı qocayı Dəpəgözə verün, aşın *pişirsün*! - dedi (99); Əvət, həm mana iki adam verin, yemegüm bənim *bişürsün,* mən yeyəyim! - dedi (99).

PİŞKEŞ is.fars. Hədiyyə; ✧ *Pişkeş çəkmək* - hədiyyə almaq. *Pişkeşin çəkdi* (104).

PIRLAMAQ səs təql. f. Qanad çalıb uçmaq: Köksün dəlib gögə *pırlar* (108).

PIRTARMAQ səs. təql. Yıxıb öldürmək. Kafərlər ayıdır: Şimdi yigidi atar-yıqar, sərər-*pırtar* (87).

POLAT//POLAD is. Qara *polat* uz qılıcım əlümə alayımmı? (35).

PUL is. Pul. Alqı-satqı vasitəsi. Aq aqça gətirdilər, *puldur,* - dedim (116); Altun-gümüş *pul* gərəksə, ana xərclıq olsun (81).

PUSARIQ is. Qara duman. Dümqara *pusarıq* ordumın üzərinə tökülü gördüm (44).

PUSQU is. Hiylə qurub güdükləmə. Ağca atlu Şöklü Məlik qatı *pusmuş* (106).

PUSMAQ f. Gizli-gizli güdmək. *Pusduğından* qara taqlara duman düşmüş (106).

PUSU is. Güdükçü; ✧ *Pusu olmaq.* Güdükçü olmaq: Və həm bizə *pusu olğıl,* oğul! - dedi (71).

PUT B a x: Bud.

PÜT B a x: Büd.

## R

RAZI sif. ər. Razı olmaq. Razılığını vermək. Mənim canım sənin canına qurban olsun, - dedi . *Razı* oldı. Əzrayil xatunın canın almağa gəldi (83).

RƏSUL is.ər. Rəsul əleyhissəlam. Məhəmməd peyğəmbərə verilən adlardan biri; *Rəsul* əleyhissəlam zəmanına yaqın Bayat boyından Qorqut ata diyərlər, bir ər qopdı (31).

RƏSULLAH is.ər. Allahın elçisi (Məhəmməd peyğəmbərin adlarından biri). "La ilahə illəllah, Məhəmməd *rəsulallah*", - dedi (101).

RƏHM is.ər. Ana bətni: Ata adını yüritməyən xoyrad oğul ata belindən enincə enməsə, yeg, ana *rəhminə* düşüncə, toğmasa, yeg (32).

RƏHMƏT is.ər. Mərhəmət, rəhm: Həq-təala atamın, könlinə *rəhmət* eləsə, kəbin kəsüb məni ol yigidə versə (87).

RİZQ is.ər. 1) Yeyiləcək, içiləcək hər bir şey, azuqə; 2) Ne'mət, ruzi, qismət. Kimsə *rizqin* yemədün. Kimsəyə güc etmədin (96); *Mal-rizq* - sərvət, dövlət. Oğul, qız görmək səndən, *mal-rizq* vermək bəndən (85).

RUM etnonim ər. Rum eli - Bizansa, Kiçik Asiyaya verilən ad (Rum sözü əslən yunan sözü olub müsəlman məmləkətlərində yaşayan əhali haqqında işlədilir). "Varın *Rum* elinə mənim oğlım içün yəxşi ərməğanlar gətürün, mənim oğlım böyüyüncə", - dedi (52).

RÜK'ƏT is.ər. Namazda bir dəfə ayağa qalxma (qiyam), bir dəfə əyilmə (rükü) və iki dəfə üzünü yerə sürtməkdən (səcdə) ibarət hərəkət. Ağ alınların yerə qodılar. İki *rük'ət* namaz qıldılar (50).

# S

SABAH zərf.ər. Günün başlanğıcı, günün ilk saatları, səhər, sübh: Alar *sabah* Dərsə xan yerindən uru turdı (37); Alan *sabah* yerindən turan qızlar! (62).

SAVAŞ is. Vuruş, döyüş: Qazan kibi pəhləvanı bir *savaşda* üç kərrə atından yıqan Qıyan Səlcik oğlı Dəlü Topdaz çapar yetdi (77); Yanımda yigitlərim *savaş* dilər (108).

SAVAŞDIRMAQ f.ic.n. Vuruşdurmaq, döyüşdürmək: Bir yazın, bir güzin buğayla *savaşdırarlardı* (36).

SAVAŞMAQ f. Vuruşmaq, dalaşmaq: Əzrayili mənim gözümə göstərgil, *savaşayım*, çəkişəyim (79); *Savaşdügin* vəqtin kəndüni tutdurasan (74); ◇ *Savaş etmək* - vuruşmaq: Oğlan qırq yigidin boyına aldı, at dəpdi, cəng və *savaş etdi* (41); *Savaş olmaq* - vuruş olmaq: Ol gün bir qiyamət *savaş oldı*, meydan tolu baş oldı (50).

SAVQAN SARI is. antr. "Yerin, bir ucından bir ucına yetim" deyən *Savqan Sarı* bilə varsun! (95).



SAVILMAQ f. Çəkilmək, kənarlaşmaq, uzaqlaşmaq: Oğlan buğanın alnından yumruğın gedirdi, yolından *savıldı* (36); Buğanın ögindən *savıldı*, buğa buynuzı üzərinə dikəldi (88).

SAVMAQ f. Ötürmək, yan etmək: Azıb gələn qəzayı Tən,ri *savsın*, xanım, hey! (32).

SAVRILMAQ f. Sovrulmaq: Yerə dəxi düşsə, toz kibi *savrılardı*, ocaq kibi oyrulardı (48); Ayıtdı kim, yer kibi kərtiləyin, topraq kibi *savrılayın*, qılıcıma toğranayım...(90).

SAQ sif. Sağ olmaq, həssas olmaq: Xanım, at qulağı *saq* olur (113).

SAQAL is. Saqqal. *Saqalı* uzın tat əri ban,ladıqda (34); *Saqalım* ağarduğın nə bəgənməzsən? (80).

SAQALCIQ is. Saqqalcıq; kiçik saqqal: Mərə, *saqalcığı* ağca qoca (80).

SAQALLU sif. Saqqallı, saqqallı olan. *Saqallu* boz ac turğay sayradıqda (34).

SAQAR sif. Qaşqa: "Taqlıcıqlar, dövlətim *saqar* qoç, gəl keç!" - dedi (101).

SAQAC is. Sac: Qara *saqac* altında kömecdən nə var? Ətməkdən nə var? (62).

SAQINMAQ f. Çəkinmək, özünü gözləmək: *Saqın*, qadın ana! (47).

SAQLAMAQ f. 1) Saxlamaq: Ol qız içün üç canvər *saqlamışlar* (86); Bədəvi atım *saqlardım* bu gün içün (70); Yad oğlı *sağlamaqla* oğul olmaz (31); 2) Gizlətmək: Oğlanı həkimlərə ısmarlayub Dərsə xandan *saqladılar* (39); Tutsaq olduğın oğlandan *saqlarlardı* (94).

SAQLATMAQ f.ic.n. Saxlatmaq: Oğlancuğını dayələrə verdi, *saqlatdı* (35).

SAQSAQAN is. Sağsağan: Cümlə quşlar sultanı çal qaraquş qanadilə *saqsaqana* kəndözin şaqıdarmı? (90).

SAĞ I sif. Salamat, diri, canlı: Ol Məkkəyə *sağ* varsa, əsən gəlsə, sidqi bitün hacı görkli (32); Dirsə xan burda oğlancığın *sağ* idügin yenə bildi (41).

SAĞ II zərf. Sağ tərəf: Məhəmmədin, *sağ* yanında namaz qılan Əbubəkr siddiq görkli! (32).

SAĞALTMAQ f. Sağaltmaq: Sən mənim əlümi *sağaldı* gör, Tən,rinin, buyruğilə, peyğəmbərin, qövmilə qız qarındaşı Beyrəgə verəyin! - dedi (56).

SAĞDIRMAQ f.ic.n. Sağmağa məcbur etmək: Dəpə kibi ət yığ, göl kibi qımız *sağdır*! (35); Göl kibi qımız *sağdırdı* (35).

SAĞDIC is. Toy mərasimində bəyin (oğlanın) və ya gəlinin sağ tərəfində oturan, yaxud onları müşayiət edən şəxs: Eki qardaş bir-birinə *sağdıc* oldılar, gördiklərinə çapub düşdilər (115).

SAĞ-ƏSƏN sif. Sağ-salamat: *Sağ-əsən* çıqub gəlsə, Qarşu yatan qara tağlar sana yaylaq olsun! (66); Ordım *sağ-əsən* degil isə başınuza çarə edin (44).

SAĞINC is. Fikir, düşüncə, ağıl: Sağlıqla *sağıncın*, dövlətin, həq artursın (41).

SAĞIRMAQ f.ic.n. B a x: Saqdırmaq: Dəpə kibi ət yığdım, göl kibi qımız *sağırdım* (38).

SAĞIŞ is. Qiyamət: *Sağış* günində ayna görkli, ayna güni oqıyanda qutbə görkli (32).

SAĞLI-SOLLI zərf. Həm sağdan, həm də soldan: hərtərəfli: *Sağlı-sollı* kafəri xub tağıtdı (71).

SAĞLIQ is. Salamatlıq: Qara başım *sağlığında* eyiliklər edəm, köpək, sana! - dedi (45): "Əgər səni hasardan aşağa orğanla salındıracaq olursam, babana-anana *sağlıqla* varacaq alırsan, bəni bunda gəlüb həlallıqla alurmısan? - dedi (59).

SAĞMAQ f. Sağmaq: Babanın, ağ-ban əşigində qaravaşlar inək *sağar* görmədinmi? (88).

SAĞRAQ is. *Sağraq sürmək* - şərab paylamaq: Toquz qara gözlü, xub yüzlü, saçı ardına urulu, köksi qızıl dügməli, əlləri biləgindən qınalı, barmaqları nigarlı məhbub kafər qızları Qalın Oğuz bəglərinə *sağraq* sürüb içərlərdi (42).

SAĞRI is. Sağrı: "Nə gəlürsə, bənim *sağrıma* gəlsün" deyü əlüyin...urur, yönin anaru *sağrısın* ərinə döndürür (33).

SAĞ-SOL z. O tərəf - bu tərəf: *Sağa-sola* çırbındı urar yüzgüçiləri (118); *Sağın-solün* Uruzın, çevirdilər (71); *Sağına-solına* eki qoşa yay çəkərdi (85).

SADAQ is. Oxqabı: *Sadaqından* toqsan axın yerə dökdi (92); *Sadaqla* oxum keşin dilər (108); *Sadağında* səksən oqın vergil mana! (46).

SAZ is. Qamışlıq: Beyrəgin, qorqusundan qaçdı, özini Tana *sazına* saldı (66); Ağ *sazın*, aslanında bir köküm var (118).

SAİR sif.ər. Başqa. Qılıc və sügü və çomaq və *sair* cəng alətin geydirüb tonatdılar (120).



SAY sif. Düz, dümdüz: Üç yüz *say* cidalu yigit bunın, yanına cəm' oldı (110); ◇ *Saya varmaq* - saymağa başlamaq: *Saya varsam*, dügənsə olmaz, Qalın Oğuz bəgləri bindi (42).

SAYVAN is. Kölgəlik: Ala *sayvan* gög yüzinə aşanmışdı (94).

SAYVANLI//SAYVANLU sif. Kölgəli: Atlas ilə yapılanda Gög *sayvanlı*! (94); Atlasda yapılanda gög *sayvanlu* (63).

SAYDURMAQ f.ic.n. Hesab etmək: Kafəri qamış kibi od oluban yandırayım, Toquzını bir yerinə *saydurayım* (76).

SAYILMAQ f.məc.n. Hesablanmaq, cayı, ədədi bilinmək: *Sayılmaqla* Oğuz ərənləri dükənsə olmaz (95).

SAYMAQ f.məc.n. Hesab etmək: Otuz bin, ər yağı gördümsə, ota *saydım* (117).

SAYRAMAQ f. Quş və ya toyuğun oxumağı: Saqallu boz ac turğay *sayradıqda* (37).

SAYRU sif. Sayru düşmək - xəstələnmək. Ol obada bir yaxşı - xub yigit *sayru* düşmüş idi (79).

SALAVAT is.ər.: Salavat gətürmək - dua oxunduqdan sonra sağ əli üzə çəkmək ayini: Adı görklü Məhəmmədə *salavat* gətürdi (101); Qanturalı adı görklü Məhəmmədə *salavat* gətürdi (88).

SALAM is.ər. Salam vermək - biri ilə görüşərkən "salam" deyib təbrik etmək: Biz kafərə *salam* vergil, öldürmiyəlim! (43).

SALAXANA is. ər. və fars. Top. Mal-heyvan kəsilmək üçün xüsusi yer: Dəpəgöz oldığı *Salaxana* qayasına gəldi (101).

SALQUM-SALQUM sif. Sərin-sərin, soyuq-soyuq: *Salqum-salqum* tan yelləri əsdigində (34).

SALI: salı vermək - buraxmaq: Tutsaq olan Qazılıq qocayı *salı vermişlər* (96); Buğanın, zəncirin aldılar, *salı verdilər* (88); Həsud kafərlər bağlamadılar, yülərin sıyırıb *salı verdilər* (89).

SALINMAQ f.məc.n. Qoyulmaq: Ağzı böyük xümrələr ortalığa *salınmış* idi (68).

SALINDIRMAQ f.ic.n. Sallandırmaq: Basatı öginə qatdı, tutdı. Boğazdan *salındırdı* (101); Qız dəxi orğan gətürüb Beyrəgi hasardan aşağı *salındırdı* (59); "Əgər səni hasardan aşağa orğanla *salındıracaq* olursam, babana-anana sağlıqla varacaq alırsan, bəni bunda gəlüb həlallıqla alurmısan? - dedi (...)

SALMAQ f. 1) Bir şeyi hündür, yuxarı yerdən aşağı yerə endirmək, düşürmək, tullamaq: Şökli Məliki bögirdibəni Qazan bəg atdan yerə *saldı* (66); Qazan bəgün, qartaşı kafərin, tuğilə sancağı qılıcladı yeri *saldı* (50); 2) Sərmək, döşəmək: Qaba əncəm altına *salaydım* (47); İpək xəlicələr *saldı* (53); 3) Endirmək, çəkmək: Qara qılıcın *sal* boynıma kəs başım (117); *Sal* qılıcın, kəs başım (118); 4) Xilas etmək: Sası dinlü kafər əlində tutsaq olaydın, oğul! Altun-aqça gücinə *salubanı* səni qurtaraydım, oğul! (82); 5) Tərk etmək, qoyub getmək: Qalan kafərlər bilüb, meydanı *salub* qaçdı (109); Yad oğlı saqlamaqla oğul olmaz, böyüyəndə *salur*-gidər, gördüm dimez...(31); ◇ Adam salmaq - xahiş etmək üçün adam göndərmək: Təkür *adam saldı*: "Kim idügin bilin!" - dedi (116); Ata-ana ağlaşub Qazana *adam saldılar* (112); *Adam saldı*, əmmisini oxudı, gəldi (119); at salmaq - at buraxmaq, atla hücum etmək: Bəkil buna *at saldı* (105); Bitəkəllüf kafərə *at saldılar* (50); boyına salmaq - özü ilə aparmaq: Oğlancuğın yanına alub, qırq yigidin *boyına saldı*, ava çıqdı...(37); ğoğa salmaq - çaxnaşma yaratmaq: Ağzı qaba köpəklərə *ğoğa salan*! (45); dilbənd salmaq - dəsmalla əl eləmək: Qırq yigidinə *dilbənd saldı*, əl eylədi (41); əyər salmaq - yəhərləmək: Baba, yelisi qara Qazlıq atuma *əyər salayım*, qanlu kafər elinə aqın çapayım (86); Kafərin arxasına *əyər saldı*, ağzına uyan urdı (117); yanına salmaq - özü ilə aparmaq: Ağ işıqlı alpları *yanıma saldım* (95); Ala gözlü yigitlərin *yanına saldın* (105); Ala gözlü bəgləri *yanıma salardım* (124); su salmaq - su buraxmaq: Quru-quru çaylara *su saldım* (73); suçu salmaq - suçu buraxmaq: Quru-quru çaylara *suçu saldım* (38); Həbsə salmaq - həbs etmək. Götürdilər, ton,uz tamına *həbsə saldılar* (119).

SALUR is. Antr. Bərü gəlgil, *Salur* bəgi, *Salur* görgi! (72).

SALUR QAZAN is. Antr. Qırış güni ögdin dəpər alpımız - *Salur Qazan*! (114); İçüb-içüb Ulaş oğlı *Salur Qazanın* alnına şərabın itisi çıqdı (42).

SALXIM is. Üzüm gilələrinin bir budaqcıqdakı topası. Ol bağların, qara *salxımları*, üzümi olur (80).

SAM is.ər. Asiya və Afrika səhralarında əsən çox şiddətli, isti və quru külək: ümumiyyətlə şiddətli, isti və quru külək: *Sam* yelləri əsmədin, Qazan, qulağım çınlar (72).



SAMAN is. Saman: Bir torba *saman* döşəkli, yarım kərpic yasdıqlı, yonma ağac ton,rili, Köpəgim kafər (119).

SAMUR is. Dələlər sinfindən boz rəngli qiymətli xəzi olan yırtıcı heyvan: burada samur dərisindən hazırlanmış (geyim): *Samur* cübbəsin əgninə aldı (72).

SAN,A əv. *Sən* əvəzliyinin yönlük hal forması: Can tatlusın *san,a* bildirəyinmi? (35).

SANASAN KİM modal s. Hesab edəsən ki... *Sanasan kim*, tar yolda tolu düşdi (71).

SANMAQ f. Zənn etmək, hesab etmək: Mərə kafərlər, bu ərəbəyi beşigim *sandım* (116); Elə *sandı* kim, yağı basıldı (91).

SANCAQ I is. Bayraq: Qazan bəgün qartaşı kafərin tuğilə *sancağı* qılıcladı, yerə saldı (50).

SANCAQ II is. Vilayət: Yigirmi dörd *sancaq* bəgi gəlsün! - dedi (95).

SANCAQLU sif. Bayraqlı: Mərə yigit, ögincə bu çərinin, Bir aq *sancaqlu* alay çıqdı (120).

SANCIDA is. Top. Altun aşıq oynar *Sancıdanın,* bəgləri (118).

SANCILMAQ f.məc.n. Batırılmaq, keçirilmək: Qılıcıma toğranayın! Oxıma *sancılayın*! (59).

SANCMAQ f. Batırmaq, keçirmək, taxmaq, soxmaq: Uruz gen yaqadan sügüsin *sancdı*, turdı (71); İki talusından çəngələ *sancun*, qıyma-qıyma ağ ətindən çəkün (47); Sügüylə *sancdılar*, ilmədi (99); *Sancubanı* yerə çaldı, dəprətmədən başın kəsdi (77); "Qazanı *sancam*" - dedi, *sancamadı*, ötə keçdi (121).

SAPA sif. Sərt: Alan sabah *sapa* yerdə dikiləndə Ağ-ban evli! (94); Ol gün namərdlər *sapa* yer gözətdi (77).

SAPADANCA zərf. Sabahdanca, səhər tezdən: Gəldin ol kim soldıran soydır, *sapadanca* yerindən uru turar, əlin-yüzin yumadan toquz bazlamac ilən bir küvlək yoğurd gəvəzlər...(33)

SAPAN is. Daş atmaq üçün qədim silah: Üç yerdə dəpə kibi taş yığdı, ala qollı *sapanın* əlinə aldı (43); *Sapan* taşına tutdı (98).

SAPMAQ f. Qorxmaq, çəkinmək: Qılıcından *saparım* yoq! Kəndü əslim, kəndü köküm sımağım yoq! - dedi (117).

SAPASAĞ sif. *Sapasaq olmaq* - tamamilə sağlam olmaq: Oğlanın qırq gündə yarası önəldi, *sapasağ* oldı (39); Dəlinin, əli həq əmrilə *sapasağ* oldı (56).

SARA-SARA f.bağl. Sarıya-sarıya: Çobanı bir ağaca *sara-sara* möhkəm bağladı (46).
SARAY is.Tövlə: Məgər, sultanım, genə yazın buğayı *saraydan* çıxardılar? (36).
SARARMAQ f. Saralmaq, sarı rəng almaq, sarı olmaq: Gördi bənzi *sararmış*, dilbəndi boğazına keçmiş (105); Əmma qızın₁ dərdindən bənizi *sarardı* (98).
SARARTMAQ f. Saraltmaq: ...ya Əzrayil, var ol, dəxi dəli qavatın₁ gözinə görüngil, bənzini *sarartğıl*! - dedi (79).
SARB sif. Çətin, asan olmayan: *Sarb* yerlərdə yapılmış kafər şəhri (118); *Sarb* yürürkən Qazlıq ata namərd yigit yenə bilməz, binincə binməsə, yeg! (32).
SARVAN is.fars. Karvan başçısı; dəvəçi: Evin₁iz ardınca *sarvanlar* sanar baqar onlar (64); *Sarvanlar* ögin aldı, döndərəməz (112).
SARI I sif. Sarı: *Sarı* yılan soqmadan ağca tənüm qalqar-şişər (72); Cəm'i yanında olan qızlar al geymişlərdi, kəndü *sarı* geymiş idi (87).
SARI II is. Təxəllüs: İlək qoca oğlı *Sarı* Qalmaş Qazan bəgün₁ evi üzərinə şəhid oldı (43); Aruzın₁ bir çobanı vardı, Qon₁ur qoca *Sarı* çoban deərlərdi (98).
SARIQ is. Çalma. Beyrəgin babası qaba *sarıq* götürüb yerə çaldı (57); Qazan bəgə gəldilər, *sarıqların* yerə urdular (125).
SARILMAQ f. Bir-birini qucaqlamaq, qucaqlaşmaq: Qız aydır: "Qılıcın₁ geydir, yigit, murad ver, murad al, *sarılalım*!" - dedi (112).
SARINMAQ f.qay.n. Bürünmək, örtünmək: Anam mənim içün gög geyüb, qara *sarınsun*! (75); Qırq-əlli yigit qara geyüb - gög *sarındılar* (125).
SARMAQ f. Sarımaq, bürümək: Aruz aldı bu oğlanı, ətəginə *sardı* (99); Qaftanı altından ayağın bərk *sardı* (at) var qüvvətilə atının₁ yelisinə düşdi (105); Qanturalı altunlu incə kətan bezin belinə *sardı* (87).
SARMAŞMAQ f.qarş.n. Qucaqlaşmaq, bir-birinə sarılmaq: Topuğında *sarmaşanda* qara saçlum! (35); İki pəhləvan olub, bir-birinə *sarmaşdılar* (55).
SARP sif. Keçilməsi, üstünə çıxılması çox çətin olan; çox dik, sıldırım, yalçın: *Sarp* qayalar oynanmadı, yer oyruldı (40).



SARSILMAQ f. Tə'sirli, kədərli bir xəbərdən, işdən, hadisədən və s.-dən çox böyük həyəcan keçirmək, ruhi əzab çəkmək, sarsıntı keçirmək: Qara bağrın₁ *sarsılubdır* "ağa!" - deyü nə ağlarsan, nə bozlarsan? (61); Qara bağrı *sarsıldı*, düm yürəgi oynadı (72).
SASI sif. Murdar: Ağam Qazan, *sası* dinlü Gürcüstan ağzında oturarsan, ordun₁ üstinə kimi qorsan? (42).
SAÇ is. Saç: Qarğu kibi qara *saçım* uzanır gördüm, uzanıban gözümi örtür gördüm (44); Toquz qara gözlü, xub yüzlü, *saçı* ardına urulu, köksi qızıl dügməli, əlləri biləgindən qınalı, barmaqları nigarlı məhbub kafər qızları Qalın Oğuz bəglərinə sağraq sürüb içərlərdi (42).
SAÇLI//SAÇLU sif. Başında saçı olan: Qurması qırq tutam qara *saçlım*! (93); Toquz qara gözli, örmə *saçlı*, əlləri biləgindən qınalı, parmaqları nigarlı, boğazları birər qarış kafər qızları al şərabı altun ayağla Qalın Oğuz bəglərinə gəzdirirlərdi (68); Topuğında sarmaşanda qara *saçlum* (35); Yedi bin₁ qaftanının₁ ardı yırtıxlu, yarımından qara *saçlu*, sası dinlü, din düşməni alaca atlu kafər bindi yılğadı... (42).
SAÇ-SAQAL is. Başda, üzdə olan tüklər: *Saçı-saqalın* yoldilər (11).
SEVİNDİRMƏK f. Sevindirmək: *Sevindirdin₁* yerindirmə, ozan, məni! - dedi (62); Üç günə varmasun, Allah *sevindirsün* sizi! - dedi (62).
SEVİNİ-QIVANI z. Sevincək, fərəhlə: Qanlı qoca *sevini-qıvanı* urı turdı (85).
SEVİNMƏK f. Sevinmək: Solına baqdı, çoq *sevindi* (68); Qalın Oğuz bəgləri bunı eşitdilər, şad olub *sevindilər* (52); Aruz *sevindi* (100).
SEVİNC is. *Sevinc vermək* - Şadlandırmaq: Atasına Basatın₁ *sevinc verdi* (103).
SEVİŞMƏK f.qarş.n. Bir-birini sevmək: *Sevişdigim* Bamsı Beyrək, sən degilsən (65).
SEVGİ is. Sevgi: Xan babamın₁ göygüsi, Qadın anamın *sevgisi* (72).
SEVGİLİ sif. Çox sevilən, əzizlənən, istənilən, əziz. *Sevgili* qardaş görkli (33).
SEVMƏK f. Sevmək: Könlün₁ kimi *sevərsə*, Sən an₁a varğıl (83); Tez *sevdin*, tez usandın, qavat oğlı qavat! (92).

SEYRAN is.ər., fars. Seyr etmə, baxma, tamaşa etmə: Tən,ri verən tatlu canın, *seyranda* imiş, endi, dəxi (39); Məgər ol dəm Bayındır xan bəglər ilə *seyrana* yetmişlərdi (98).

SEYRƏK sif. Seyrək: Biləgində toqsan oqı *seyrək* oğlan! (107).

SELCAN is. Antr. Sarı tonlı *Selcan* xatun köşkdən baqar (90).

SELCİK//SELCÜK is. Antr. Ulu qardaşın adı Qıyan *Selcikdir* (98); Qıyan *Selcük* oğlı Dəli Tondaz aydır (42); Oğlı Qıyan *Selcugin*, ödi yarıldı (99).

SEPARƏ is.fars. Otuz hissə (Qur'anın 30 cüzvünü bildirir); Axır *separə* başıdır, əmmə görkli (32).

SEÇDİRMƏK f.icb.n. Seçdirmək: Yügrək olan atlarun, tavlasından, O zalım *seçdirdi* ola, qardaş! (100).

SEÇİLMƏK f. Fərqlənmək: nəzərə çarpmaq: yüz kafər *seçilüb* oğlanın, üzərinə gəlmiş (107); Yüz adam *seçilün*, taraqa çatladın, oğlanı qorqudın (107); Aqli, qaralı *seçilən* çağda (37)

SEÇMƏK f. Seçmək: Bin ayğır *seçdi* (56-57); İçin qara donlu, gög dəmirlü altı yüz kafər *seçdi* (90); Aqlı, qaralı *seçən* çağda (34).

SƏBƏB is.ər. Səbəb: *Səbəb* nədir, degil man,a (68); Evin yağmalatdığın, dəm Taş Oğuz bilə bulınmadı, *səbəb* oldur, - dedi (123); Xan qızı, *səbəbi* nədir, degil man,a! (35).

SƏDDƏQNA əd. ər. Biz sənə sadiq olduq: Aydır: "Amənna və *Səddəqna*! (91).

SƏDƏQƏ is.ər. Yoxsula, dilənçiyə verilən pul, şey: Qara başın, *sədəqəsi*, yigit, mədəd man,a! - dedi (53); Ağanızın başı və gözi *sədəqəsi*, köhnə qafanın,uz var isə, geyəyin, dügünə varayın (62).

SƏKSƏN s. Səksən, həştad: *Səksən* yerdə badyələr qurulmışdı (42).

SƏKSƏN BİN s. həştad min - 80 000. *Səksən bin* ər gördümsə, səksənmədim (117).

SƏKSƏNMƏK f. Diksinmək. Hövlnak durmaq: Səksən bin ər gördümsə, *səksənmədim* (117).

SƏGİRDİŞ is. (at) çapmaq: "Baban, dedi, keyikləri qovsun gətürsün, bənim ögimdə dəpləsün, oğlumın, at *səgirdişin*, qılıc çalışın, oq atışın görəyim, sevinəyim, qıvanayım-güvənəyim" - dedi, - dedilər (37).



SƏGİRTMƏK f. Çapmaq, dördnala sürmək (atı): Çoban qoyunun, ögünə *səgirtdi* (98); Dəlü Qarçar *səgirdərək* suya düşdi (57); Xanım baba, qorxuram *səgirdərkən* Qon,ur atın, sürücdirəsən (74); Güni gəldi, ağ meydanda *səgirdərin* sənin, içün! (...)

SƏGRƏK is. Antr. *Səgrək* məst oldı (110).

SƏGRİMƏK f. Gözün əsməsi, titrəməsi: Çıqsun bənim kor gözüm, a Dirsə xan, yaman *səgrir* (38).

SƏLAM is.ər. B a x: Salam: Səlam vermək - bir-biri ilə görüşərkən "salam" deyib təbrik etmək: Baş endirüb, *səlam verdilər* (53); Döndüm ol ərə *səlam verdim* (95); Qılbaş gəlüb Aruza *səlam verdi*, aydır (123).

SƏLAMLAMAQ f. Salam vermək: Bəglər gəlür Qazanı *səlamlar*, gedərdi (124).

SƏLVİ sif. Sərv: Evdən çıqub yüriyəndə *səlvi* boylum! (35).

SƏLCÜK is. Antr. B a x: Selcik//Selcük: Dəmir qapu Dərvəndəki dəmür qapuyı dəpüb alan, altmış tutam ala göndərinin ucında ər bögürdən Qıyan *Səlcük* oğlı Dəlü Dondarçapar yetdi (49).

SƏMƏD is.ər. Allahın adlarından biri - hər yeri tutan deməkdir: Qamu yerdə əhədsən, Allahü *səmədsən*! (96).

SƏN əv. Sən: "*Səndənmidir*, bəndənmidir, Tənri-təala bizə bir yetman oğıl verməz, nədəndir?" - dedi (35).

SƏPMƏK f. Səpmək: Bitəkəllüf kafərlər at dəpdilər, ox *səpdilər* (43).

SƏRVƏR is.fars Başçı, rəis, rəhbər: Tən,ri dostı, din *sərvəri* Məhəmməd görkli! (32); Alimlər *sərvəri* Osman Üffan oğlı, görkli (32); Gözəllər *sərvəri* Sarı tonlı Selcan xatunı alsam... (87).

SƏRİMSAQ is. Sarımsaq: *Sərimsaq* otın yemədin, Qazan, içüm göynər (72).

SƏRMƏK f.(yerə) yıxmaq: Şimdi yigidi atar-yıqar, *sərərpırtar* (87).

SƏRMƏMƏK f. Ayılmaq, qurcalanmaq: Qanturalı *sərmədi*, oyandı; uru turdı (91).

SƏRMƏRMƏK f. Ayılmaq, qurcalanmaq: Vaqeəsindən *sərmərdi* uru turdı (43); Oğlan *sərmərdi* uru turdı (114).

SƏRMÜZƏ is. Başmaq: Yoxsa a Qazan, ayağımdan *sərmüzə* atayınmı? (73).

SƏRPƏ-SƏRPƏ fe'li bağl. Büdrəyə-büdrəyə: Gürzlə dögişdilər, qara polad uz qılıc ilə tartışdılar, *sərpə-sərpə* meydanda qılıclaşdılar (108-109).

SƏRPMƏK f. Yana atmaq: Qanturalı niqabın *sərpdi* (87).

SƏRXOŞ sif., fars. İçmiş, kefli: Qorqma, qayırma, bəg *sərxoşdur*, cavab verməz, - dedilər (38); *Sərxoş* yigit həm eki canvərlə savaşmışdı (89); Alplar başı Qazan oğlancuq ilə *sərxoş* olub, yaturlar, - dedi (69).

SƏRHƏD//SƏRHƏDD is., fars. və ər. Sərhəd: Kafərin$_1$ *sərhədinə* irdilər (87); Qaçan sən məni alub kafər *sərhəddinə* çıqardın$_1$, qılıc çalub baş kəsdin? (69).

SƏRHƏNG is., fars. Başçı: Canvərlər *sərhəngi* dəvədir (89).

SƏRÇEŞMƏ is., fars. Bulaq: Kəsər gündə *sərçeşmə* yügrək yaxşı (96).

SƏTTAR sif., ər. Örtən: Baqi qalan *səttar* Tən$_1$ri, Mənim canımı alur olsan$_1$, sən alğıl! (81).

SƏFA is., ər. Zövq, nəş'ə, ləzzət, kef; rahatlıq (adətən fe'llərlə işlənir): Dölin almaqdan *səfan$_1$* varsa, Şökli Məlik, qara gözlü qızın varsa, götür Qazana ver! (49).

SƏXT sif., fars. Bərk. Burada: pərt, əsəbi: Neçün *səxtsən*, xanım yigit? (59); □ *Səxt olmaq* - pərt olmaq, tutulmaq, əsəbiləşmək: Bayındır xan qatı *səxt oldı* (104); Böylə digəc bazırganlar *səxt oldı* (53); Niyə *səxt oldunuz*? (57).

SƏHABƏ is., ər. Tərəfdar (Məhəmməd Peyğəmbərin tərəfdarları). Varıban peyğəmbərin$_1$ yüzini görən, gəlübəni Oğuzda *səhabəsi* olan, acığı tutanda bığlarından qan çıqan bığı qanlu Bügdüz Əmən çapar yetdi (50).

SİDQ is.ər. Sədaqət, səmimilik, ürək təmizliyi: Ol Məkkəyə sağ varsa, əsən gəlsə, *sidqi* bitün hacı görkli (32).

SİDDİQ is., ər. Saflıq, ürək təmizliyi, doğruluq: Məhəmmədin$_1$ sağ yanında namaz qılan Əbubəkr *siddiq* görklü! (32).

SİZ əv. Siz: *Siz* yegün$_1$iz-içün$_1$iz, söhbətin$_1$üz tağıtman$_1$uz (69); Dövlətsiz şərrindən Allah saqlasun, xanım, *sizi*! (32).

SİLMƏK f. 1) Dəsmal və s. ilə təmizləmək: Yenümlə alnum qanın bən *siləyin* (46); Turmaz qanın *silər* (91); 2) Sürtmək: Dəstmalı gözinə *silcək*, Allah-təalanın$_1$ qüdrətilə gözi açıldı (66).

SİMÜZ sif. Kök: *Simüz* qoyun, arıq toqlı sənin$_1$ qapun$_1$dan kafərlərə vermədim (46); Qarma-bükəc *simüzin* alub tutan (45).

SİN-SİN zərf. Əyilərək, büzülərək: Köpək Qazanın$_1$ atının$_1$ ayağına çap-çap düşər, *sin-sin* sin$_1$lər (45).

SİNƏG//SİN$_1$ƏK is. Milçək, çibin: Ərkəg *sinəgi* üzərimə qondırmıyam (112); "Bu yerin$_1$ *sin$_1$əgi* bizi üşəndirdi!" - dedi (101).

SİN$_1$İRLƏMƏK f. Əsəbiləşdirmək, hürkütmək: Otağın$_1$ ögində irişi gəldi, keyiki *sin$_1$irlədi* (54).

SİN$_1$İRLİ sif. Əsəbi: Dirsə xan Qorqut *sin$_1$irli* qatı yayın əlinə aldı (37).

SİN$_1$LƏMƏK f. Əyilmək, qorxub büzülmək, əyilərək zingildəmək: Köpək Qazanın$_1$ atının$_1$ ayağına çap-çap düşər, sin$_1$-sin$_1$ *sin$_1$lər* (45).

SİRR is.ər. Sirr: Kişi qoynında yatan həlalına *sirrin* deməzmi olur? (106).

SİCİM is. Yundan, keçi qılından əyrilmiş ip: Qıl *sicim* ağ boynına taqdılar (40); Qara qıldan *sicim* boynına taqılu, degil! (75).

SIQINMAQ//SIĞINMAQ//SIĞUNMAQ f. Bir təhlükədən e'tibarlı bir yerdə gizlənmək və ya birinə pənah gətirmək, himayəsi altına girmək: Dədənin$_1$ anısı anıtdı, Tən$_1$riyə *sıqındı* (56); San$_1$a *sığındım* comərdlər comərdi, ğəni Tən$_1$ri, məded! - dedi (89); Tar ətün$_1$ə, gen qoltuğına *sığınu* gəlmişəm (87); Birligün$_1$ə *sığındım*, çələbilə, qadir-Tən$_1$ri (96); Yaradan qadir Tən$_1$riyə *sığundım* (89).

SIQLAMAQ f. Ağlamaq, hönkürmək: Ağladı, sıqladı (44); Qartaş /deyü/ *sıqlayanda* yoldaşıma yazıx! (48); Ağlayıbanı-*sıqlayıbanı* evinə gəldi (57).

SIQMAQ f. Sıxmaq: Oğlanın$_1$ anası əmcəgin bir *sıqdı*, südi gəlmədi (39); Ol üzümi *sıqırlar*, al şərabı olur (80).

SIMAQ f. 1) məc. Sözü yerə salmaq: Oğlan anasının$_1$ sözin *sımadı* (40); Uruz babasının$_1$ sözin *sımadı*, qayıdub gerü döndi (71); 2) məc. Danmaq, təhqir etmək: Qılıcından sıparım yoq! Kəndü əslim, kəndü kökim *sımağım* yoq! - dedi (117).

SIĞAMAQ f. Sığallamaq. Əllərini-barmaqlarını bir şeyin üzərində xəfifcə gəzdirərək onu tumarlamaq: Üç qatla yarasın əlilə *sığadı* (39); Ağ bilək$_1$lərini *sığadı* (87); Hər birinin başların$_1$ *sığadı* (101).

SIĞIN is. Maral: Av avlayalım, quş quşlayalım, *sığın*, keyik yıqalum, qayıdalım otağımıza düşəlim (42).

SIĞIN-KEYİK is. Maral-ceyran: Baqdı gördi ki, bir sultan simüz *sığın-keyikdir* (54); Sənin$_1$ odan$_1$ üzərinə *sığın-keyik* yıqmadımmı? (65); Qulanla *sığın-keyikə* qon$_1$şı yurdım! (44).

SIĞMAQ f. Yerləşmək, girə bilmək: Qoşa badam *sığmayan* tar ağızlum! (35); Avcına *sığmayan* əlüklü oxlı (100).

SIĞIR is. Maral: Gördi kim, oğrı köpək, yekə tana evini bir-birinə qatmış - tauq komasına, *sığır* tamına dönmüş (33); Qara *sığırı* soqmanı tolu qan oldı (96).

SIĞIRTMAC is. Malotaran: Məgər bir *sığırtmacları* vardı (120).

SIZLAMAQ f. Ağrımaq: Kəsilsün oğlan əmən süd tamarım yaman *sızlar* (38).

SIZLATMAQ f.icb.n. Ağrıtmaq, incitmək: Ağca yüzlü anamı *Sızlatdın$_1$* ola, qardaş! (100); Qarıcıq olmuş anamı *sızlatmağıñ* (74).

SIZMAQ f. Bir şeyin arasından, məsamələrindən yavaş-yavaş, damcı-damcı sızıb çıxmaq, keçmək: Adam içməyən acı sular *sızınca* sızmasa, yeg (32).

SIYIRMAQ f. Çıxarmaq: Həsud kafərlər bağlamadılar, yülərin *sıyırıb* salı verdilər (89); Qara qılıcın *sıyırdı* (80); Qalqanını ovatdı, tuğulqasını yoğurdu, qapaqların *sıyırdı*, oğlanı alımadı (108); Qaftanı *sıyırdı* götürdi, qızların$_1$ üstinə atı verdi (62).

SINAMAQ f. Yoxlamaq, təcrübədən, sınaqdan keçirmək: Öz canıma qıyam, mən sana qıymayam, Mən səni *sınardım*, - dedi (93); Mən sənin$_1$ dostlığın - düşmənlığın$_1$ *sınayu* gəldim (123).

SINDIRMAQ f. 1) Məğlub etmək, diz çökdürmək: Sən yalın$_1$uz gözlə mən Oğuzı *sındırmışdım* (102); 2) Təhqir etmək, xəyanət etmək. Aydır: "Gəlün$_1$ Qazan$_1$ı quyudan çıqarun$_1$, bizi ögsün, Oğuzı *sındırsun*" (117); Ağan$_1$ Qazanın$_1$ namusını *sındırayınmı*? (47).

SINIQ sif. Sınıq: Əlindəki sügüsi *sınıq* oğlan! (107).



SINMAQ f. 1) Parçalanmaq, qırılmaq: Ayağının$_1$ *sındığunı* kimsəyə deməDI (106); Sağ oylağı qayaya toqındı, *sındı* (105); "Görklüm, atdan düşdüm, ayağım *sındı*" - dedi (106); 2) Məğlub olmaq, basılmaq: Yağı basıldı, düşmən *sındı* (92); 3) Zədələnmək: Qıyan Selcik ödi *sındı*, can verdi (100).

SIRAVARDI zərf. Növbə ilə: Qırq günə dəkin *sıravardı* geyogüz (57).

SIRILUR is. Sıyrılan. Burada: qılıncın qınından çıxarılması prosesi nəzərdə tutulur: Nə yerdə *sırılur* varsa, çəkən bilür (32).

SIRÇA sif. Kiçik (barmaq): "Oğlım idigin andan biləyim, *sırça* parmağını qanatsun, qınını dəstmala dürtsün, gözimə sürəyin: açılacaq olursa, oğlım Beyrəkdir!" - dedi (66).

SIÇRAMAQ//SIÇRIMAQ f. Atılmaq, tullanmaq, hoppanmaq: *Sıçrayüb* şahün kibi kafərin boğazın ələ aldı (109); Dəpəgöz *sıçradı* baqdı (101); Haman qız *sıçradı*, ata mindi (65); Qaraquc atına *sıçrıyub* bindi (113).

SOVĞULMAQ f. Qurumaq: Qanlu-qanlu suların *sovğulmışdı*, çağladı, axır! (66).

SOQMAN is. Çəkmə: Qara sığırı *soqmanı* tolu qan oldı (96).

SOQMAQ f. 1) Soxmaq, içəri salmaq: Dəpəgöz günbədə əlin *soqdı* (102); Əsləmədi, biləgindən bir tutam ox çıqardı, belinə *soqdı* (101); 2) Çalmaq (ilan haqqında): Səndən son$_1$ra bir yigidi sevib Varsam, bilə yatsam, Ala yılan olub, məni *soqsun*! (83); Sarı yılan *soqmadan* ağca tənüm qalqar-şişər (72).

SOĞAN is. Soğan: Yanmış arpa əmtəgi, acı *soğan* öyni degil! (75).

SOY I is. Nəsil, əsl-nəcabət, mənşə: Ol Ayişə, Fatimə *soyıdır*, xanım (33); Amit *soyının$_1$* aslanı, Qaraçuğın$_1$ qaplanı! (63).

SOY//SOYI II is. Mahnı: Bir *soy* dəxi soylamış, aydır (117); Boy boyladı, *soyı* soyladı (91).

SOYMAQ f. Soyundurmaq, çılpaq etmək: "Bu yigidi anadan toğma *soyun*!". *Soydılar* (87).

SOYLAMA is. Mahnı: *Soylama*, Aydır (35).

SOYLAMAQ f. Mahnı oxumaq: Çağırıb xatunına *soylar*, görəlim, xanım, nə soylar (34); Dədə Qorqud *soylamış* (31).

SOL zərf. Sol tərəf: Üç kişi sağ yanından, üç kişi *sol* yanından dəmür zəncirlə buğayı tutmışlardı (36); Cılasun yigitlərlə Qaragünə oğlı Dəli Budaq *soldan* dəpdi (50).

SOLDIRAN f. fe'li sif.; Solduran, solğun edən, solğunlaşdıran: Qarılar dörd dürlidü: birisi *soldıran* soydır (33).

SOLMAQ f. Zəifləmək: Küt-küt buğa *solmağa* başladı (88); Qunt-qunt biləklərin, *solmasaydı,* "Ağam Beyrək" diyədəm, ozan, san,a! (62).

SON is. Axır, aqibət, nəticə: yarınkı gün zəman dönib, bən əlib sən qalıcaq tacım-taxtım san,a vermiyələr, - deyü *sonımı* andım, ağladım, oğul! - dedi (69); Axır - *sonı* arı imandan ayırmasun! (78)

SON,RA qoş. Arxasınca, ardınca, dalınca: Andan *son,ra* Qazan ilə işümiz xeyir ola! - dedi (124); Öylədən *son,ra* evinə gəldi (33); Bir neçə müddətdən *son,ra* bir oğlan toğurdı (35); Qarnın toyurdıqdan *son,ra* qazanları dəpdi-döndi, çevirdi (64).

SON, UCI modal s. Nəhayət: gəlümlü-gedimlü dünya. *Son,* ucı ölümlü dünya! (122); Axır - *son,* ucı ölümlü dünya! (50).

SORMAQ I f. Soruşmaq, xəbər almaq: Xəbər *sordılar,* görəlim, necə *sordılar* (91); Varun,, *sorun,,* oğlan Bəkilin, nəsidir? (108); Gələndən-gedəndən xəbər *soram* (112).

SORMAQ II f. Dil və dodaqların hərəkətilə mayeni yemək; sormaq: Bir *sordı,* olanca südin aldı (99); Sultanım Qanturalı, Ağca sazlar içində Sarı genlər görübən qanın *soran* (88).

SORULMAQ f. məc.n. Soruşulmaq, xəbər alınmaq, tələb edilmək: - Baba, içində bəg yigitlər öldürsələr, qan *sorulanmı,* də'vilərlərmi? (70).

SORUŞMAQ f.qar.n. Bir-birinin dodağını sormaq: Tatlu dəmağ verübən *soruşdılar* (93); Tatlu dəmağ verüb *soruşduğım,* Bir yasdıqda baş qoyub əmişdigim (93).

SOUQ sif. Soyuq: *Souq* sularını sorar olsam, içət kimün,? (61); Biləgindən on parmağını *souq* almış (65).

SOUQ-SOUQ sif. Soyuq-soyuq: *Souq-souq* suları sorar olsan,, Ağam Beyrəgin içədiydi (61); *Souq-souq* binarlarım gərəksə, an,a içət olsun! (81).

SOUĞILMAQ f. Azalmaq, qurumaq: Aqındılı görklü suyın, *souğılmışdı,* çağladı, axır! (111).



SOFYA is. B a x: Aya Sofya: Yol üzərində kafərin, Aya *Sofyası* vardı (119).

SÖZ ic. *Sözün tutmaq,* sözünə əməl etmək: Hər nə ki buyursa, qəbul edərlərdi; *sözin* tutıb təmam edərlərdi (31); *Sözi sınmaq* - sözü yerə salmaq: Oğlan anasının *sözin sınadı* (40).

SÖYKƏNMƏK f. Söykənmək: Oğlı Uruz qarşusında yay *söykənib* turardı (68).

SÖYLƏMƏK f. Demək: Ğaibdən dürlü xəbər *söylərdi* (31).

SÖYLƏŞMƏK f.qar.n. Bir işin necə edilməsi haqqında danışmaq, müzakirə etmək, söhbətləşmək, məsləhətləşmək: Ağca yüzlü görklün,lə *söyləşməzsən,* nədir halın? - dedi (105); Ocağını söyündürün, - deyü *söyləşdilər* (74); *Söyləşdilər* fısıl-fısıl (47).

SÖYÜNDÜRMƏK f. Söndürmək: Ocağını *söyündürün,* - deyü söyləşdilər (74).

SÖKMƏK f. Qurulmuş bir şeyi uçurtmaq, dağıtmaq, yıxmaq: Arqasını urıb, bərk ağılın, ardın *sökən!* (45); Ala yılan *sökməz* ormanını Çaqmaq çaqub oda uram (86).

SÖGMƏK f. Söymək. Nalayiq, pis, ədəbsiz sözlərlə təhqir etmək: Ağ saqallu qocanın, ağzın *sögdi* (37); Aruz, Dəpəgözi dögdi-*sögdi,* yasaq eylədi, əsləmədi (99); Mənim ağzuma *sögüb* durarsan, duyamadım (60).

SÖGÜLÜ cif. Sevgili. Çox sevilən, əzizlənən, istənilən; əziz, mehriban: Məndən əziz, məndən *sögülü* anan,dır, oğul, anan,a var! - dedi (82).

SÖMƏK f. Sevmək. Eşq yetirmək, aşiq olmaq: Kön,ül verüb *södügim,* Qalqubanı yerin,dən turı gəldin (105).

SÖHBƏT is. şifahi fikir, mə'lumat mübadiləsi; danışıq, müsahibə, ixtilaf: Baybörənin, dəxi Bayındır xanın, *söhbətinə* gəlmişdi (52); Toqsan tümən gənc oğuz *söhbətinə* dərilmişdi (68); Alar sabalı Dirsə xan Qalqubanı yerindən uru turıb, qırq yigidin boyına alub, Bayındır xanın, *söhbətinə* gəlürdi (34); □ *söhbət eyləmək//etmək* - bir yerdə danışmaq: Anasilə *söhbət eylədi* (37); Günlərdə bir gün yegnək oturub bəglər ilə *söhbət edərkən* Qaragünə oğlı Budağilə uz düşmədi (94).

SU is. Ulaşuban *sular* taşsa, dən,iz tolmaz (31).

SULTAN is. Hökmdar: Məgər *sultanım,* genə yazın buğayı saraydan çıxardılar (36).

SUM sif. Xalis, tamam: Qayın tolı yeləgümdən *sum* altunlı mənim oxım (95).
SUNQUR is. Şunqar (quş); Ağ *sunqur* quşı erkəgində bir köküm var, Ala ördək, qara qazun, uçurmıya (119).
SUNMAQ f. Dürtmək, vermək: Basat qoçın, başınıDəpəgözün əlinə *sundı* (101).
SURAHİ is. ər. Su və ya şərab tökmək üçün uzunboğaz şüşə qab: Altun ayaq *surahilər* dizilmişdi (68).
SURƏT is.ər. Zahiri görünüş, şəkil: Bazırgan *surətində* qatır-dəvə çəkdilər, gəldilər (119).
SURNAÇI is. Zurnaçı: *Surnaçıları* qovdı, nəqaraçuları qovdı (64).
SUSANMAQ f. Bir şeyin həsrətində, arzusunda olmaq: Uruz aydır: "Mərə, hərzə-mərzə söyləmə. Qanın,a *susanma*, gəl and iç!" - dedi (124).
SUFİ SANDAL MƏLİK is. Antr. Ağ Məlik Çeşmə qızına nigah edən *Sufi Sandal Məlikə* qan qusdıran, qırq cübbə bürünüb otuz yedi qəl'ə bəyinin, məhbub qızlarını çalub bir-bir boynın qucan, yüzində-todağında öpən İlək qoca oğlı Alb Ərən çapar yetdi (50).
SUÇ is. Günah. Bənim *suçum* nə oldı kim, qara otağa qondurdı? - dedi (34); Qazlıq tağının, *suçı* yoqdır (39).
SUÇU is. Su ilə məşğul olan adam: Quru-quru çaylara *suçu* saldım (38).
SÜD is. Süd: Kəsilsün oğlan əmən *süd* tamarım yaman sızlar (38); Ağ *südin* toya əmzirsə, ana görkli (33).
SÜGİLİK is. Şiş, kabab şişi: *Sügiligi* ocağa bıraqdılar, qızdı (101); *Sügiligi* Dəpəgözün, gözünə eylə basdı kim, Dəpəgözün, gözi həlak oldı (101).
SÜGSÜN is. Boyun: *Sügsünindən* tutdı, belini üzdi (89).
SÜGÜ is. Ucuşiş silah: *Sügüylə* sancdılar, ilmədi (99); Gördi gəlin at üzərində geyinmiş, *sügüsi* əlində (91); Uruz gen, yaqadan *sügüsin* sancdı, turdi (71).
SÜMÜRMƏK f. Sümürmək: Aydır: "Xanım, sazdan bir aslan çıqar, at urar, apul-apul yürüyişi adam kibi. At basuban, qan *sümürər*" (98).
SÜNİC is. Nişan edilmiş: Əgər bəglər keyik alsa, qulağı dəlük olsa, "Bəkil *sünicidir*", - deyü Bəkilə göndərərlərdi (104).



SÜNMƏK f. Uzanmaq, çəkilib uzanmaq: Bir qoc yerindən qalqdı, görinüb *sündi* (101).
SÜN,ÜK is. Sümük: *Sün,üklərim* tuz kibi oldı (80); *Sün,ükləri* xurd oldı (88).
SÜN,ÜCİK is. Qol-qıç: Ol ikicə *sün,ücigin* uzun olmış, yığışdır, axı!...(39).
SÜR sif. Sivri: Altmış tutam *sür* cidasın qoltuq qısub, ol kafəri qarşusından süsəm, - dedi, süsəmədi (96); Ala uran *sür* cidalar süsəldi (71); Ala uran *sür* cidamı saqlardım bu gün içün (70).
SÜRAHİ is.ər. Qədəh. Su və ya şərab tökmək üçün uzunboğaz şüşə qab: Altun ayaq *sürahilər* düzülmüşdi (42).
SÜRİ is. Sürü: Gördilər, bir *süri* qaz oturar (116).
SÜRİYİ-SÜRİYİ f.bağ. Sürüyə-sürüyə: *Sürüyi-sürüyi* mağara qapusına gəldi (103).
SÜRİLMƏK f.məc.n. Qovulmaq, aparılmaq: İşdə *sürilib* gidə yürir (31).
SÜRİCMƏK f. Sürüşmək, Hamar, sürüşkən səth üzərində hərəkət etmək: Av avlıyub, quş quşlıyub gəzərkən bun,aldı, *süricdi*, məni yerə çaldı, Sağ oyluğım sındı (106).
SÜRMƏK f. 1) Heyvanı (atı) yeriməyə təhrik etmək: Həman burada Qazan at meydana *sürdi*, qırım dilədi (120); At *sürüb*, bu yigidin, üzərinə gəldi (113); 2) Hücum etmək: Buğa oğlana *sürdi*, gerü gəldi (36); Nagahandan Oğuzun, üzərinə bir *sürdi*, keyik gəldi (54); Buğa dəxi oğlana *sürdi* - gəldi (36); 3) Qovmaq: Yedi qatla Oğuzı yerindən *sürdi* (100); Şeytana lə'nət qıldın, Bir suçdan ötri dərgahdan *sürdün* (96); 4) Yola düşmək, getmək: Kəndüyi dolüligə bıraqdı, *sürdi* dügünə gəldi (63); Qayıduban baba, gerü döngil! Altun ban evin,ə *sürüb* vargıl! (74); 5) İtələmək: Oğlan bu qatma buğanın, alnına yumrığını tayadı, *sürdi* meydanın, başına çıqardı (36); 6) Sürümək: Qıl orğan ağ boynına taqdılar. Yüzi üzərinə saluban *sürdilər* (71); 7) Kəsmək, sürtmək: Qıl kəpənək boyuncuğın *sürər*, degil! (75); ...qanını dəstmala dürtsün, gözimə *sürəyin*; açılacaq olursa, oğlım Beyrəkdir!" - dedi (66); 8) Süzmək (içki): Toquz qara gözlü, xub yüzlü, saçı ardına urulu, köksi qızıl dügməli, əlləri biləgindən qınalı, barmaqları nigarlı məhbub kafər qızları Qalın Oğuz bəglərinə sağraq *sürüb* içərlərdi (42).

SÜRMƏLİ//SÜRMƏLÜ is. top. Arpa çay axarında - indiki Naxçıvan Muxtar Respublikasının torpağında yerləşirdi. *Sürməli* həm də Şərqi Anadoluda və Cənubi Azərbaycanda Marağa səmtində yer adıdır: Ağca qala *Sürməlidə* at oynatdım (118); Ağca Qala *Sürməlüyə* gəlüb, Qazan qırq otaq dikdirdi (78).

SÜRÜCDİRMƏK f.icb.n. Sürüşdürmək: Xanım baba, qorxuram səgirdərkən Qonur atını *sürücdirəsən* (74).

SÜSƏGƏN sif. Buynuzu ilə vuran: Dəpəgən köbini *süsəgən* yırtar (113).

SÜSƏLMƏK f. Sancılmaq: Ala-ala göndərlər *süsəldi* (50); Ala uran sür cidalar *süsəldi* (71).

SÜSMƏK f. Buynuzu ilə vurmaq: Ağ ayılda ağca qoyun quzucığın *süsərmi* olur? (92); Altmış tutam sür cidasın qoltuq qısub, ol kafəri qarşusından *süsəm*, - dedi, *süsəmədi* (96).

SÜSİŞMƏK f. Döş-döşə gəlmək: Qarğu talı sügülər ilə qırışdılar, meydanda buğa kibi *süsişdilər*, köksləri dəlindi, sügüləri sındı, bir-birin alımadılar (109).

SÜFRƏ is. Yemək stolunun üstünə, yaxud yerə salınan xüsusi parçadan tikilmiş örtük: süfrə üstünə qoyulan yeməklər: Qılucumdanmı gördi, *süfrəmdənmi* gördi? (34); ◇ *süfrə çəkmək* - süfrə açmaq: Oğul atadan görməyincə *süfrə çəkməz* (31).

# T

TABUT is.ər. Tabut. Tavla-tavla şahbaz atun binər olsam, mənim *tabutum* olsun (83).

TAVIL//TAVUL is.ər. Nağara. Köpür-köpür *tavıllar*, nəqaralar çalındı (120); Kumbır-kumbır *tavıllar* çalında (71); Kumbır-kumbır *tavullar* dökülmədi (75).

TAVLA is. Tövlə. Av avlarkən babasının tavlası üzərinə gəldi (53); Tavla-tavla. *Tavla-tavla* şahbaz atları sorar olsam, binət kilsün (61).

TAVŞAN is. Dovşan. Uçardan qaz, tauq, yürürdən keyik, *tavşan* bu töləyə toldurub, Oğuz yigitlərinə bunı dam etmişdi (110).



TAQMAQ f. Taxmaq. Dəpəgöz aydır. "Mərə oğlan, al şol barmağımdakı yüzügi, parmağına *taq*, sana ox və qılıc kar eyləməsün" (101); Gəlün, Dirsə xanı tutalım, ağ əllərin bağlayalım, qıl sicim ağ boynuna *taqalım* (40).

TAQINMAQ f. Taxmaq. Dəpəgöz aydır: "Oğlan, yüzügi *taqındınmı*? Basat aydır: "Taqındım" (101).

TAĞ is. Dağ. Köksi gözəl qaya *tağlara* gün dəgəndə, Bəy yigitlər cılasınlar bir-birinə qoyulan çağda (34); Ala *tağda* çadırın-otağın dikdi (113).

TAĞARCIQ is. Dağarcıq - dəridən tikilən kiçik torba, çanta. Çoban *tağarcığı* çıqardı (46).

TAĞILMAQ f.məc. Yavaş-yavaş seyrəkləşərək, yayılaraq yox olmaq, çəkilib getmək. Bəglər həp *tağıldı* (125); Böylə dikəc Qazan aydır: Mənim avımı bozma, ləşgərimi *tağıtma* (44); Sağlı-sollu kafəri xub *tağıtdı* (71).

TAĞLAMAQ f. Dağlamaq, məc. Yandırmaq. Bağrımla yürəgim nə *tağlarsan*? (47).

TAZI is. Ov iti. Gördi kim, uçarda quzğun, *tazı* tolaşmış, yurtda qalmış (44); Gördilər kim, uçarda quzğun qalmış, *tazı* tolaşmış, yurtda qalmış (57).

TAYAĞ is. Dayaq: Evin dayağı Ozan, evin *tayağı* oldır ki, yazıdan-yabandan evə bir qonaq gəlsə, ər adam evdə olmasa, ol anı yedirər-içirər, ağırlar-əzizlər, göndərər (33); Bir tama dirək uğurlar, ol tama da *tayaq* olur.

TAYI is. Dayı. Altmış ərgəc dərisindən kürk eləsə, topuqlarını örtmiyən, altı ögəc dərisindən külci etsə, qulaqlarını örtmiyən, qolı-budı xırancə, uzun baldırları incə, Qazan bəgün *tayısı* At ağızlu Uruz qoca çapar yetdi: "Çal qılıncın, bəgüm Qazan, yetdim!" - dedi (50); Qızılbaş bir qaç adam ilə binür, Qazanın *tayısı* Aruzın evinə gəldi (123).

TAYAMAQ f. Dayamaq, dirəmək, söykəmək. Alnına yumruğın *tayadı*, sürdi meydanın başına çıqardı (88); Oğlan bu qatla buğanın alnına yumruğını *tayadı*, sürdi meydanın başına çıqardı (36).

TAYANMAQ f. Dayanmaq. Boz ayğır dəxi Beyrəgi görüb *tayandı* iki ayağının üzərinə turdı, kişnədi (60).

TAYINMAQ f. Sürüşmək. Sərxoş yigit həm iki canvərlə savaşmışdı. *Tayındı*, düşdi (89).

TAL is. Budaq. Qarğu *talı* sügüni mana vergil, Göksündən ər sancayım sənin içün! (107); Qayın *talı* yeləgümdən sum altunlu mənim oxım! (96).

TAL is. Kürək. Üzəngiyə qalqıb, qatı çəkdi, üz atdı: oğlanı iki *talusının* arasında urub çıqdı, yıqdı (37).

TALATMAQ f. Dalatmaq, qapmaq, dişləmək. Ağ yeləklü ötgün oxdan qayıqmıyan, canvərlər sərvəri qağan aslan qıran, Ala köpək itinə kəndözin *taladırmı*? (88).

TALBINMAQ f. Qanad çalmaq. Yumrığında *talbınanda* şahin quşuma yazıx! (48).

TAM is. Dam - ev. Oğlan fikir eylədi, aydur. Bir *tama* dirək ururlar, ol *tama* tayaq olur (36); Qara tonuz *tamında* yatur degil! (75).

TAMAR is. Damar. Kəsilsün oğlan əmən süd *tamarım* yaman sızlar (38).

TAMAŞA is.fars. Baxıb sur etmək: Tamaşa etmək. Qazan bəg baqub *tamaşa* edərdi (63).

TAN is. Sübh. Ala *tanla* yerindən turı gəldin, oğulı tutdurdunmı? (91); *Tan* yelləri salqum-salqum *tan* yelləri əsdigində (34).

TANA is. Dana. Çobanın üçyaşar *tana* dərisindən sapanının ayasıydı, üç keçi tüyindən sapanın qollarıydı (48); Gördi kim oğrı köpək, yekə *tana* evini bir-birinə qatmış-tauq komasına, sığır tamına dönmüş (33).

TANA SAZI. Qamışlıq adı. Bəyrəgin qorqusundan qaçdı, özini *Tana sazına* saldı (66).

TANIQ is. Şahid. Baybican bəg aydır: "Bəglər, allah-təala mana bir qız verəcək olursa, siz *tanıq* olun: mənim qızım Baybörə bəg oğlına beşikgətmə yavuqlı olsun!" - dedi (52); Ərəş *tanıq* olsun, kürsi *tanıq* olsun, yer *tanıq* olsun, Qədir Tənri *tanıq* olsun, mənim canım sənin canına qurban olsun! - dedi (83).

TANIMAQ f. Tanımaq. Biz bunı tanımazız. Adaqlısını aparın görsün. Ol yaxşı bilür. Gördi, *tanıdı* (58); Böylə digəc qız *tanıdı* - bildi kim Beyrəkdir (65).

TANIŞMAQ f. Danışmaq. Anunla *tanışdılar*. "Gölün kəsim kəsəlüm!" - dedilər (99).

TAR sif. Dar. Gen ətəgünə, *tar* qoltuğuna qısılmağa gəlmişəm (56); *Tar* ətünə gen qoltuğına sığınu gəlmişəm (87); *Tar ağızlu* - dar ağızlı. Qoşa badam sığmayan *tar ağızlum*! Güz almasına bənzəral yanaqlım (35).

TARAQLIĞ is. Belbağı. *Taraqlığı* boşaldı, gedisi mavıldı (87).

TARILMAQ f. Dartmaq. *Tarıyanda* bir oxla nəmlərdim? Dəlirənsüz oxla, yigit, səni sınar idim! (93).

TARTMAQ f. 1) Dartmaq. Bir şeyi özünə tərəf çəkmək. "Oldur! - dedi. *Tartdı* yaqasın yırtdı (58); 2) Gərmək, tarım çəkmək. Kafər aydır: "Mərə, varın Qazanın oğlı Uruzı *tartun* cəngələ asun (46).

TARTDIRMAQ f.icb.n. Çəkdirmək. Qırq incə bellü qız - oğlan ilə Qara ayğırın *tartdırdı*, bütün bindi (76).

TARTIŞMAQ f.qarş.n. Dartışdırmaq. Ağca tozlu qatı yaylar *tartışaydıq*, Ağ yeləklü ötgün oxlar atışaydıq (108); ...Qara polad üz qılıc ilə *tartışdılar*, sərlə-sərnə meydanda qılıclaşdılar...(109).

TAT is. etn. Saqalı uzın *tat* əri banladıqdi, gədəvi atlar issini görüb oğradıqda, Ağlı, qaralı seçən çağda... (34).

TATLU sif. Dadlı. *Tatlu* dəmağ şirin dəmah. Ala yorğan içində səninlə tolaşmadım, *Tatlu* dəmağ tutubanı soruşmayım (92); *Can tatlusu* - can işrinmun. Ağzunla yüzindən qan şorladaydım, *can tatlusın* sana göstərəydim (47).

TAUQ is. Toyuq. Gördi kim, oğrı köpək, yekə tana evini bir-birinə qatmış - *tauq* komasına, sığır tamına dönmüş (33).

TAC is.fars. Tac urmaq - tac vermək. Sən Adəmə *tac* urdun, Şeytana lə'nət qıldın, Bir sucdan ötri, Dərgahdan sürdün (109); *Tac*-təxt, Bəglər *tacım*-təxtim içün ağlaram (52).

TACİR is.ər. Ticarətlə məşğul olan adam. Atdan enüb *tacir* tonın geydilər (119).

TAŞ is. Daş. Üç yerdə dəpə kibi *taş* yığdı, ala qollı sapanın əlinə aldı (43); Taşa dönmək: Qaçar sənin geyiklərin Qazlıq tağı, Qaçar ikən qaçmaz olsun, *taşa dönsün*! (39); Daşa tutmaq: Bunlar ayıtdı: "Bazırganlarız" - dedilər. Kafərlər yalan söylərsiz, duc *taşa tutdılar* (120).

TAŞ-OĞUZ. Daş oğuz//Dış oğuz. Daş//Dış kənar deməkdir (kənarda olan oğuz tayfaları). İç oğuzun, *Taş oğuzun* bəglərin üstünə yığnaq emalı (35); Tollandı, *Taş oğuza* girdi (85).

TAŞQUN sif. Daşqın. Qara tağım yüksəgi oğul! Qanlı suyım *taşqunı* oğul! (74).

TAŞRA zərf. Kənar, bayır. Həman dəm günbəd yarıldı, yedi yerdən qapı açıldı. Birindən *taşra* gəldi (102).

TƏBSİRMƏK f. Səyrimək, hirsdən, acıqdan dodaqları əsmək, titrəmək. Böylə dikəc Qaracıq çobanın acığı tutdı, todaqları *təbsirdi* (49).

TƏKUR. Kafər. *Təkur* qarmalayıb zərb etdi (96); Məgər Trabuzan *təkurının* bir gim-gürklü məhbub qızı vardı (85).

TƏLƏB is.ər. Tələb eyləmək, bir şeyi israrla, qəti şəkildə istəmək və ya təklif etmək. Bir yigidin qara tağ yumrısınca malı olsa, yığar-dərər, *tələb* eylər, nəsibindən, artuğın yeyə bilməz (31).

TƏN is.fars. Bədən. "Oğul, sana ox batmasun, *tənüni* qılıc kəsməsün" - dedi (99).

TƏNƏFİ is. İp. Uzınca *tənəfi* görkli, oğıl görkli (33).

TƏNRİ is. Allah. Qadir *Tənri* verməyincə ər bayımaz (31).

TƏMAM is.ər. Tamamilə, büsbütün. Oğuzun ol kişi *təmam* bilicisiydi, nə diyərsə, olurdı (31); Oğuz Dəpəgöz əlində *təmam* zəbun oldı (99); Təmam etmək, yerinə yetirmək, başa çatdırmaq: Hər nə ki, buyursa, qəbul edərlərdi; sözin tutub *təmam* edərlərdi (31).

TƏMAŞA is.fars. Tamaşa: Təmaşaya baxmaq. Bayındır xan Qalın Oğuz bəglərilə *təmaşaya* baxardı, təfərrüc edərdi (36).

TƏMKƏ is.ər. Tamah: təmə etmək - tamah salmaq: *Təmə edüb* dərhal cima eylədi (98).

TƏPƏCİK is.Kiçik təpə. Gül *təpəcik* olmaz (Güyəkü oğul olmaz) (31).

TƏPƏLQAŞĞA AYĞIR. *Təpəlqaşğa* ayğırına Tondaz bindi (42).

TƏRƏF is.ər. Tərəf. Bədəvi atın öncəlƏdi, ol *tərəfə* yüridi (38).

TƏRS sif.Tərs. "Tənri mənəm" - deyü su dibində çığıruşur, asiləri, Ögin qoyub *tərsin* oqır qızı-gəlini (118).

TƏRS UZAMIŞ antr. *Tərs Uzamışın* sözi Əgrəgə kar eylədi (110).

TƏFƏRRÜC is.ər. Seyr, qəm-qüssəni dağıtmaq: təfərrüc etmək. Bayındır xan Qalın Oğuz bəglərinə təmaşaya baxardı, *təfərrüc* edərdi (36).



TƏXT is.fars. Padşahların oturduqları böyük kürsü. Təkür *təxt* üzərində oturmuşdı (87); *Təxt vermək* - hakimiyyət vermək. Hey Dirsə xan! Oğlana bəglig vergil, - ərdəmlidir (36); Xanlar xanı oğlana bəglik verdi, *təxt verdi* (41).

TƏHSİN is.ər. Bəyənmə, əhsən demə, alqışlama. Bunun ardınca, xanım, gərəmin, kişilər yetdi: Hamidən mərdin qəl'əsin dəpüb yıqan, dəmür yaylı Qıpçaq Məlikə qan qusdıran, gəlübən Qazanın qızın ərliklə alan, Oğuzın ağ saqallu qocaları göröndə ol yigidi *təhsinləyən*, al məxmur şalvarlı, atı bəhri hotazlı Qaragünə oğlı Qarabudaq çapar yetdi: "Çal qılıcın, ağam Qazan, yetdim!" - dedi (49).

TƏCRİDLƏR is. Dənizçilər. Arqıç qırda yığanır əmman dənizində, sarb yerlərdə yapılmış kafər şəhri. Sağa-sola çırpındı urar yüzgüçiləri. Su dibində dönər *təcriləri*. "Tənri mənəm" - deyü su dibində çığrışur asiləri (118).

TİKMƏK f. Tikmək, düzəltmək, qurmaq. Gög alan görklü çəmənə çadır *tikdi* (69).

TİKDİRMƏK f.icb.n. Qara yerin üzərinə otaxların *tikdirmişdi* (68).

TİKİLMİŞ f. sif. Tikili. Qıran yerdə *tikilmiş* otaxların, o zalım yığdırdı ola, qardaş! (100).

TIXMAQ f. Acgözlüklə yemək: Tığa-basa yemək, tıxa-tıxa, basa-basa yemək: Ocağına buncılayın övrət gəlsün...Gəldin ol kim saldıran soydır, sahadança yerindən uru turar, əlin-yüzün yumadan toquz bazlamac ilə bir küvlək yoğurd gəvəzlər, toyınca *tıqa-basa* yeyər, əlin böğrünə urar, aydır: "Bu evi xərab olası! Ərə varalıdan bərü dəxi qarnım toymadı, yüzim gülmədi (33).

TIŞARI//TIŞRA is. Bayır, çöl, eşik. Haman məni qapudan *tışarı* eylə, məded, dedi (57); Səgrək məst oldı. *Tışra* ayaq yoluna çıqdı (110).

TIQAMAQ f. Qalaya basmaq. Kafərə qılıc qoydı, basdı qəl'əyə *tıqadı* (113).

TIRNAQ is. Dırnaq. Qızıl altun gətirün, xan qızına *tırnaq* yonun (65); Gördi tanıdı "Oldur!" - dedi. Tartdı, yaqasın yırtdı. Acı *tırnaq* ağ yüzinə aldı-çaldı (58).

TODAQ is. Dodaq: *Todaqları təbsirdi* - dodaqları səyridi. Böylə digəc Qaracıq çobanın acığı tutdu, *todaqları təbsirdi* (49).

TOQSAN s. Doğsan. *Toqsan* tümən gənc oğuz söhbətinə dərilmişdi (68); *Toqsan* yerdə ala qalı-ipək döşəmişdi (42).

TOĞRANMAQ f. Doğranmaq. Gürzlə dögişdilər, qara polad üz qılıc ilə tartışdılar, sərpə-sərpə meydanda qılıclaşdılar, çiginləri *toqrandı*, qılıcları ovandı bir-birin alımadı (109).

TOQUZ s. Doqquz. *Toquz* qara gözülü, xub yüzlü, saçı ardına urunu, köksi qızıl dügməli, əlləri biləgindən qınalı, barmaqları nigarlı, məhbub kafər qızları Qalın Oğuz bəglərinə sağraq sürüb içərlərdi (42); Anun ardınca *toquz* qoca başları Aruz yetdi (77).

TOQUZLAMA is. Doqquzlama - çuxaya vurulan doqquz naxış. Quşun ala qatını, qumaşın arusını, qızın gögçəgini *toquzlama* cırğab çuxa xanlar xanı Bayındıra pəncyek cıqardılar (67).

TOQUNMAQ f. Toxunmaq. Aslanın alnın gözədüb bir yumruq eylə urdu kim, yumruq çənəsinə *toqundu*, ovatdı (89); Aruz qoca dəxi enüb dəpələdi, mahmuzı *toqundı* (99).

TOĞAN is. Şahin quşu. *Toğanın* əlinə aldı, ardına düşdi (80).

TOĞMAQ f. Doğmaq. Qarıcıq ananı götürmişiz, bizimdir, sana verməziz, yayxan keşiş oğlına verəriz, yayxan keşiş oğlından oğlı *toğar* (49); Qaraquc atlar əsən olsa, qulun *toğar*. Bəg ərənlər əsən olsa, oğlı *toğar* (75).

TOĞRAMAQ f. Doğramaq. Qara hindu qullarıma buyuraydım, səni para-para *toğrıyalardı*, ağac! (48)

TOĞRANMAQ f.məc.n. Doğranmaq. Beyrək and içdi: "Qılıncıma *toğranayın*! Oxıma sancılayın! Yer kibi kərtləyin, topraq kibi savrılayın! Sağlıqla varcaq olursam, "Oğuza gəlüb, səni halallığa almaz isəm!" - dedi (59).

TOĞLI is. Toğlu, qoyun balası. Hər birinin başların sığadı. "*Toğlıcıqlar*, dövlətim saqar qoç, gəl keç!" - dedi (101).

TOĞRI sif. Doğru. Baba, *toğrı* xəbər vergil! (75); Toğrı yol. Qazan aydır: "Vallah, billah, *toğrı yolı* görər ikə, əgri yoldan gəlmiyəyin", - dedi (120).

TOĞULDAMA f. Dağılmaq. Bir oğul uçurdınsa, degil mana, tamarların *toğuldayım*! (73).

TOZ is. Toz. Yerə dəxi düşsə *toz* kibi savrılardı, ocaq kibi oyrulardı (48); *Toz enmək* - toz düşmək. Baqdılar gördilər altı bölük *toz endi* (69); Toz yarılmaq: Bu gələn, bilmiş olun, yağıdır, - dedi. *Toz yarıldı*, gün kibi şıladı, dəniz kibi yayqandı, meşə kibi qarardı (69).

TOY is. Toy. "Toyın-dügünin qara oldı", - deyü ağlar (60); Ulu *toy* elə, hacət dilə! (35).

TOYLAMAQ f. Qonaq etmək. Taş Oğuz bəglərin ağırlıq edüb *toyladı* (124); Oğlancığımın ilk avıdır, qanlı oğuz bəglərin *toylıyalım* (72).

TOYA zərf. Doyunca. Ağ südin *toya* əmzirsə, ana görkli (33).

TOYINCA zərf. Doyunca. *Toyınca* yüzinə baçmadığın, xanım yigit! (58).

TOYMAQ f. Doymaq. Bəyligə usandım, yigitligə *toymadım* (80).

TOYURMAQ f. Doydurmaq: un gündür yoldan gəldim, *toyurun* məni (62); Qarnın *toyurdıqdan* sonra qazanları dəpdi-tökdi, çevirdi (64).

TOYUM OLMAQ Qənimət qazanmaq, qənimət əldə etmək. Qalaba *toyum* oldı (110); Yigit bəylər *toyum* oldı (126).

TOLAB-TOLAB zərf. Doyunca. *Tolab-tolab* ağ südimi əmizdirdigim oğul! (82).

TOLANBAZ URMAQ Fırlanmaq. Qılıc çəküb altı kafər dəplədi, *tolanbaz* urıb yundları urkitdi (113).

TOLAMAQ f. Dolamaq, sarımaq, sarıqlamaq. Asılanı qoyu verdilər. Sürdi gəldi: Qanturalı bir kəpənəgi qapağına *toladı* (89).

TOLANMAQ f. 1) Çatmaq (növbəti çatmaq); Gerü növbət *tolanub* ana gəlmişdi (99); 2) Fırlanıb, hərlənib gənimək. *Tolandı*, başı ucana gəldi (113).

TOLAR is. Qovhaqov. Tul *tolara* girdigim.

TOLAMAC-TOLAMAC. Tulaları doxarlıyı qodığım (63); dolaşbac-dolambac, dolama-dolama. Oğul, sən varacaq yerün; *Tolamac-tolamac* yolları olur (86).

TOLMA is. Bələk. Toquz ay tar qarnımda götürdigim oğul! *Tolma* beşiklərdə bələdigüm oğul! (82).

TOLAŞMAQ f. 1) Dolaşmaq, qanmaq. Gördi kim, uçarda quzğun, tazı *talaşmış*, yurtda qalmış (44); 2) Qucaqlaşmaq. Ala yorğan içində səninlə *tolaşmadım* (92); 3) məc. Dəyib dolaşmamaq, toxunmamaq: Mana kimsə *tolaşmaz*, - dedi (64).

TOLDURMAQ f. Doldurmaq. Uçardan qaz, tauq; yürürdən keyik, tavşan bu holəyə *toldurub*, Oğuz yigitlərinə bunı dam etmişdi (110).

TOLMAQ f. 1) Dolmaq: Ulaşuban sular taşsa dəniz *tolmaz* (31); 2) Müəyyən yaşa çatmaq; Gerçəklərin üç otuz on yaşını *toldırsa*, yeg (32); On otuz yaşında *tolsun*, həq sizə yaman götürməsin, dövlətiniz payəndə olsun, xanım hey! (32).

TOLMAS is. Bələk. *Tolması* beşikdə bələdügim oğul! (47).

TOLU sif. Dolu. Gumbur-gumbur nəqaralar dögildi. Bir qiyamət savaş oldı, meydan *tolu* baş oldı (66); Bir qiyamət savaş oldı, meydan *tolu* baş oldı (77).

TORUM is. Köşək: Qaytabanda qızıl dəvə bundan keçdi; *Torumları* bundan boylayıb belə keçdi; *Torumcığım* aldırmışam, bozlıyayınmı (73).

TON is. Don, paltar. Yedi qız qardaşı ağ çıqardılar qara *tonlar* geydilər (57).

TONATMAQ f. Geyindirmək. Beyrəgə qaftan geyindirib *tonatdılar* (65); Ac görsəm toyurdım, yalıncıq görsəm *tonatdım* (73).

TONLI sif. Donlu, geyimli. Gözəllər sərvəri sarı *tonlı* Selcan xatuna alsam, atam-anam evinə dönsəm...(87); Üç yüz mürəssə *tonlu* yigit soyladı, boyına aldı (69).

TONDAR//TONDAZ is. Antr. *Tondarı* dəpərə tutub çaldı (96); Selçik oğlu Dəli *Tondaz* yerindən turı gəldi (96); Təpələ qaşla ayğırına *Tondaz* bindi (42).

TOP is. Topca kəsmək - top kimi kəsmək. Ağ meydanda yumru başı *topca* kəsdim (117).

TOPRAQ is. Torpaq. Ayıtdı kim, yer kibi gərtiləyin, *topraq* kibi savrılayın, qılıcıma toğranıyın, oxıma sancılayın, oğlum toğmasun, toğarsa, on günə varmasun, bəg babamın, qadın anamın yüzin görmədin bu gərdəgə girərsəm! - dedi (90); Yer kibi kərtləyin, *topraq* kibi savrılayın! (59).

TOPUQ//TOPUCAQ is. Topuq. Altmış ərgəc dərisindən kürk eləsə *topuqlarını* örtmiyən, altı ögəc dərisindən gülam etsə, qulaqlarını örtmiyən...Uruz qoca çapar yetdi (50); Ağır buqağu *topucağın* dögər, degil! (75).

TÖVBƏ is.ər. Tövbə eyləmək. Günahına *tövbə* eylədi (56).



TÖKMƏK f. Alca qanın yer yüzinə *tökəyinmi?* (92).

TÖKÜLMƏK f.məc. Yağ *tökülondə* süfrəsi bol ne'mətli, yağ *tökülondə* bol ne'mətlü (95).

TÖKDÜRƏN f.sif. Döyən-vuran. Qaba-qaba bəglər oğlı qovğa qılsa; Qamçı salub *tökdürən* Qazan ər idim (117).

TÖLƏ-TÖLƏ B a x: Tavla. *Tölə-tölə* şahbaz atlarını bindilər (42); *Tölə-tölə* çəkiləndə şahbaz atlı (95).

TUĞ is. Bayraq. Qazan bəgün qartaşı kafərin *tuğilə* sancağı qılıcladı, yerə saldı (50); Boyı uzun Burla xatun qara *tuğın* kafərin qılıcladı, yerə saldı (77).

TUĞULQA is. Döyüşçülərin başlarına qoyduqları metal papaq. Qalqanını ovatdı, *tuğulqasını* yoğurdı, qapaqların sıyırdı, oğlanı alımadı (108).

TUYMAQ f. Hiss etmək, sezmək, başa düşmək: Məgər sultanım, Dərsə xanım xatun *tuymış*; Oğlancığına qarşu varub söyləmiş, görəlim, xanım, nə söyləmiş (40); Qavat, mən bu işi *tuysam*, sana böylə gəlürmiydim? (124); Kafərin fe'lin *tuydım* (47).

TUL sif. Dul: Öləndən sonra ərə getməmiş qadın. Ağca yüzlü yengəmi *tul* eləmisən (103).

TUMAR is. Qamçı. Qazan bir *tumar* ilə köpəgi urdı (45).

TUMAN is. Duman: Tuman düşmək - duman çökmək. Alca atlu Şökli Məlik qatı pusmuş, Pusdığından qara tağlara *tuman* düşmüş (106).

TUMANIN QƏL'ƏSİ onomastik vahid. Gözlədilər, şahin *Tumanın qəl'əsinə* endi (116).

TURNA is. Durna. Qanturalı baldı gördi bu qonduğı yerdə ğuğı quşları, *turnalar*, turaclar, kəkliklər uçarlar (90).

TURAC is. Qanturalı baldı gördi bu qonduğı yerdə quğı quşları, turnalar, *turaclar*, kəkliklər uçarlar (90).

TURĞAY is. Torağay. Səhralarda oxuyan quş. Durna gərvan geçdigin *turğay* bilür (32); Götüri öginə bıraqdı: "Daz yerdə *turğay* atmağa yexşi!" - dedi (63).

TURI sif. Duru. Aqan *turı* sulardan xəbər gecə, arqurı yatan Ala Tağdan təbər aşa, xanlar xanı Bayındıra xəbər vara (37).

TURI AYĞIR Göy bədəvi at. Qonur atlu Qazana "keşiş" deyən bəg yegnək *Turı ayğırına* bindi (42).

TURMAQ-DURMAQ f. 1) Qalmaq, yerində qalmaq. Əmma oğlanı nə qədər götürdilərsə, *turmadı*, gerü aslan yatağına vardı (98); 2) Qardaşım sacmış, qayurmazam; qardaş. Qız Oğuzda *turmazam* (111); *Turdı*, atını bindi (80); 2) Dayanmaq - Sol yanında Qazlıq qoca oğlı bəg yegnək *turmışdı* (52), Dəpəgöz Basatın üzərinə qaqdı, xəncərlə çaldı-kəsdi, sıçradı, gen yerdə *turdı* (101); 3) Fe'li bağlamaya qoşularaq hərəkətin davamlılığını bildirir. Boz ayğır bunda atlanub *turar* (60).

TURAMADI f. Dura bilmədi. Buğa ayaq üstünə *turamadı* (36); *Turmadı* - dura bilmədi. Bir dəxi urdı, dəvə ayağı üzərinə *turmadı* (90); *Turmuş ola* - durmuş ola. Qanturalı aydır: "Baba, mən yerimdən turmadın ol *turmış ola*! (85); Tursun-getsün. Oğulları ağ otağa, qızluyı qızıl otağa, oğlı-qızı olmıyanı qara otağa qondurın, qara gecə altına döşək, qara qoyun yəxnəsindən öginə götürün; yersə-yesün, yeməzsə, *tursun-getsün* (35).

TURI GƏLMƏK f. Durub gəlmək. Qalqubanı Qazan xan yerindən *turı gəlgil* (114); Yaradan həqqiçün, *turı gəlgil* (114); Qalqubanı yerindən *turı gələn*, Eki qardaş bəbəgin öldürüb zəlil gəzən; Dözən oğlı Alp Rüstəm mana derlər, - dedi (121).

TUTMAQ f. 1) Bir şeydən tutmaq, yapışmaq. Tut ol dəliyü öldür, səni qoyu verəlim, var get! - dedilər (113); Yaqanla boğazından *tutayımmı*? (35); "Bir at bularsan, *tutayım* binəyim", - dedi (60); *Taşa tutmaq* - daşa tutmaq. Bunlar ayıtdı: "Bazırganlarız" - dedilər. Kafərlər "yalan söylərsiz" deyü *taşa tutdılar* (120); Sözin tutmaq. Hər nə ki, buyursa, qəbul edərlərdi; *Sözin tutıb* təmam edərlərdi...(31); Südin tutdi - südünə sözdü. Nə yerdə gözəl qopdısa, çəkub aldı: Ağ saqqalu qocanın ağzın sökdi. Ağ birçəkli qarının *südin tutdı* (37); *Gözü tutmaq*. Gözün kimi tutarsa, könlün kimi sevərsə, ana varğıl! (83); "Ana həqqi - Tənri həqqi denilməsədi, qalqubanı yerimdən turaydım yaqanla boğazından *tutaydım* (47); Bağrımla yürəgim nə tağlarsan? (47); Götürəcək olursan, yigitliyim səni *tutsun* (48); 2) Ələ keçirmək, ələ gətirmək, həbs etmək. Dərsə xanı *tutdular*, ağ əllərin ardına bağladılar, qıl sicim boynuna taqdılar, ağ əlindən qan çıqınca dögdilər (40); Pəri qızının birini *tutdı* (98); Ağca yüzlü mən gəlin tutub, atam-anam evinə ilətməsünlər! (90); Əgrəgi *tutdılar*. Əlincə qəl'əsinə çıqardılar (110); Tutub alan. Baransarın Bayburd hasarından parlıyub uçan; Adaxlusın ayrıqlar olurkən *tutub olan*, Baybörə xan oğlı Bamsı Beyrək mana deərlər (120).

TUTUB GƏTİRMƏK - Əmma oğlanı nə qədr götürdilərsə, turmadı, gerü aslan yatağına vardilərsə, turmadı, gerü aslan yatağına vardı. Gerü *tutub gətirdilər* (98); İçin *tutub gətirmək* Əmma oğlanı nə qədr götürdilərsə, turmadı, gerü aslan yatağına vardı. Geru *tutub gətirdilər* (98); *Tutmaq* - gizlicə tutmaq. Qanturalının atını için *tutdı*, geydirdi, Gəndü dəxi için *tutdı* geyindi (90).

TUTDURMAQ f.ic.b.n. Yaxalatmaq, həbs etdirmək. Bir suçdan ötri; Dərgahdan sürdün; İbrahimi *tutdurdun* (109); Ala tanla yerindən turı gəldin oğlulı *tutdurdınmı*? Tutulmaq: Bazırganın ulusı *tutuldı*, kiçisi qaçaraq Oğuza gəldi (53); Ağca burclu hasarlarda *tutılaydın*, oğul! (82); Tutsaq: *tutsaq olmaq* - Dərsə xan *tutsaq* oldı gedər (40); Qardaşın *tutsaq* oldı (53); Tutsaq etmək - Kafər aydır: "Bəglər, Qazanın tələ şahbaz atlarını binmişüz, altun-ağçasını yağmalamışuz, qırq yigidlən oğlı Uruzı *tutsaq* etmişüz (43).

TÜY is. Tük. Çobanın ucyaşar tana dərisindən sapanının ayasıydı, üç keçi *tüyindən* sananının qollarıydı. Bir keçi *tüyindən* çatlağucıydı (48).

TÜMƏN is. Pul vahidi. Ağ ayıldan *tümən* qoyun vergil, - Bu oğlana şişlik olsun, ərdəmlidir (36).

TÜRKÜSTAN is. Top. *Türküstanın* dirəgi! Tülü quşun yavrısı! (95).

TÜRKMAN is. Etnonim. Türkmən. Pəs varasın bir cicibiçm *türkman* qızını alasan, nagahandan tayanım üzərinə düşəm, qamı yırtıla? - dedi (85).

TÜRFƏNDƏ sif. Yeməli, yetişmiş. "Oğuzdan yenə bizə bir *türfəndə* quzı gəldi", - dedi (101).

## U

UĞRAMAQ f. Rast gəlmək, üz-üzə gəlmək. Bir gün yolı bir dərnəgə *uğradı*, qondılar (110); Qara tonlu kafərlərə *uğratdınmı*? (105).

UĞRATMAQ f.ic.n. 1) Düçar etmək, mə'ruz etmək. Yoxsa qara dinli kafirə *uğratdınımı*? (70); 2) Düşmənlə vuruşmaq. Yəqa tutub kafirə *uğraşayım* (67).

UĞUR is. Bəxt, səadət, xoşbəxtlik. Yort oğul! *Uğurın* açuq olsun, sağ-əsən varub gələsən, gələcəgin varsa! - dedilər (113).

UDLU sif. Həyalı, abırlı. Yazıdan-yabandan bir *udlu* qonaq gəlsə, ər adam evdə olsa, anıa disə ki, tur ətmək gətür, yeyəlüm bu da yesin (33).

UZ sif. Böyük, iti. Hasar qapusına girmişkən qara polat *uz* qılıca ənısəsinə eylə çaldı kim, başı tob kibi yerə düşdi (96); Çalışanda qara polat *uz* qılıcını güdəlməsün (41); ◇ *Uz düşmək*, sözü düz gəlmək. Günlərdə bir gün Yegnək oturub bəglər ilə söhbət edərkən Qaragünə oğlı Budağılə *uz düşmədi* (94).

UZAMIŞ is. Antr. Əmən aydır. Mənim qırımım Tərs *Uzamış* olsun (126).

UZANMAQ f. Boy atmaq, boya vermək. Qarnu kibi qara saçım *uzanır* gördüm (44).

UZATMAQ f. Yıxmaq. Dirsə xan Qorqud sinıirli qati yayın əlinə aldı. Üzəngiyə qalqıb, qatı çəkdi, *uzatdı* (37).

UZIN//UZUN sif. Uzun. Saqqalu *uzın* tat əri banıladıqda (34); Əvvəl-axır *uzun* yaşın ucı ölüm (115).

UZINCA//UZUNCA sif. Çox uzun. *Uzunca* iki do gözəldir (131); *Uzınca* tənəfi görkli. Oğıl görkli (33).

UYIMAQ f. Yatmaq. Uyxusın yenəmədi, gerü yetdi-*uyıdı* (113); Aydır: Mərə qocalar, ekindü vəqti munı manıa çevirəsiz, yiyəm - dedi. Yenə *uyıdı* (101).

UYXU is. Yuxu. Qara qıyma gözlərin *uyxu* almış, acğıl axi (97); *Uyxu almaq* - yuxulamaq. Qadir verən tatlu canın uyxu almış (114); *Uyxusın* yenəlmədi, gerü yatdı, uyıdı (113).

ULALMAQ f. Boy atmaq, böyümək. Yekəlmək. İyəgülü *ulalur*, qapırğalı böyür (36).

ULAŞMAQ f. Qovuşmaq. *Ulaşuban* sular taşsa, dənıiz tolmaz (31); İssüz yerinı qurdı kibi *ulaşdılar* (98).

ULAŞ is. Antr. İçüb-içüb *Ulaş* oğlı Salur Qazanın alnına şərabın itisi çıqdı (42).

ULU sif. Çox böyük. Qadir. *Ulu* Tənıriyə yaqın uçan (89); *Ulı* toy elə, hacət dilə! (35); Ağır-*ulu* divanım sürülmədi (75); *Ulı* qız qarındaşları yanına gəldi (105).

ULDUZ//ILDIZ is. Od kibi şılayub, *ıldız* kibi parlayub, gələn nədir? (69); *İldız* kibi parlayıb gələn kafərinı cidasıdır (70).

ULILIQ is. Böyüklük, əzəmətlilik, yüksəklik. *Ulılığına* həddin, sənin, böyük qəddin, yoq! (96).



ULUS is. El, oba, yurd, kənd. Bəzirganlar *ulusı* tutuldi (71).

UMAN is. Uman-küsən, könlündən keçən. *Umanana*-usmanana aş yedirdim (73); Qaranıu dün içində yol azsan *umun* nədir? (102).

UMUD is. Kömək. Bir gün Ulaş oğlı Tülü quşunı yavrısı, bizə miskin *umudı* Amit soyının aslanı, Qaracuğın qaplanı...yerindən turmışdı (42); Bu günümdə *umıd* olğıl manıa (76); ◇ *Umıdı olmaq* - bir şeyə arxalanmaq, güman etmək. Yayanını *umıdı* olmaz (71).

UMID ÜZMƏK. Daha gözləməmək. Əl üzmək. Qalın Oğuz bəgləri Beyrək üçün əzim yas tutdılar, *umıd* üzdilər (58); Qalın Oğuz bəgləri Beyrəkdən *umıd* üzdilər (58).

UN is. Taxıl bitkilərinin və s. toz halına salınması. Neyləyəyim, bu yığılacaq evdə *un*, yağ, ələk yoq. Dəvə dəgirməndən gəlmədi diyər (33); Toz halına salınmış heyvan sümüyü. Sümük unu. Ol buğa qatı taşa bir buynuz ursə *un* kimi üyüdərdi (15).

UNUTMAQ f. Yaddan çıxarmaq. Gördi kim, altun-aqça yığılmış, Baqaraq kəndözinı *unıtdı* (101).

URAN is. Antr. Dünən *Uran* altı pərlü çomağılə at dəpüb, gəlüb yuqarıdan aşağa kafəri qatı urdı, alışdı (96).

URMAQ f. Vurmaq. 1) Bir şeylə çırpmaq, zərbə endirmək. Altı pərli gürz ilə dəpəsinə qati tutə *urdı* (64); Qara eşək başına üyən *ursan* qatır olmaz (31); 2) Sürtmək, çökmək, yaxmaq. Tan çiçəgilə südi oğlanın yarasinə *urdılar* (29); ◇ *Qulaq urmaq* - qulaq asmaq, eşitməyə cəhd etmək. Qulaq *urub* dinləyəndə ümmət görkli (111).

URĞUN num.s. Dəstə. Yedi *urğunım* Yeni Bayırın qurdına bənzərdi yigitlərin (95).

URU zərf. Tez. Əsasən "turmaq" fe'li ilə işlənir. Gəldin ol kim soldıran soydır, sapadanca yerindən *uru* turar, əlin-yüzin yumadan toquz bozlamac ilən bir güvələk yoğurd gəvəzlər...(33); Aydır ...Qalqubanı, yigitlərüm yerünıüzdən *uru* turunı! (34).

URULU sif. Düyünlənmiş. Toquz qara gözlü, xub yüzlü, saçı ardınca *urulu*, köksi qızıl dügməli, əlləri biləgindən qınalı, barmaqları Qalın Oğuz bəglərinə sanraq sürüb içərlərdi (42).

URUZ is. Antr. *Uruz* bəgin dutsaq olduğı boyı bəyan edər (122).

URUŞMAQ f. Vuruşmaq. Savaşmadın-*uruşmadın* alı verəyim, döngil gerü! (40).

US is. Ağıl, düşüncə, zəka, dərrakə. Mərə, dini yoq əqilsiz kafir! *Usı* yoq, dərnəksiz kafir! (59); Neçə kim bu düşi gördüm, şundan bərü əqlim-*usım* dərə bilmən (44).

USAN is. Gözü olan, iştahı olan. Umanana, *usanana* aş yedirdim (73).

USANMAQ f. Yorulmaq, bir işdən doymaq. Bəginə *usanmadım*, yigitligə toymadım (80); Tez sevdin, tez *usandin* (198).

UÇMAQ I is. Cənnət, behişt. Ağ saqqallu baban yeri *uçmaq* olsun! (41).

UÇMAQ II f. Göyə qanadlanıb uçmaq. Mərə, yeri toğan quş oluban *uçayınmı*? (136); Əzrail bir gögərçin oldı, pəncərədən *uçdı* getdi (80); Göl üzərində al qanatlu Əzrayilə, Əmr elədi, *uçub* gəldi (81); Gördi kim, pəri qızları qanat qanada bağlamışlar, *uçarlar* (98).

UÇAR sif. Uçan quşlar. Gördi kim, *uçarda* quzğun, tazı talaşmış, yurtda qalmış (44).

UÇAN f.s. Baran,sarın, Bayburd hasarından parlıyub *uçan* (120).

UÇURMAQ f. Uçmağa sövq və ya məcbur etmək, uçmağa buraxmaq. Asılan-asılan qayalardan Qazan, oğlan *uçırdınmı*? (72). Qamın ağan yügrək sudan bir oğlan *uçırdın,sa* degil man,a (73).

UC I is. Bir şeyin sivri, şiş, nazik, batıcı tərəfi. Qənadların *ucları* qırılmasun (35); *Uc* toğundı, alca qanı şorladı (37).

UC II zərf. Son, tərəf, axır. Bu yağının, bir *ucın* man,a, bir *ucın* san,a - dedi (92); Dəmir qapu Dərvəndəki dəmir qapuyi dəpüb alan, altmış tutam ala göndərinin, *ucında* ər bəgürdən Qıyan Səlcuk oğlı Dəli Dondar çapar yetdi (49); Gəlimlü, gedimlü dünya! Axır - son *ucı* ölümlü dünya (50).

UFANMAQ f. Sınmaq. Dürtüşərsən ala göndərin *ufanmasun* (41); Yalançi oğli Yalıncıq yay *ufandığından* qati qaqdi (108).



# Ü

ÜZ zərf. Üst. Aydır: "Qalqubanı, yigitlərüm, yerün,*üzdən* uru turun!" (34).

ÜZƏNGİ is. Üzəngi: *Üzəngiyə* qalqıb, qatı çəkdi, uz atdı: oğlanı iki talusının, arasında urub çıqdı, yıqdı (37).

ÜZƏNGİLİ sif. Üzəngisi olan: On altı bin, ip *üzəngili*, keçə börkli, azğun dinli, quzğun dilli kafər çıqa gəldi (69).

ÜZƏRİ zərf. Üst. Təkür təxt *üzərində* oturmışdı (87); Ağ köksinin, *üzərinə* Əzrayıl basıb qondı (80); Toqsan başlü ban evlərin qara yerin, *üzərinə* dikdirmişdi (42).

ÜZ-GÖZ is. Sifət. *Üz-gözin,də* canın varsa, oğul, ver xəbər man,a! (39).

ÜZMƏK f. 1) Sındırmaq: Gəldi: təkura aydır: "Kərəm eylə, ol tatarı quyudan çıqar. Qızcığazın belini *üzər*, yer altında qızcuğazıma binərmiş (117); 2) Qopartmaq: Qanlu quyruq *üzüb* çap-çap yudan!. ...Ordumın, xəbərin bilürmisin, degil, man,a. Qara başım qurban olsun, qurdım, sana! - dedi (45); Qaba öykə dib yürürkən tartub *üzən*, Cümlə quşlar sultanı çal qaraquş (90); Dədə Qorqud göstəki *üzdi* (56); ◇ *Umud üzmək*, əl yumaq: Qalın Oğuz bəgləri Beyrək içün əzim yas tutdılar, *umıd üzdilər* (58); Qalın Oğuz bəgləri Beyrəkdən *umud üzdilər* (58).

ÜZÜLMƏK f. *Ümid üzülmək*, əl yuyulmaq: Allah verən *ümidin üzülməsin*! (93).

ÜZÜM is. Üzüm: Ol bağların, qara salxımları, *üzümi* olur (80).

ÜYİŞMƏK f. Daraşmaq: Birələr Dəli Qarçara *üyişdilər* (57).

ÜYÜŞMƏK f. Yığışmaq, toplaşmaq: Kafərlər *üyüşər*, qılıcın yalın elər, kafəri öginə qatub qovar (91).

ÜGİTMƏK f. Üyütmək: Ol buğa qatı taşa buynız ursa, un kibi *ügidərdi* (36).

ÜLƏMA is.ər. "Alim" sözünün cəmi: alimlər: Ol Qur'anı yazdı-düzdi, *üləmalər* ögrənincə göydi-biçdi (32).

ÜLÜŞMƏK f. Bölüşmək: Kafər dəxi düşübən bir yerdə aqça *ülüşməkdəydi* (53).

ÜMİD is. ər. Ümid: Allah verən *ümidin,* üzülməsün! (109).

ÜMMƏT is.ər. Xalq, camaat: Qulaq urıb din$_ı$ləyəndə *ümmət* görkli (32).

ÜN is. Səs: *Ünüm* an$_ı$la, sözüm din$_ı$lə! (45); *Ünüm* an$_ı$lan, bəglər, sözüm dinlən$_ı$, bəglər! (42).

ÜRGİTMƏK//ÜRKÜTMƏK f. Hürkütmək: Qılıc çəküb altı kafər dənlədi, tolanbaz urıb yundları *ürkitdi* (113); Qorquduban şəmatəsilə *ürküdən* Ordumın$_ı$ xəbərin bilürmisin, dəgil bana (45).

ÜRKMƏK f. Hürkmək: Kafər Qazan$_ı$un gəldügin gördi, *ürkdi* (74); Nagəhandan qoyun *ürkdi* (98).

ÜRMƏK f. Hürmək: Qaranqu axşam olanda vaf-vaf *ürən*! (45).

ÜRÜYDƏ is. Antr. Qonşılarına çağırır ki, Yetər! Zəlixə! Zübeydə! *Ürüydə* - can qız, - can! Paşa! Ayna Mələk! Qutlu Mələk! Ölməgə-yitməgə gətməmişdim, yatacaq yerim genə bu xərab olasıydı (33).

ÜST zərf. 1) Üst: Buğa ayaq *üstinə* turamadı, düşdi; dəpəsinin$_ı$ *üstinə* yıqıldı (36); İki talusının$_ı$ *üstinə* buğanın$_ı$ köpük turdı (36); 2) Üzəri: İç Oğuzun$_ı$, Taş Oğuzun$_ı$ bəglərin *üstünə* yığnaq etgil! (35); Oğuz bəgləri gəlüb, oğlan *üstinə* yığnaq oldılar, təhsin dedilər (36); Ağız açub ökər olsam, *üstimizdə* Tən$_ı$ri görkli! (32).

ÜFFAN is. Antr. Alimlər sərvəri Osman *Üffan* oğlı, görkli (32).

ÜÇ s. 3 rəqəminin adı: *Üç* kişi sağ yanında, *üç* kişi sol yanından dəmür zəncirlə buğayı tutmışlardı (36).

ÜÇ-DÖRT s. Qeyri-müəyyən kəmiyyət bildirir: bir neçə, üç və ya dörd: İki yildə gəlməzsən, *üç-dört* yil baqam (112).

ÜÇ YAŞAR sif. Üç yaşında olan. Çobanın$_ı$ *üçyaşar* tana dərisindən sapanının$_ı$ ayasıydı, üç keçi tüyindən sapanının$_ı$ qollarıydı (48).

ÜÇ YÜZ s. 300 rəqəminin adı: Qazan aydır: "*Üç yüz* yigidlən oğlum Uruz mənim evim üstinə tursun", - dedi (42).

ÜÇ YÜZ ALTMIŞ ALTI s. 366 rəqəminin adı: *Üç yüz altmış altı* alp ərənlər yanına yığnaq oldı (123).

ÜÇ GÜNLÜK sif. Üç gün sürən, üç gün davam edən, yaxud üç gün tələb edən: Bən bu gün Qon$_ı$ur ata qaqaram, *üç günlük* yolı bir gündə aluram, evilə olmadın yurudum üstinə vararam (44).



ÜÇ OQ is. Tayfa adı: *Üç oq*, Boz oq qarşulaşdılar (126); Aruz aydır: "Mərə Qılbaş, ol vəqt kim *Üç*, Boz *oq* yığnaq olsa, ol vəqt Qazan evin yağma edərdi (123).

ÜÇ OTUZ ON s. Yüz rəqəmini bildirir: Gerçəklərin$_ı$ *üç otuz on* yaşına toldırsa, yeg (32).

ÜÇÜN qoş. Səbəb, məqsəd məzmunu yaradır: Mənim *üçün* gəldün$_ı$sə, oğlancığım öldürmişəm (41).

ÜÇÜNCÜ s. Sıra sayı: *Üçüncidə* kəndüyə zərb eylədi, qanı toldı (39).

ÜŞƏNDİRMƏK f. Vicvicəyə salmaq: "Bu yerin$_ı$ sin$_ı$əgi bizi *üşədirdi*!" - dedi (101).

ÜŞMƏK f. Üyüşmək, yığışmaq: Dərələrdə, dəpələrdə kafərə qırğun girdi, leşinə quzğun *üşdi* (50).

# F

FAİDƏ is.ər. Fayda, xeyir. Baba malından nə *faidə*, başda dövlət olmasa (31).

FANİ sif.ər. Puç, boş, axırı olmayan. □ *Fani dünya*. Axırı boş, puç dünya. Əcəl aldı, yer gizlədi, *Fani* dünya kimə qaldı? (50).

FATİMƏ is.ər. 1) Həzrəti Fatimə, Peyğəmbərin qızı və Həzrəti Əlinin qadını; □ *Fatimə soyu*. Fatimə nəslindən olan. Ol Ayişə, *Fatimə* soyudur, xanım (33); 2) Müsəlman dünyasında ən çox işlədilən qadın adı. Bağazca *Fatma* deyərlərdi, bir xatun vardı, - qalq, sən oyna, - dedilər (64).

FE'L is.ər. 1) Azğınlıq, fitnə-fəsad. ◇ *Fe'li azmaq*. Niyyətindən dönmək, pislik etmək: *Fe'linmi azdı*? Əcəlinmi gəldi? (54); *Fe'li dönmək*. Fikrini dəyişmək: Ay əməli azmış, *fe'li dönmüş*, Qadir Allah ağ alnına qaba yazmış (56); 2) is. Hiylə, məkr. □ *Fe'lin tuymaq* - hiyləsini duymaq: Söyləşdilər fısıl-fısıl, Kafərin *fe'lin tuydum* (47).

FƏQİH is.ər. Müsəlman qanunşünası, şəriət başçısı, din xadimi. Qulaq urub dinləyəndə ümmət görklü, Minarədə banlayanda *fəqih* görklü (33).

FƏRAQ is.ər. Ayrılıq acısı. ◇ *Fəraq gəlmək* - ayrılığın acısını duyub qəhərlənmək: Beyrəgə qatı *fəraq gəldi*, qatlanmadı, buldır-buldır gözünün yaşı rəvan oldı (61).

FƏRYAD is.ər. Köməyə çağırma, ah, aman, nalə; ◇ *Fəryad etmək* - kömək diləmək, aman istəmək: Anası *fəryad edüb* ağladı, zarlıq eylədi (99).

FİKİR is.ər. Düşüncə, düşünmə; ☐ *Fikir eyləmək* - düşünüb bir qərara gəlmək: Qazan *fikr eylədi*, aydır: -Əgər çobanla varacaq olursam, Qalın Oğuz bəgləri bənim başıma qaqınc qaqarlar (46); Oğlan *fikr eylədi*, aydur: - Bir tama dirək ururlar, ol tama tayaq olur (36).

FİR'ON is. Qədim Misir hökmdarlarının adı. ☐ *Fir'on şişlər*. Qədim Misirin qəddar fir'onlarının tikdirdikləri yüksək sütunlar: *Fir'on şişlər* yüksəlib yerdən çıqsa, Qaba öncəmlə pərçin qılan Qazan ər idim (117).

FIRLAMAQ f. Dövrə vurub dolanmaq. Qanturalı *firlar* dəvənin qoltuğundan girər (89).

FISIL-FISIL səs təql. Anlaşılmaz söhbət. Söyləşdilər *fısıl-fısıl*, Kafərin fe'lin tuydum (47).

## X

XALİCƏ is. Xalça. Bin yerdə ipək *xalicəsi* döşətmiş idi (68).

XAN is. 1) Titul. Qalqubanı *xan* Bayındır yerindən turmış, bir yerə ağ otağ, bir yerə qızıl otağ, bir yerə qara otağ dikdirmiş (35); Hay Dirsə *xan*, bana qəzəb etmə; Xanlar xanı. *Xanlar xanı* xan Bayandır yildə bir kərrə toy edib, Oğuz bəglərin qonaqları (34); 2) Müraciət məqamında. *Xan* qızı, yerimdən turayınmı? (35).

XANLIQ is. Hakimiyyət, dövlət. Qorqut ata ayıtdı: "Axır zamanda *xanlıq* geri - Qayıya dəgə, kim sənə əllərindən almıya" (31).

XANIM is. Qadına, qıza müraciət məqamında. Dövlətsiz şərrindən Allah saqlasun *xanım* sizi (32); Beyrəg aydır: "*Xanım*, Qazan bəgdən mana buyruq oldı" (64).

XATİR is. ər. Xətir, hal, əhval. Hər yil altun-aqça gəlürdi, yigidə-bəgə verirdin *xətirləri* xoş olurdı (104).

XATUN is. Xatın: 1) arvad, həyat yoldaşı. Böylə digəc Dərsə xan *xatununa* cavab verməd (38); Dirsə xan evinə gəldi. Çağırıb *xatunına* soylar, görəlim, xanım, nə soylar (34); *Xatunı* hamilə oldı (35); 2) Qadın, xanım. Qırq incə bellü qız ilə həlalın - Boyı uzun Burla *xatun* ağlayuban şundan keçdi. (45). Qısırca yengə derlər bir *xatun* vardı, ana ayıtdılar (64).



XAÇ is. Xristianlığın rəmzi sayılan sitayiş obyekti. Altun *xaça* mən əlümi basaram (68).

XEYİR is.ər: Xeyir ola. "Andan sonra Qazan ilə işimiz *xeyir ola*," - dedi (124).

XƏBƏR is.ər. Bir iş, hadisə və s. haqqında mə'lumat. Yalnız oğul *xəbərin*, a Dərsə xan, degil mana. (38); Babası aydır: "yanlış *xəbərdir*, oğul (111); Altı yol ayrıdına çadır dikəm. Gələndən *xəbər* soram (112); ◇ *Xəbər aşa* - xəbər gedə, xəbər çata. Qara-qara tağlardan *xəbər aşa* (89); *Xəbər vara* - xəbər gedə. Qanlu-qanlu sulardan hənir keçə. Qalın Oğuz elinə *xəbər vara* (89); xəbər vermək. Aydır: "Varayım, oğluma toğrı *xəbər verəyim*, hünəri varsa, gəlsün alsun, yoxsa, evdəki qıza razı olsun" dedi; Quru qaçan *xəbər versə* gərək? (45); Xəbəri yoq - Uruz tutsa oldı. Qazanın *xəbəri* yox (71); Xəbər keçə, xəbər çata. Aqan turı sulardan xəbər keçə, arqurı yatan ala tağdan xəbər aşa (37); Xəbərin gətirmək. Bir yigit olsa dirisi *xəbərin gətürsə*, çırğab (çuxa) altun-aqça verərdim. Ölüsi xəbərin gətürənə qız qardaşım verərdim", - dedi (58). *Xəbər göndərmək*. Məgər Bəgilin, də anda casusı hazırdı Bəkilə *xəbər göndərdi* (106); *Xəbər mana* - Xəbər çatdırmaq, xəbər vermək Ağız-dildən beş kəlmə *xəbər mana*. Qara başım qurban olsun, babam, sana - dedi (69); *Xəbər söyləmək*. Oğızın ol kişi təmam bilicisiydi, - nə diyərsə, olurdı. Ğaibdən dürlü *xəbər söylərdi* (31); Xəbər soruşmaq, xəbər sormaq. Altı yol ayırdına çadır dikəm; Gələndən-gedəndən *xəbər soram* (112).

XƏBƏRLƏŞMƏK f. Xəbər almaq, soruşmaq. Sən aradan çıqğıl, mən Allah təala bilə *xəbərləşim*, - dedi (81); Qazan bəg burada yurdlan *xəbərləşmiş*, görəlim, xanım, nə *xəbərləşmiş* (44), Bən bu suyla *xəbərləşim*,-dedi (44).

XƏZİNƏ is.ər. Pul, cəvahirat, qiymətli şeylər və onlar saxlanılan yer. Ağır *xəzinəm*, bol aqçam götürüb durursan; Sənə xərclıq olsun. (48); Dəpəgöz aydır: "Mənim *xəzinəm* var ol qocalar olmasunlar. Var, möhürlə," -dedi. (101).

XƏLƏTLƏMƏK f. Hədiyyə vermək, bəxşiş vermək. Aruz. Cümlə bəgləri, döndi aydır: "Bəglər, Beyrək bizdən qız almışdır, *küyəgümizdir*" (124).

XƏNCƏR is.fars. Xəncər. Dəpəgöz Basatın üzərinə qodı, *xəncərlə* çaldı-kəsdi, sıçradı, gen yerdə turdı (101).

XƏRAB sif.ər. Xaraba. Dağılmış, uçulmuş, alt-üst olmuş, viranə qalmış ev, şəhər, kənd və s.-məc. Ev: Yitməgə getməmişdim, yatacaq yerim genə bu *xərab* olasıydı (33); *Xərab olası* - xaraba qalsın. Ocağına buncılayın övrət gəlsün... Gəldin, ol kim soldıran soydır, sanadanca yerindən uru turar, əlin-yüzin yumadan toquz bazlamac ilən bir güvlən yoğurd gəvəzlər, toyınca tıqa basa yeyər, əlin bögrinə urar, aydar: "Bu evi *xərab olası*. Ərə varalıdan bərü dəxi qarnım toymadı, yüzim gülmədi" (33); *Xərab olmaq* - xarabaya dönmək. "Əlbətdə Qazan bəg mana yetişsün, - dedi". Gəlməz olsam, məmləkət bozılıb *xərab olur* (107).

XƏRAC is.ər. Vergi, bac. Toquz tümən Gürcüstanın *xəracı* gəldi: bir at, bir qılıc, bir çomaq gətürdilər (104).

XƏRCLİQ is. ər. xərclik. İşlənən, sərf olunan pul, gündəlik xərclər üçün ayrılan pul. Altun-altun alçam sana *xərclıq* olsun. (66); Ağır xəzinəm, bol ağcam götürüb durursan, sana *xərclıq* olsun. (48).

XƏRCLƏMƏK f. Sərf etmək, işlətmək. Altun-altun ağcan *xərcləyir* olsam, mənim kəfənim olsun (83).

XƏSM is.ər. Düşmən. *Xəsmini*, qovmini ayırdı, evini çözdi. Oğuzdan köç elədi (104).

XIZIR is.ad. Mifik obraz. Boz atlu *Xızır* mana gəldi. Üç kərrə yaramı sığadı.

XIRANCƏ sif. Uzunca. Altmış ərkəc dərisindən kürk eləsə, topuqlarını örtmiyən, altı ökəc dərisindən külah etmə, qulaqlarını örtmiyən, qolı-budı *xırancə*, uzun baldırları incə Qazan bəgün tayısı At ağızlu Uruz qoca çapar yetdi: "Çal qılıcın, bəgüm Qazan, yetdim", - dedi (50).

XIRLATMAQ//XIRILDADMAQ. f. Boğazından nəfəsin çıxarmaq, boğub xırıldatmaq. Gög yüzindən al qanatlu Əzrayıl uçub gəldi; Ağca mənim göksimi basub qondı. *Xırladıb* canım alur oldı (82), Gök üzərində al qanatlu Əzrayilə; Əmr elədi, uçub gəldi; Ağca mənim köksüm basub qondı; *xırıldadıb* tatlu canım alur oldı (81).

XOYRAD sif. Fərsiz, fərasətsiz. Ata adını yüritmiyən *xoyrad* oğul Ata belinindən enincə, enməsə yeg (32).



XORLIYAN f.sif. Hürküdən. Kafərləri it ardına buraqıb *xorlıyan*, eldən çıqub Ayqırgözlü suyından at yüzdürən, əlli yeddi qəl'ənin kəlidin alan, Ağ Məlik Çeşmə qızına nigah edən Sufi Sandal Məlikə qan qusduran, qırq cübbə bürünüb otuz yedi qəl'ə bəyinin məhbub qızlarını çalub bir-bir bunı qucan yüzində-todağında öpən İlək qoca oğlı Alb Ərən çapar yetdi: "Çal qılıcın, ağam Qazan, yetdim?" - dedi (50).

XOŞ sif.fars. Ürəyə yatan, xoşlandıran. Dirligini yer altındamı *xoşdur*, yoxsa yer yüzindəmi *xoşdur* (116); ◊ *Xoş gəlmək* - xoşu gəlmək, bəyənmək. Allah təalaya Dəli Domrılın, burada sözi *xoş gəldi* (81); Küfr söz söylədim, həq təalaya *xoş gəlmədi* (81); *Xoş olmaq* -ona kim, öldürə, genə bizim izzətimiz-hörmətimiz olun babası yanında *xoş ola*, artıq ola, - dedilər (36).

XUB sif. fars. Yaxşı: xub söyləmək - yaxşı demək. Uruz *xub söylədi*, şəkər yedi (69); *xub dağıtmaq* - yaxşıca dağıtmaq. Sağlı-sollı kafəri *xub tağıtdı* (71).

XURD is.səs.təql. ◊ Xurd olmaq - xurd-xəşil olmaq, xurd-xəşil eləmək. Andan kötürüb yerə urdı. *Xurd* oldı (89); Xurd-xaş eyləmək. Qara buğa gəldügində *xurd*-xaş eylədin, qağan aslan gəldügində belinin bükdün (89).

# H

HAQLAMAQ f. Yüyürüb yaxalamaq, başının üstünü almaq. "Varalım, düşməni *haqlıyalum*, di", - dedi (125).

HAQLU sif. Haqlı. Doğru danışan, düzgün hərəkət edən. *Haqluya* həqqi dəgə, haqsuza yüzi qaraluğı dəgə (64).

HAQSUZ sif. Ədalətsiz, doğru, düzgün olmayan. B a x: *Haqlu* sözünə aid nümunə.

HAZIR sif.ər. Bir işi icra etmək üçün lazımi vəziyyətdə olan, bir işi görmək üçün tədarük görmüş. Gecə-gündüz yartdılar. Nagahandan yetdilər. Qız *hazır* idi (90); *Hazır olmaq* - qarşısında peyda olmaq, qarşısına çıxmaq. Oğlan anda yığıldıqda, Boz atlu Xızır oğlana *hazır oldı* (39).

HAY-HEY Çağırış və ya müraciət bildirən nida - hey, ey, ay. Dirsə xan, bana qəzəb etmə (35); *Hay*, nə oturarsan, itüni

ulatmıyan, Çətügini molatmıyan. (69); Azıb gələn qəzayı, Tənri savsın, xanım, *hey* (32).

HAYQIRMAQ, f. Qışqırmaq, bağırmaq, nə'rə çəkmək. *Hayqırdı*, at saldı (71); Aslan *hayqırdı*, meydanda nə qədər at varsa, qan qaşındı (88).

HAL is.ər. Hal, vəziyyət, hər hansı bir şəraitdən doğan durum. Bu *halları* gördügində Qazanın, qara qıyma gözləri qanyaş toldı (44); Beyrəkdən sonra başına bu *hal* gələcəgin, bilürdin (65); Selcan xatun *hal* nə idügin bilüb, soylamış, görəlim, xanım, nə soylamış (92); "Ağca yüzli görklünlə söyləşməzsən, nədir *halın*?" - dedi (105).

HALAL//HƏLAL I sif.ər. 1) ◊ Halal etmək - borcundan keçmək, bağışlamaq. Ağ südini anam mana *həlal* eyləsün (76). Axirət həqqini *həlal* etsün (125).

HALAL/HƏLAL II is. 1) Kəbinli arvad. Dizin basub oturanda *həlal* görkli (33); Qatar-qatar dəvələrini yetmiş üz qırq incə bellü qızlan Qazanın, *həlalını* tutmuşız (43); 2) Ər-arvad. O iki *həlala* yüz qırq yıl ömr verdim (83).

HALALLAŞMAQ//HƏLALLAŞMAQ f. Görüşüb ayrılarkən bir-birinin günahını bağışlamaq. Babasının, anasının, əlini öpdi, *həlallaşdı*, "xoş qalun" - dedi (101).

HALALLIQ//HƏLALLIQ is. İcazəlilik, qanunilik. Əgər səni hasardan orğanla salındıracaq olursam, babana-anana sağlıqla varacaq olırsan, bəni bunda gəlüb *həlallıqla* alurmısan? - dedi. (59).

HAMİD, AMİD - Türkiyədə Diyarbəkir əyaləti və şəhəri. *Hamidlən* Mərdin qəl'əsin dəqüb yıqan, dəmür yaylı Qıpçaq Məlikə qan qusduran, gəlübən Qazanın, qızın ərliklə alan, Oğuzın, aq saqallu, qocaları görəndə ol yigidi təhsilləyən, ol məxmuri şalvarlı, atı bəhri hotazlı Qaragünə oğlı Qarabudaq çapar yetdi (49).

HAMİLƏ is. və s.,ər. İkicanlı, boylu. Bir ağzı dualının alqışilə Allah-təala bir əyal verdi. Xatunı *hamilə* oldı (35).

HAMPA is.fars. Yoldaş; tay, bərabər. Oğul, sən qız diləməzsən, kəndünə bir *hampa* istərmişkən (55).

HASAR is.ər. Hasar, qala. Ağca burclu *hasarlarda* tutılaydın oğul. (82); yarımasun-yarçımasun Kafərin casusı, bunları casusladı. Varıb Bayburd *hasarı* bəginə xəbər verdi (57); Qazılıq qoca təmam on altı yil *hasarda* tutsaq oldı. Sonra əmən, dcərlərdi, bir kişi altı kərrə varub *hasarı* alımadı. (94).

HASİL sif.ər. I Hasil olmaq. Nəticəsi olmaq. "Məqsudımız həq təala dərgahında *hasil* oldı", - deyüb arı sudan abdəst aldı (94).

HACƏT is.ər. Lazım olan, zəruri olan bir şey. *Hacət diləmək* - Arzusunu, istəyini diləmək. Dirsə xan dişi əhlinin sözilə ulu toy elədi, *hacət dilədi* (35).

HACI is.ər. Məkkəni ziyarət etmiş müsəlman (dini). Ol Məkkəyə sağ varsa, əsən gəlsə, sidqi bütün *Hacı* görkli (32).

HEYBƏT is.ər. Qorxu, vahimə hissi oyadan görkəm. *Heybətindən* sol gözüm yaşardı (118).

HEYBƏTLÜ sif. Heybət doğuran, dəhşətli, zəhmli. Mərə, nə *heybətlü* qocasan (79).

HEYVAN is.fars. Heyvan. Oğlanım, sən insansan. *Heyvanla* müsahib olmağıl. (98).

HEYF I nida, ər. Heyf almaq. Bir kəskin və ya bir şeyin qalmaması, yox olması səbəbindən doğan təəssüf hissini ifadə edir. Bunun kibi yigit *heyf* ola ki, canvərlər əlində həlak ola (87).

HEYF II is. 1) İnciklik, küsü. Qazan bəgdə bir *heyfimiz* qaldı (43); 2) Zərər, ziyan. Bu *heyfləri* biz Qazana etmişüz (43).

HEKAYƏT is.ər. Hekayət etmək. Danışmaq, söyləmək, nəql etmək. Bu düşi Yegnək yoldaşlarına *hekayət* eylədi (96).

HEÇ//HİÇ I əd. Qətiyyən, əsla. Bin, dəxi ayğır gətürün kim, *heç* qısrağa aşmamış ola (56).

HEÇ//HİÇ II. əd. 1) Cual cümləsini emfatikləşdirmək üçün işlədilir. "Oğul, çoban, qarnım acdır. *Heç* nəsnən varmıdır yeməgə?" - dedi (46); 2) Heç bir. *Hiç* yigidə verməsün Qadir-Tənri göz bu güni - dedi (102).

HECƏ is.ər. Hecəsinləyin heca ilə, höccələnərək. Hecələnərək. *Hecəsinləyin* düz olınsa, yasin görkli (32).

HƏB/HƏB əv. 1) Hamı, hamısı, bütün hamısı. Bəglər *həb* ava bindi (54); 2) Tamam. Dərsə xan əgər oğlancığın görərsə, oturmaz, bizi *həb* qırar", - dedilər (39-40).

HƏBS is.ər. Həbs, dustaqxana. Gətürdilər, tonuz tamına *həbsə* saldılar (119); "Qazan oğlı Uruzı *həbsdən* çıqarun, boğazından orqanla olsun..." (47).

HƏVA is. fars. Hava. Alan-alçaq *həva* yerdən gələn arğış (58).

HƏVALƏ is.ər. Həvalə olmaq. Yönəlmək, istiqamətlənmək. Qazan kəndü dopa dəpdi. Təkur ilə Şəkli Məlikə *həvalə* oldı (77).

HƏQ is. ər. Haqq-təala, Allah, Tanrı. "Su *həq* didarın görmişdir. Bən bu suyla xəbərləşim", - dedi (44); Həq-təala. Allah. Ğaibdən dürlü xəbər söylərdi. *Həq-təala* anın, könlinə ilham edərdi (31); 1) ◇ Həqqə vasil olmaq -vəfat etmək. Beyrək padşahlar padşahı *həqqə vasil oldı*, bəllü bilsün, - dedi (125); 2) Kiminsə qarşısında olan vəzifə, kimə isə qaytarılacaq borc (məc.). Ana həqqi, Tənri *həqqi* olmasaydı, Qara polad uz qılıcım tutaydım... (111) "Qonşı *həqqi* - Tənri *həqqi*," - deyü sözlər (33); 3) Həqiqət, ədalət, düzgünlük. *Haqluya* həqqi dəgə, *haqsuya* yüzi qaraluğı dəgə (64); 4) Hüquq, ixtiyar. Yarımasun-yarçımasun, bu çoban bizim *həpimiz* qırar, olamı?" -dedilər (44); 5) Haqqı şəklində: haqqı üçün - and olsun. Oğul içün ata ölmək eyb olur. Yaradan *haqqı içün*, baba (74); 6) Həqqimə şəklində: - haqqımda, barəmdə Bəglər, mənim dəxi *həqqimə* bir dua eylən (52).

HƏKİM is.ər. Həkim. Oğlanı *həkimlərə* ısmarlayub Dərsəxandan saqladılar.(39).

HƏLAK is.ər. Məhv olma, ölüm, həlak olmaq, ölmək. Bu otuz eki baş kim bürcdə asılmış idi, qoğan aslanla qara buğranın yüzin görməmişlərdi, ancaq buğa buynuzında *həlak* olmuşlardı (101); Həlak qılmaq. Öldürmək, məhv etmək. Buğa dəxi oğlana sürdi gəldi. Dilədi ki, oğlanı *həlak* qılaydı. (36).

HƏLƏ zərf. 1) Hələlik, indi. Nə olur-olsun, *hələ* mən avımı alayın (54); 2) Üstəlik, bir də. Baybörə bəg aydır: "*Hələ* nə dilədi?" (56).

HƏLL is.ər. ◇ Həll etmək. Çözmək, çətin bir məsələ haqda müəyyən nəticəyə gəlmək. Qorqut ata Oğuz qövminin müşkilini *həll* edərdi (31).

HƏM bağ.fars. Üstəlik, eləcə də. Baqdı-gördi bir qaç çobanlar yolın, qıyısın almışlır, ağlarlar; *Həm* turmayıb taş yığarlar (60).

HƏMİN əd.fars. Ancaq, yalnız. Qazan gerü evin yağmalatdı. Əmma taş Oğuz bilə bulınmadı. *Həmin* İç Oğuz yağmaladı (123).



HƏMİŞƏ zərf.fars. Həmişə, hər zaman. *Həmişə* Qazanın başına bunlu gəlsün, tayısı Aruzı daim ana tursın (123).

HƏMLƏ is.ər. Hücum, atılma. Dəli Qarçar qılıcın əlinə aldı. Yuqarısından öygə ilə *həmlə* qıldı (56); Buğayla oğlan bir *həmlə* çəkişdilər (36).

HƏNİR is.Səs, xəbər. Qara-qara tağlardan *hənir* aşdı (110). Qanlu-qanlu sulardan *hənir* keçə. Qalın Oğuz elinə xəbər vara (89).

HƏR əv.fars. Hər (müəyyən bir çoxluğu təşkil edən hissələrdən hər biri). Məgər kafər bəginin, bir bikr qızı vardı. *Hər* gün Beyrəgi görməgə gəlürdi (59); Hər kim. Hər kim ki, kim olur-olsun. *Hər* kim yedi, ol degil, *hər* kim yeмədi, oldur (46); Hər nə. Hansı olur-olsun. *Hər* nə iş olsa, Qorqut ataya tanışınca işləməzlərdi. *Hər* nə ki buyursa, qəbul edərlərdi; sözin tutıb təmam edərlərdi (31).

HƏRAMZADƏ is.ər.fars. Qeyri-qanuni cinsi əlaqədən doğulmuş uşaq. Oğlan, ay oğlan, *həramzadə* oğlan (107).

HƏRAMİ is.ər. Yolkəsən, quldur, soyğunçu. Dəpəgöz Oğuzdan çıqdı, bir yuca tağa vardı. Yol kəsdi, adam aldı, böyük *hərami* oldı (39).

HƏRZƏ is.fars. Hərzə-mərzə. Boş söz. *Hərzə-mərzə* söyləmə, mərə itim kafər (108).

HƏSƏD is.ər. Həsəd, paxıllıq. Həsəd etmək. Paxıllıq etmək. Oğlan təxtə çıqdı, babasının qırq yigidin anmaz oldı. Ol qırq yigit *həsəd* eylədilər (36).

HƏPÜMİZ əvəz. Hamımız. "*Həpümiz* tutsaq olmışdı" - dedilər (54).

HƏSƏN Antr. ər. Həzrət Əlinin oğlunun adı.

HƏSRƏT I is.ər. Həsrət olmaq. Həsrətində, intizarında olmaq. Ataya-anaya, qauma-qardaşa *həsrətəm*, və həm bir qara gözlü yauqlım vardı (59).

HƏSRƏT II is. Həsrətli, həsrət çəkən, intizarda olan. Dəli Domrul aydır: "*Həsrətim* vardır, bulışayım", - dedi. (82).

HƏSUD sif. ər. Paxıl, həsəd çəkən. *Həsud* kafərlər bağlamadılar, yüklərin sıyırıb salı verdilər. (89).

HİMMƏT is.ər. 1) Qeyrət; sə'y. Altındağı al ayğıra Bəkil məni bindiyidi, qara polad uz qılıcın qüvvət verdi; qarğu talı sügüsün *himmət* verdi (108); "Allahın inayəti, ərənlərin *himməti*

oldı; qızı aldım", - dedi (56); 2) Xeyir-dua. Çün inayət Tənridən oldı, bəgün, paşanın, *himməti* Qanturalıya oldı (89).

HİNDU is.fars. Hind əhalisindən olan hindli. Qara *Hindu* qullarıma buyuraydım, Səni para-para toğrıyalardı, ağac (48).

HOTAZ is. Qotaz. ...al məxmuri şalvarlı, atı bəhri *Hotazlı* Qaragünə oğlı Qarabudaq çapar yetdi (49).

HÖRMƏT is.ər. Hörmət. "Gəlün oğlanı babasına quvlıyalum. Ola kim, öldürə, gene bizim izzətimiz-*hörmətimiz* onun, babası yanında xoş ola, artıq ola", - dedilər (36).

HÜNƏR is.fars. Hünər, igidlik. *Hünəri* oğul atadanmı görər, ögrənər, Yoxsa atalar oğuldanmı ögrənür? (69).

HÜNƏRLİ sif. Qoçaq, mərd, igid. Boynı uzın bədəvi at vergil, Binər olsun, *hünərlidir* (36).

HÜSEYN Antr.ər. Hüseyn, Həzrət Əlinin oğlu. Həsənlə *Hüseyn* iki qardaş bilə, - görkli (32).

HU//HI nida. Qanturalı Sarı tonlu qız eşqinə bir "*hu*" dedi (88); "*Hi*" demədin başlar kəsən cəlladı olur (70).

## Ç

ÇAVUŞ is. Keçmiş zamanlarda: Fərmanları, qərarları, hökmləri uca səslə camaata e'lan edən şəxs. Çağıruban dad verəndə yol *çavuşlu* (63).

ÇAQMAQ is. Atəş açmaq üçün tüfəngin, tapancanın çaxmağını çəkib atəş açmaq. Kafərlər üçün leşindən bir böyük dəpə yığdı, *çaqmaq* çaqub od yağdı. (44).

ÇAQMAQLU sif. Çaxmağı olan, çaxmağlı adam. Qarla yağmur yağanda *çaqmaqlu* çoban (45).

ÇAQMAQLUCA sif. Çaxmağı olan primitiv tüfəng, keçmişdə çaxmaq daşı və çaxmaq vasitəsilə alışdırılan tüfəng. *Çaqmaqluca* çobanları dünlə yügürdən! (45).

ÇAĞ is. Vaxt, zaman. Qalın Oğızın, gəlini, qızı bəzənən *çağda* (37).

ÇAĞIRMAQ f. Birinin adını ucadan demək. *Çağırıb* xatunına soylar, görəlim, xanım, nə söylər (34); Bayandır xan səni *çağıra*, San,a qatı qəzab eyləyə (37).



ÇAĞIRTMAQ I f. icb.n. Başqası vasitəsilə çağırmaq. Ağın verdi *çağırtdı*. Aqınçı dərildi. Üç yüz say cidalu yigit bunın, yanına cəm oldı (110).

ÇAĞIRTMAQ II f. Hazırlaşdırmaq. Av *çağırtdılar* (ova hazırlaşdılar) (104).

ÇAĞLAMAQ f. Şırıltı ilə tökülmək, Ağındılı görklü suyın, souğılmışdı, *çağladı*, axır! (3).

ÇADIR is. Çadır, alaçıq. Ala *çadırın* yer yüzinə dikdirgil! (35). *Çadır* dikdi (90).

ÇAYIN, is. Çayan. Əqrəb. *Çayın,*, baqça, çalmalu, qara quş ərdəmlü, qurqurma quşaqlı, qulağı altun küpəlü (77).

ÇAYIR is. Taxıllar fəsiləsindən gögümsovlu alaq otu. Souq-souq sular, *çayırlar* çəmənlər... Selcan xatun bu yeri görklü gördi, bəgəndi (90).

ÇALINMAQ f. Səs çıxarmaq, musiqili səs çıxarmaq. Bori *çalındı*, kos uruldu (128); Qara polat uz qılıclar *çalındı*, yılmağı düşdi (50).

ÇALIŞMAQ f. Qılınc oynatmaq. Baban dedi, keyikləri qovsun götürsün, bənim ogimdə dəpləsün. Oğlumın, at səgirdişin, qılıc *çalışın*, oq atışın görəyim, sevnəyim, qıvanayım-güvənəyim, dedi, - dedilər (37).

ÇALMALU sif. Başında çalma olan. Çayın baqsa, *çalmalu*, qara quş ərdəmlü qurqurma quşağlı, qulağı altun küpəli... (77).

ÇALMAQ I f. Vurmaq. Oğlan yumruğılə buğanın alnına qıya tutıb *çaldı* (56); Dəli bəgülədi ki, Dədəyi dənərə *çala* (56).

ÇALMAQ II f.1) Çalğı alətində musiqi icra etmək. Ərə varan yerindən tura bən qonuz *çalam*, qol saluban oynaya - dedi (64); Ozan gəldi, yelətmə *çaldı* (90); *Çalma*, ozan, ayıtma, ozan! (61); 2) *Əl-ələ çalmaq*. Oğuz bəgləri bunı göricək *əl-ələ çaldılar*, gülüşdilər (63); Qazan bəg *əlin-əlinə çaldı*, qas-qas güldi (69); 3) *Üz cırmaq*. Qara tırnaq ağ yüzümə *çalayınmı*? (73); 4) Yıxmağ. Əzrayili *çalmağa* həmlə qaldı (80); 5) Çırpmaq, vurmaq. Şöylə *çalayım* səni mağara divarına kim, quyruğın mağarayı yağlasın - dedi (101); 6) Dağıtmaq, eşmək. Oğuz yigidin, öygəni qapardı, qılıcın çıqardı, yeri *çaldı*-kərtdi (90); ◇ *Qılınc çalmaq* - Qılınc vurmaq. "*Çal qılıcın*, qardaş Qazan, yetdim!" - dedi (49); "Qılıc *çalub* baş kəsdin,?" (69).

ÇAP-ÇAP zərf. Parça-parça udmaq. Qanlu quyruq üzüb *çap-çap* yudan! (45).

ÇAPAR zərf. Atla bir yerə çaparaq, qaça-qaça xəbər aparmaq. Bu məhəldə, sultanım, Salur Qazanlam Qaraca çoban *çapar* yetdi (48).

ÇAPQUN is. Soyğunçuluq məqsədilə basqın, *çapovulçuluq*, yolkəsmə və s. Atla Qarun elinə *çapqun* yetdim. Ağ hasar qələsinin bürcün yıqdım (118).

ÇAPILMAQ f. məch. n. Çapıb-talanmaq. Elim-günün *çapıldı*, qara başım bunılu oldı, tayım Aruz manıa gəlsün, - demiş (124).

ÇAPMAQ f. 1) İti sürmək. Baba, yelisi qara Qazlıq atuma əyər salayım, qanlı kafər elinə aqın *çapayım* (86); Bəzirganlar çapur ikən ğafillə beş yüz kafər qoydular, *çapdılar*, yağmaladılar (53); Sənünlə meydanda at *çapmadıqmı*? (65); 2) Zorla və ya gizli yolla var-yoxunu əlindən almaq, talamaq, soymaq, çapıb-talamaq. Elin-günün *çapını*, Qızın-gəlinin yesir edin - dedi (106); Qan alaca ordusını *çapın* - demiş (106).

ÇARDAQ is.fars. Talvar. Beyrək yuca *çardaqdan* baqdı, bazırganları gördi (58).

ÇARƏ is.fars. Bir şeyin əldə edilməsinə, bir nəticəyə gəlməyə, çətin məsələnin həllinə mane olan əngəlləri aradan qaldırmaq üçün çıxış yolu. Gördilər *çarə* olmadı (113).

ÇATLATMAQ f. Çatlamasına səbəb olmaq. Təkur aydır. Yüz adam seçilün, tarağa *çatladın*, oğlanı qorqudın (107); Elə olsa, sultanım, Qaraca çoban sapan *çatlatdı* (48).

ÇATMA is. Ucları bir-birinə çatan, çatma qaş. Quru yaya bənzər *çatma* qaşlum! (35).

ÇAXMAQLU sif. Çaxmaqlı, odlu-ocaqlı. Qarla yağmur yananda *çaxmaqlu* çoban (45).

ÇEVİK sif. Çox cəld olmaq. At ayağı küklük, ozan dili *çevik* olur (86).

ÇEVRƏ is. Mərkəzdən eyni məsafədən olan qapalı əyri xətt. *Çevrə* aldılar.

ÇEŞMƏ is. fars. Antr. Ağ Məlik *Çeşmə* qızına nigah edən Sufi Sandal Məlikə qan qusdıran, qırq cübbə bürünüb otuz yeddi qəl'ə bəyinin məhbub qızlarını çalub bir-bir boynın qucan... (50).



ÇƏKDİRMƏK f.icb.n. Başqası vasitəsilə çəkmək, Bəglər həb ava bindi. Boz ayğırın *çəkdirdi* (Ala Tağa ala ləşgər ava çıqdı) (54).

ÇƏKİLMƏK f. Durduğu, dayandığı yerdən başqa tərəfə hərəkət etmək. Köpək *çəkildi*, gəldügi yola getdi (45).

ÇƏKİŞMƏK f. qarş. n. Mübarizə etmək, çarpışmaq. Ya qadir Allah, birligini, varlığını, haqıçün, Əzrayılı mənim gözümə göstərgil, savaşayım, *çəkişəyim*, dürişəyim (79); Buğayla oğlan bir həmlə *çəkişdilər* (36).

ÇƏKMƏK f. Bir şeyi özünə və ya başqa tərəfə dartmaq. Üzəngiyə qalqıb, qatı *çəkdi*, uzatdı, oğlanı iki talusının arasında urub çıqdı (38); Yalnıuz *çəkdi* belindən bir ox çıqardı (101); Elə kim mən *çəkərəm* (102).

ÇƏMƏN is. fars. Yaşıl otla örtülmüş sahə, yaşıllıq. Yapağlu kökçə *çəmən* gücə qalmaz (31); Kög alan görklü *çəmənə* çadır tikdi (69).

ÇƏNGƏL is. fars. İki haçalı dəmirdən qayrılmış qədim zamanlarda edam aləti. Kafir aydır: "Mərə, varını Qazanını oğlı Uruzı tartunı *çəngələ* asun" (46); İki talusından *çəngələ* sancunı, qıyma-qıyma ağ ətindən çəkünı (47).

ÇƏRİ is. Qoşun, ordu. Qaragünə *çəribaşı* oldı (119).

ÇƏRKƏZ is. Qaraçay-Çərkəz vilayətində yaşayan xalqlardan biri. İt kibi gu-gu edən *çərkəz* xırslı (119).

ÇƏTİR is. Günəşdən, yağışdan qorunmaq üçün başın üstünü örtmək. *Çətir* otağ, ala sayvan dikdirdi (53); *Çətirli* otaqmı dilərsən? (64).

ÇİGİN is. Çiyin. Bədənin boynundan qollara qədər olan hissəsi... sərpə-sərpə meydanda qılıclaşdılar, *çiginləri* toğrandı, qılıcları ovandı, bir-birin alımadı (109); Əgnimdəki dəmür tonum *çignim* qısar (108); *Çigin* quşlı cübbə ton vergil bu oğlana (36).

ÇİLBƏR is. Yüyən. ...atınını *çilbərini* biləginə bağladı, yatdı-uyıdı (113).

ÇİÇƏK is. Bitkilərin ləçək tacından çoxalma orqanı. Tağ *çiçəgi* ananı südilə sənini yaranıa məlhəmdir -dedi, qaib oldı (39); məc. Qaza bənzər qızımını, gəliminı *çiçəgi* oğul (81).

ÇIQARMAQ f. 1) Bir şeyi başqa yerə aparmaq, kənara atmaq. Oğlan bu qatla yumruğını buğanın başına *çıqardı* (36); Məgər, sultanım, genə yazın buğayı saraydan *çıxardılar* (36);

Oğlan qılıcın *çıqardı* (112); 2) Paltarını soyunmaq. Beyrəgin yarü yoldaşları, ağı *çıqarıb*, qaralar geydilər (58).

ÇIXMAQ f. 1) Bir yerdən kənar olmaq, yuxarı qalxmaq. Oğlan təxtə *çıqdı*, babasın₁dan qırq yigidin an₁maz oldı (36); 2). Bir şeyin üstünə qalxmağ. Qızla ikisi bir döşəgə *çıqdılar* (112).

ÇIN₁LAR f. Cingildəmək. Sam yelləri əsmədin, Qazan, qulağım *çın₁lar* (72).

ÇIPLAQ sif. Çılpaq - əynində heç bir paltar olmayan. Yanındakı yoldaşları *çıplaq* oğlan! (107).

ÇIRBINMAQ f. Çırpınmaq. Bərk döyünmək, çabalamaq. Sağa-sola *çırbındı* udar yüzgüçiləri (118).

ÇIRĞAB sif. Naxışlı. ...Qızın gögçəgini, toquzlama *çırğab* çuxa xanlar xanı Bayındıra pəncyek çıqardılar (67).

ÇIRĞAB-ÇIRĞAB sif. Naxışlı-naxışlı. *Çırğab-çırğab* çadır otaq bağışlardı (68).

ÇIRPMAQ f. Tozunu almaq və ya başqa məqsədlə vurmaq. Anca qoyun gifdügində quyruq *çırpub* qamçılayan (45); Qılıcın₁ belçağına yabındı kim, bunı *çırpa*, gördi kim, əlində qopuz var (114).

ÇOBAN is.fars. Çoban. Qaraca *çoban* zərb elədi, qaba ağacı yerilə-yurdilə qopardı, arqasına aldı, Qazanın₁ ardına düşdi (46); *Çoban* tağarcığı çıqardı (46).

ÇOQ s. Çox, artıq. Beyrək gedəli. Bam-bam dəpə başına çıqdınmı *çoq* (65).

ÇOMAQ is. Başı iri və yumru ağac. Küni gəldi, qaba *çomaq* altında yığradım sənin₁ içün (70); Təkur qarmalayıb əlindən *çomağın* aldı (96).

ÇOUXMAQ f. Düşmək, tökülmək. Kafərlər Uruzın₁ üzərinə *çouxdı* (71).

ÇÖZMƏK f. Açmaq. Qazana bu söz xoş gəldi. Atından endi, çobanın əllərin *çözdi* (46).

ÇÖKMƏK f. Durduğu yerdən aşağı enmək. Buğa dizin *çökdi*, buynuzilə bir mərmər başı yoğırdı, penir kibi ditdi (87); İləri gəldi, diz *çökdi* (68).

ÇÖLD//ÇÖND is. Mükafat, bəxşiş. *Çöldi* alubdır, ad qazanıbdır (69); Qanlu oğuz içində *çöldi* almadın (69).

ÇÖNGƏ sif. Çökük, çökmüş. Qarann₁ulıca gözləri *çöngə* oğlan! (108).



ÇÖRÜLMƏK f. Çevrilmək. *Çörildi*, növbət gerü man₁a gəldi (100); Dəpəgöz *çöürüb*, ögin aldı (99).

ÇUVAL is. Böyük kisə, xaral. Bir əski dəvə *çuvalı* buldı, dəldi, boynına köçürdü (53).

ÇUQA//ÇUXA is. Çuxa. Üstdən geyilən qolu büzməli, uzun kişi milli geyimi. Cilasun qoç yigitlərə qalaba ölkə verdi; şalvar, cübbə, *çuqa* verdi (50); Bir yigit olsa dirisi xəbərin gətürsə, *çırqab* (çuxa), altun-aqça verərdim (58).

ÇÜNKİ bağ. Ona görə ki, bundan ötrü. Yaranlar, *çünkı* məni göndərirsiz, bilürsiz kim, Dəli Qarcar qız qardaşını diləyəni öldürər (55).

ÇÜRİMƏK f. Çürümək, xarab olmaq. ...Əlün₁ qurısun, parmaqların₁ *çürisün*, hey, ton₁uz oğlı tonuz, - deyirdi... (63); Dilün, *çürisin*, çoban! (45).

## C

CABBAR sif.ər. Qüdrətli, əzəmətli, böyük. Daim turan *cabbar* Ton₁ri (83).

CAVAB is. cavab: ◇ Cavab verməmək. Böylə digəc Dirsə xan xatınınə *cavab* verınədi (38); Bəg sərxoşdur, *cavab* verməz (38).

CAN is.f. Həyat, bədən. Ol gədəndə *canın* varsa, oğul, xəbər mana (39); *Can* tatlusın sana bildirəyinmi? (35); Mənüm başım qurban olsun, *canım* oğul, sənin üçün (75); Ağ birçəklü, izzətlü *canım* Ana (72); ◇ *Canını almaq* - öldürmək, məhv etmək. Mərə, Əzrayıl dedigünüz nə kişidür kim, adamın *canın alur*? (79); Üç sordı, *canın aldı* (99); *Canın qurtarmaq* - ölümdən qurtarmaq, həyat bəxş etmək. Yaxşı yigidin *canın qurtarayım* (79); *Canına od düşmək* - narahat olmaq, həyəcanlı olmaq. Ürəyimlə *canıma odlar düşdi* (30).

CANBACUQ is. Dirək, evin dirəyi. *Canbacuğın* əkmişmən (63) (M ü q. e t. S.Əlizadə, 150).

CANVƏR is.fars. Canavar, vəhşi heyvan. Bu *canvərləri* gördi, başında olan bit ayağına dərildi (85); Ol qızın üç *canvər* qalınlığı qaftanlığı vardı (85).

CARİYƏ is.ər. Qulluqçu qız. Qırq evli qulla qırq *cariyət* oğlı başına çevirdi, azad etdi (78).

CASUS is. Düşmənə satılmış adam, satqın, casus. Yarımasın, yarçımasın, kafərin *casusı* bunları casusladı (57); Məgər, Başıaçuq Tatyan qəl'əsindən, Aqsəqa qəl'əsindən kafərin *casusı* vardı (69).

CASUSLAMAQ f. Satmaq, satqınlıq etmək, düşmən tərəfə xəbər çatdırmaq. Bunları kafərin casusı *casusladı* (42); Kafərin casusı bunları *casusladı* (57); Yarımasun-yarçımasun, Evnik qəl'əsinin kafərləri bunları *casusladı* (57).

CAXMAQLU sif. Çaxmaqlı, çaxmağı olan. Qarla yağmur yağanda *caxmaqlu* çoban (43).

CAHİL is.ər. Cavan, igid. Görglü Tənri. Neçə *cahillər* səni gögdə arar, yerdə istər (82).

CƏBBƏXANA is.fars. Silah saxlancı, silah saxlanan yer. Alp Uruz çadırların açdırdı, *cəbbəxanəsin* yüklətdi (119); Tez *cəbbəxaneyi* yüklətsünlər (126).

CƏBRAYİL is.ər. antr. Allahın xidmətində duran mələyin adı. Həq-təala *Cəbrayilə* buyurdu kim, "ya Cəbrayil, var şol quluma qırq ərcə qüvvət verdim", - dedi (109).

CƏDD is.ər. Ata-baba, məc.kök-soy. Ulılığına həddin, sənin boyun-qəddin, yoq, ya cismlə *cəddin*, yoq (96).

CƏZA is.ər. Cəza, işgəncə. Tatar oğlu əlümizə girmişkən *cəza* ilə öldürəlim (74).

CƏLLAD is.ər. Ölüm hökmünü icra edən adam. *Cəllad* ənsəsinə gəldilər (89); "hı" - demədin başlar kəsən *cəllad* olur (70).

CƏM is.ər. Toplama, toplu: cəm eyləmək - toplamaq, bir yerə yığmaq. Təkur bəgləri *cəm* eylədi (120); ◊ *Cəm olmaq* - birləşmək, cəm olmaq, bir yerdə yığışmaq. Üç yüz say cidalu yigit bunın yanına *cəm oldı* (110).

CƏMAL is.ər. Gözəl, yaraşıqlı. Qanturalı *cəmal* və kəmal iyəsi yigit idi (87).

CƏMİ əvəz.ər. Hamı, bütün. Aruza və *cəmi* taş Oğuz bəglərinə xəbər oldı (126); *Cəmi* bəglər bindi (126).

CƏMİSİ əvəz.hamı. *Cəmisi* atdan enüb, Qazanın əlin öpdilər (121).

CƏNG is.fars. Vuruş, döyüş, savaş. Qılıc və sügü və çomaq və sairə *cəng* alətin geydürib tonatdılar (120); Qazılıq qoca qəl'əyə yetdükiləyin *cəng* başladı (94); ◊ *Cəng etmək* - döyüşmək, vuruşmaq. Oğlan qırq yigidin boyına aldı, at dəpdi, *cəng* vəssavaş etdi (41); Savaşmaq, vuruşmaq. Verərmisən, yoxsa mənimlə *cəng* edərmisən? (80); Bayındır xanın ağ meydanında bu oğlan *cəng* etmişdür (36).

CƏHƏNNƏM is.ər. Cəhənnəm. Tur, qız, oynarsan - oyna, oynamazsan, *cəhənnəmdə* oyna (65).

CİDA is.fars. Süngi. İldız kibi parlayıb gələn kafərin *cidasıdır* (70); Ala uran, sür *cidalar* süsəldi (71); Altun *cida* oynadana, yarəb noldı? (72); Altun *cidasın* əlinə aldı (40).

CİDALU sif. Əli süngülü. Üç yüz *cidalu* yigit bunın yanına cəm oldı (110).

CİGƏRCİK is. Ciyər, cigərcik. Yumru-yumru ağladı, yanıq *ciyərcigin* tağladı (48); ciyərində olan adam - cəsur, qorxmaz, ciyərli adam. Ol gün *cigərində* olan yigitlər bəlürdi (50).

CİLAV is. Cilov. At *cilavsın* döndərdi, gerü döndi (71); Bəkil at *cilavsın* yenimədi, bilə uçdu (105).

CİCİ-BİCİ is. Xoşxasiyyət, həlim, mehriban qız. Varasın bir *cici-bici* türkman qızını alasan (85).

CIĞIR is. Ox atmaq üçün nişangah. Oq *cığırın* qurmışsan (63).

CIZIQ is. Sərhəd, ölkənin sərhədi boyu uzanan xətt. Kafər sərhəddinə, *cızığlara*, Ağlağana, Gögcə tağa aluban çıqayın (69).

CILASUN is. Qoçaq, igid, qəhrəman. *Cılasun* ərənlərə qara ölkə verdi, cübbə-çuğa verdi (78); Ol gün *cılasun* bəg ərənlər dönə-dönə savaşdı (71); Yetişmiş bir *cılasun* oğlı vardı (85); *Cılasun* yigidlərlə Qaragünə oğlı Dəli Budaq soldan dəqdi (50).

CILASUNLİG is. Qəhrəmanlıq, igidlik. Mənim ərligim, bəhadirligim, *cılasunligim*, yigidligim Ruma, Şama gedə (79).

COMƏRD is.fars. İgid, qəhrəman, qüdrətli. Alnı açıq *comərd* ərənlər dinləsün (83); Ər *comərdin*, ər nakəsin ozan bilür (32); *Comərdlər* comərdi ğəni Tənri, mədəd! (89).

CÖVŞƏN is.fars. Zirehli geyim, döyüş paltarı. Kim atın binər, kim *cövşən* geyər (74).

CÖNGƏ sif. Çökük, çökəlmiş, çökəyə düşmüş. Gəzcigəzi *cöngə* qoca (80); Gözüm *cöngə* idigin nə bəgənməzsən? (80); Qaranluca gözləri *cöngə* oğlan (108).

CÜBBƏ is.ər. Uzunətəkli qolsuz üst paltar. *Cübbəsin* üzərinə örtdilər (125); *Cübbəsilə*, çuxasilə Beyrəgin ayağına düşdi (65); Çigin quşlı *cübbə* ton vergil bu oğlana (36).

CÜMLƏ əvəz.ər. Bütün, hamı. *Cümlə* bəglərlə yoldaş olub getdilər (25); Qamusına bənzəmədi *cümlə* aləmləri yaradan (33).

CUŞ is.fars. Coşma, qaynama. ◇ Cuşa gəlmək - coşmaq, emosional vəziyyət almaq. Ditrədi mənim canım, *cuşa* gəldi (80).

## Ş

ŞAQIMAQ f. şaqqıldamaq, çaxmaq//şaqmaq (ildırım haqqında). Gögdən ildırım ağban evim üzərinə *şaqır* gördüm (44); Ağ yıldırım olub *şaqıyayım* (76).

ŞAD sif.fars. Şad; sevincək: ◇ *şad olmaq* - sevinmək. Qalın Oğuz bəgləri bunı eşitdilər, *şad* olub sevindilər (52); Qoca eşidüb *şad* oldı (115); Sevindilər, *şad* oldular (56).

ŞADLIQ is. Şənlik, şadlıq. Dədəm Qorqud gəlübən *şadlıq* çaldı (78); Dədəm Qorqud gəldi, *şadlıq* çaldı (104).

ŞAYƏD mod. s. fars. Bəlkə, ehtimal ki, ola bilər ki. Şu dəli Məcnun mənə də *şayəd* ançılayın olmaz sözlər dedi (64).

ŞAYQALU sif. Böyük qıldır dəstəli (S.Əlizadə, 183). Qanturalı gəldi, qara *şayqalu* tokura salam verdi (87).

ŞALVAR is. Kişi geyimi, şalvar. *Şalvar*, cübbə, cuğa verdi (50).

ŞALVARLI sif. Şalvar geyinmiş, əynində şalvar olan şəxs. Al məxmuri *şalvarlı*, atı bəhri hotazlı Qaragünə oğlı Qarabudaq çapar yetdi (49).

ŞAM is.ər.top. Şam şəhəri. Mənim yigidligim Ruma, *Şama* gedə (79).

ŞAMİ sif. Şam ağacından qurulmuş, günəşin qarşısını alan, kölgəlik yaradan qurğu, günlük. Bir gün Qamğan oğlı xan Bayındır yerindən turmışdı, *şami* günlügi yer yüzinə dikdirmişdi (30).

ŞAH is. fars. Şah; məc. Dastanlarda bədii tə'yin kimi işlənir. *Şah* Həsənlə Hüseynin beşigi ağac (49); Vay *şah* yigidim (58); Qoç yigidim, *şah* yigidim (83).

ŞAHBAZ is.fars. Tərlan, şahin quşu; məc. 1) qıvraq at növü. Tölə-tölə *şahbaz* atlarını biz binmişiz (43); Barı Bayındır xanın tövləsindən iki *şahbaz*, yügrək at gətirün (55); 2) Qəhrəman; cəsur insanlar haqqında. Vay *şahbaz* yigidim (58).



ŞAHİN is.fars. Ov etmək üçün yırtıcı quş, şahin. Ya qara qazın içinə *şahin* girdi (71); Yumruğunda talbınanda *şahin* quşuma yazıx (48); Yumruğumda talbınan *şahin* bənüm quşumı alur (44).

ŞAHİNÇİBAŞI is. Şahin quşlarına baxan, şahinlərə qulluq edən. Bir gecə *şahinçibaşına* aydır (116).

ŞAŞMAQ f. Çaşmaq, əqlini itirmək. Mənim dəxi içində bir əqli *şaşmış*, biligi yetmiş qoca babam var (41).

ŞEYTAN is.ər. Şeytan. *Şeytana* lə'nət qıldun (109).

ŞEŞMƏK f. Açmaq, çözmək, əl-qolunu açmaq. Mənüm əlümi *şeşin* (39); Əlini *şeşdilər* (40).

ŞƏBÇİRAQ is. fars. Qaranlıqda parlayan qiymətli daş. İki *şəbçirmağa* bənzər sənin gözcigzin (60).

ŞƏQAQ is. Yanaq. *Şəqaqına* emrəndügim sənin qızın-gəlinin (60).

ŞƏKƏR is.fars. Şirni, şəkər, şirin şey. Uruz xub söylədi, *şəkər* yedi (69).

ŞƏMATƏ is.ər. məc.: Ətrafında olanlarla birlikdə. Qorquduban *şəmatəsilə* ürküdən (45).

ŞƏN sif.fars. Şad, şən, sevinən. Gəldigimcə səni *şən* görəydim (59).

ŞƏN-ŞADMAN zərf.fars. Şən, şad, sevincək, xoşbəxt hal. Bu yanda Şökli Məlik kafərlərlə *şən-şadman* yeyüb-içüb oturardı (46).

ŞƏR is.ər. Pis, şər. *Şər* xəbər gətürənin başın kəsəm (112); Dövlətsiz *şərrindən* Allah saxlasun (32).

ŞƏRAB is.ər. Spirtli içki, çaxır, şərab. Kafər qızları al *şərabı* altun ayağla Qalın Oğuz bəglərinə gəzdirərlərdi (68); Ol *şərabdan* içən əsrük olur (80); Al *şərabın* itisindən içərlərdi (40); İçüb-içüb Ulaş oğlu Salur Qazanın alnına *şərabın* itisi çıqdı (42).

ŞƏRABLU sif. Şərab içmiş adam, kefli, sərxoş. *Şərabluydum* tuymadım (80).

ŞƏRT is.ər. Şərt: ◇ *Şərt eyləmək* - şərt kəsmək. Andin sonra *şərt* eyləsün (117).

ŞƏFQƏT is.ər. Mərhəmət, lütfkarlıq, şəfqət. Uruzun *şəfqət* tamarları qeynədi (121).

ŞƏHADƏT is.ər. Müsəlmanlıq qəbul edilərkən, müsəlmanlığa inam gətirmək rəmzi kimi, keçirilən ritual səhnələrdə

deyilən sözlər: Allah vahiddir, Məhəmməd onun rəsuludur, peyğəmbəridir. *Şəhadət gətirmək* - müsəlman olmaq. Parmaq götürüb, *şəhadət* gətirüb müsəlman oldı (109).

ŞƏHƏR is.ər. Şəhər, yaşayış məntəqəsi. Ağır adlu *şəhərlərdən* gəldügində Beyrək adlu bir yigidə buluşmadınmı? (61); Qızı verin, *şəhərdən* sürün, çıqsın-getsin (88).

ŞƏHİD is.ər. Vətən, məsləkn, məqsəd uğrunda döyüşüb həlak olan şəxs, əsgər: ◇ *şəhid olmaq* - vətən yolunda həlak olmaq. Üç yüz yigit Oğuzdan *şəhid* oldu (78); Beş yüz Oğuz yigitləri *şəhid* oldu (78); İki qardaşı oxa düşdi *şəhid* oldu (43).

ŞİVƏN is.fars. Ol yigit üzərinə möhkəm qara *şivən* oldı (79); "Qara *şivən* sənünlə bilə eyliyəyin" - dedi (74); Ağır *şivən* sənin orduna qomayınmı? (73); ◇ *şivən girmək* - şivən qopmaq, şivən düşmək. Ap-alaca ordusuna *şivən girdi* (58); Baybörə bəgin dünlügü altun ban evinə *şivən girdi* (57); Dünlügü altun ban evinə babamın *şivən girmişdi* (59).

ŞİLLƏ is. Sillə, şillə. "Mərə, noldınız?" - deyü bir *şillə* birinə, bir *şillə* birinə urdı (111).

ŞİMDİ zərf. İndi, bu saat. "Qatı qəzəb edərəm *şimdi* sənə" - dedi (35); *Şimdi* qızlar yanına varmaq istər (64); *Şimdi* noldu? (59); "*Şimdi* boynun ururam" - dedi (63).

ŞİRŞƏMSƏDDİN is. antr. Qəflət qoca oğlu *Şirşəmsəddin* çapar yetdi (49); Qəflət qoca oğlu *Şirşəmsəddin*, qızın qardaşı Dəli Qarcar ilə ox axtarlardı (63).

ŞİRİN sif. fars. Şirin. Dünya *şirin*, can əziz (81).

ŞİROKUZ is. top. Protobulqarlarla bir vaxt Zaqafqaziyaya gəlib sakinləşən şirak tayfasının adı ilə bağlıdır: sözün tərkibindəki "oğuz - kuz//quz" komponentləri göstərir ki, şiraklar protobulqar (protooğuz) soyundan olmuşlar (S. Ə l i z a d ə, 264). Andan *Şirokuz* ucında, Gögcə dənizə dəkin el çarpdı (110).

ŞİŞ is. Yer səthindən qabarma, qalxma, piramida. Fir'on *şişlər* yüksəlib yerdən çıqsa, Qaba öncəmə pərçin qılan Qazan ər idim (117).

ŞİŞLİK is. Şişlik, şişə çəkiləsi ət, kabab, kabablıq ət. Ağayıldan tümən qoyun vergil Bu oğlana *şişlik* olsun, ərdəmlidir (36); Ağayıldan tümən qoyun gedərsə, mənim gedər, sənin də içində *şişligin* varsa, degil mana (40); Ağayılda tümən qoyun sənin gedər, mənim də içində *şişligim* var (41).



ŞİŞMƏK f. Qabarmaq, şişmək, qalxmaq. Ağca tənim qalqar, *şişər* (72); Tənüm qalqar *şişər* (38).

ŞILAMAQ f. İşıldamaq, parlamaq, parıldamaq. Od kibi *şılayub*, yıldız kibi parlayıb gələn nədür? (69); Gün kibi *şılayub* gələn kafərin başında işığıdır (70); Toz yarıldı, gün kibi *şıladı* (85).

ŞIRŞIMAQ f. Qulluğunda dayanmaq, xidmətində olmaq. *Qulluğında şırşımaq* - daima kiminsə xidmətində olmaq, daima kiməsə qulluq göstərmək. Qulluğımda *şırşayan* naibimmisən? (114).

ŞOL əv. O, işarə əvəzliyi. *Şol* qoyunları dəxi götürsək, Qazana ulu heyf edərdik (43); Gəlün varalım *şol* yigidi tutub götürəlim (40); *Şol* parmağımdakı yüzigi parmağına taq (101).

ŞORLAMAQ f. Tökülmək, şoruldamaq. Alca qanı *şorladı* (37); Qara qanı *şorladı* (76); Düdük kibi qan *şorladı* (94); Ağzına yüzündən qan *şorladı* (47).

ŞÖYLƏ əvəz. (zərf.) Elə, belə. Bu gün Bayındır xandan buyruq *şöylədir* (34); *Şöylə* çalayım səni mağara divarına kim, quyruğun mağarayı yağlasın (101).

ŞÖKLÜ//ŞÖKLİ sif. Ləqəb, müəyyən yaşayış məntəqəsinə, yerə mənsubiyyət bildirən ləqəb; Şəki toponiminə aid olması ehtimal edilir. *Şöklü* Məlik aydır (43); *Şöklü* Məliyə səniilətəlüm (43); *Şökli* Məliyi bögirdibən Qazan bəg atdan yerə saldı (66).

ŞU əv. Bu, işarə əvəzliyi. *Şu* dəli məğmun mənə də şayəd ancılayın olmaz sözlər söylər (64).

ŞUNDAN zərf. Burdan, buradan. Ağban evim *şundan* keçmiş gördünmü, degil mana (45); Qırq incə bellü qız ilə həlalın Burla xatun ağlayuban *şundan* keçdi (45).

ŞUNDAN BƏRÜ zərf. Bundan sonra. *Şundan* bərü əqlimusum dərə bilmən (44).

ŞÜKR is.ər. Razılıq, minnətdarlıq. ◇ Şükr eyləmək//şükr qılmaq - razılıq etmək, şükr etmək. Mənim birligim bilməz, yarlığıma *şükr* qılmaz (79); Anları sağ və əsən gördi, Allaha *şükr* eylədi (67).

ŞÜLƏN I is. Qonaqlıq üçün nəzərdə tutulmuş, qonaqlıq üçün hazırlanmış bol yemə-içmə, bol-bol ərzaq. Ağayılda aqca qoyunım sənə *şülən* olsun (66); Ağayılda ağca qoyunu sorar olsan, Ağam Beyrəgin *şüləniydi* (61); "Sultanım, məni qosan da

*şülən* yeməgin yanına varsam, qarnım acdır, toyursan" - dedi (64).

ŞÜLƏN II is. Qonaqlıq, bol yemə-içmə məclisi, bol yeməklər məclisi. Ağac Beyrəg gedəli *şülənim* yoq (61); Beyrəg *şülən* yeməginin üzərinə gəldi (64).

ŞÜLƏNLİ sif. Yeməkli, xörəkli; yemək növü. Küçicik tonuz *şülənli* (119).



## Mündəricat



### Lüğət